## Bismilləhi-r-Rahməni-r-Rahim

Aləmlərin Rəbbi olan Allaha həmd-sənalar olsun.Peyğəmbərimiz Muhamməd in, onun ailəsinin və bütün səhabələrinin üzərinə Allahın salavatı, salamı və bərəkəti olsun.

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) "cahiliyyət məsələləri" risaləsinin müqəddiməsində demişdir:

Bu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) kitab əhli və yazıb oxumağı bilməyən cahiliyyat əhlinə müxalif olduğu məsələlərdir.Müsəlmanın həmin məsələləri bilməsi gərəkdir.

Gözəlliyi aşkar edən ziddidir

hər bir şey ziddi ilə bəlli olur

Bu işdə ən önəmli və çox təhlükəli olan: Qəlbin Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyinə iman etməməsidir. Əgər buna cahiliyyat əhlinin yolundan olan işlərin xoş gəlməsi əlavə olunarsa acınacaqlı hal və ziyan daha da böyüyər.Uca Allah buyurur: *"Batilə iman gətirib Allaha küfr edənlər, şübhəsiz ki, ziyana uğrayanlardır!".*[1]

[1] əl-Ənkəbut:52.

**Şərh:**

Bu risalə şeyx Muhamməd bin Abdul-Vahhəbin (rahiməhullah) risalələrindən biridir.Onun adı: "Peyğəmbərin (salləllahu aleyhi və səlləm) cahiliyyət əhlinə müxalif olduğu cahiliyyat məsələləri"dir.Həmin risalə yüz iyirmi səkkiz məsələni özündə cəm edir.Şeyx həmin məsələləri Quran, sunnə və alimlərin sözlərindən toplamışdır.Onun bu risaləni yazmaqda olan məqsədi: Müsəlmanlar bu məsələlərdən yan dursunlar deyə bunu onların diqqətinə çatdırmaqdır.Çünki həmin məsələlər çox təhlükəlidir.

Şeyx (rahiməhullah), Peyğəmbərin (salləllahu aleyhi və səlləm) kitab əhlindən və oxuyub yazmağı bacarmayan insanlardan olan cahiliyyət əhlinə müxalif olduğu həmin məsələləri bəyan etmişdir.

Kitab əhli deyildiyi zaman yəhudi və nəsranilər qəsd edilir.Çünki yəhudilər Allahın Musaya nazil etdiyi Tövrat kitabına sahibdirlər.Nəsranilər isə Allahın Məryəm oğlu İsaya nazil etdiyi İncil kitabına sahibdirlər.Məhz bu səbəbdən onlar kitab əhli adlanmışlar.Hal-hazırda onlar Tövrata "əhdi ətiq" yaxud "qədim yazılar" deyirlər.Habelə İncilə "yeni əhdin yazıları" deyirlər.Bu, onların istilahıdır.

Bu iki kitab, Allahın iki möhtərəm peyğəmbərə, Musaya və İsaya nazil etdiyi əzəmətli kitablardır.Ələxsus Tövratı göstərmək olar. Həqiqətən də o, əzəmətli kitabdır.İncil isə onu tamamlayan və onu təsdiq edən bir kitabdır.Məhz bu

səbəbdən, onlarla kitaba sahib olmayan digərləri arasında fərq olsun deyə onlar kitab əhli adlanmışlar.

Oxuyub yazmağı bilməyənlər deyildikdə bu iki dinə mənsub olmayan ərəblər qəsd edilir.Onlar ümumən oxuyub yazmağı bilməyən bir tayfa olmuşlar.Quran nazil olmamışdan öncə onların heç bir kitabı olmamışdır.Məhz bu səbəbdən, onlar bu cür adlanmışlar.Uca Allah buyurur: *“Yazıb-oxumaq bilməyən ərəblərə özlərindən Peyğəmbər göndərən Odur.”*[2] Habelə buyurur: *“Halbuki Biz onlara oxuyacaqları bir kitab verməmiş və səndən əvvəl də özlərinə qorxudan bir peyğəmbər göndərməmişdik.”*[3] Habelə buyurur: *“Ataları qorxudulmamış və qafil olan bir tayfanı xəbərdar edib qorxudasan!”*[4] ”Ummi” sözünün mənası budur.Habelə Uca Allah Peyğəmbərini (salləllahu aleyhi və sələm) bu cür vəsf etmişdir.Uca Allah buyurur: *“O kəslər ki, əllərindəki Tövratda və İncildə yazılmış gördükləri ummi (oxuyub yazmağı bilməyən) Peyğəmbərə tabe olurlar, onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər”.*[5] Onun oxuyub yazmağı bilmədiyi halda bu əzəmətli kitabı gətirməsi onun risalətinin doğru olduğuna açıq-aydın dəlildir.Habelə burada onun möcüzəsi vardır.Ərəblər oxuyub yazmağı bilmədiyi kimi onların Peyğəmbəri (salləllahu aleyhi və səlləm) həmçinin oxuyub yazmağı bilmirdi.

---

[2] əl-Cumua:2.

[3] Səbə:44.

[4] Yəsin:6.

[5] əl-Əraf:157.

**Cahiliyyət**: Cahiliyyət sözü cahillik sözünə nisbət olunur.Cahillik elmin yoxluğudur.Cahiliyyət dönəmi peyğəmbərin və kitabın olmadığı zaman kəsiyidir.Cahiliyyət deyildikdə burada Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gəlişindən öncəki zaman qəsd edilir.Uca Allah buyurur: *"İlkin Cahiliyyət dövründəki kimi açıq-saçıq olmayın ".*[6] Yəni, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gəlişindən öncəki zaman. Çünki Peyğəmbər (salləllahu aleyhi və səlləm) göndərilməmişdən öncə bütün yer üzü zəlalət, küfr və dinsizlikdə batıb gedirdi. Çünki oncəki risalətlər yox olmuşdu.Yəhudilər öz kitablarını, Tövratı dəyişmiş və ora bir çox küfrlər və zəlalətlər daxil etmişdilər.Habelə nəsranilər öz kitablarını, İncili Məsihə nazil olduğundan fərqli hala salıb onu dəyişmişdilər.Bəlis yaxud Şavil adlı bir insan var idi.Həmin şəxs yəhudi olub Allahın peyğəmbəri İsaya kin bəsləyən birisi idi.Həmin şəxs hiyləgərlik və yalan vasitəsilə Məsihin dinini fəsada uğratmaq üçün səylər göstərmişdir.Həmin şəxs Məsihə iman gətirdiyini nümayiş etdirərək öncələr Məsihə tutduğu düşmən mövqeyə görə peşman olduğunu bildirmiş və iddia etdiyi kimi yuxu görüb Məsihə iman etdiyini söyləmişdir.Nəsranilər isə ona inanmışlar.Daha sonra həmin şəxs Allahın İsaya nazil etdiyi İncili ələ keçirib ora bütbərəstliyi, şirkin müxtəlif növlərini və küfr şeyləri daxil etmişdir.Belə ki, o, ora üçlük inancını, yəni Allahın üç ilahdan üçüncüsü olduğuna dair inancı, habelə İsanın Allahın oğlu olduğu inancını yaxud İsanın Allah olduğu inancını daxil etmişdir.

---

[6] əl-Əhzab:33.

Habelə o, ora xaca ibadət etmək əmrini və digər iyrənc küfr işləri daxil etmişdir.Nəsranilər onun alim olduğunu və onun mömin olduğunu düşünərək ona inanmış və ona elçi Bəlis, yəni iddia etdikləri kimi onun Məsihin elçisi olduğu üçün ona bu ləqəbi vermişlər.Əslində isə onun məqsədi Məsihin dinini fəsada uğratmaq olmuşdur.Həmin şəxs istəyini əldə etmişdir.O, Məsihin dinini fəsada uğradıb ora bütbərəstliyi, habelə üçlük və İsanın Allahın oğlu yaxud Onun üç ilahdan üçüncüsü inancını daxil etmişdir.Həmin şəxs ora bir çox bütpərəstlik əməllərini daxil etmiş onlar isə ona bu işdə tabe olmuşlar.Bu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gəlişindən öncə kitab əhlinin durumu idi.Onlardan yalnız az bir qismi doğru din üzərə qalmışdılar.Lakin onların çoxu küfr üzərə və Allahın dinindən uzaq olmuşlar.

Ərəblər isə iki qism olmuşlar:

Onlardan bir qismi yəhudilik, nəsranilik və atəşpərəstlik kimi öncəki dinlərə tabe olmuşdurlar.

Digər qismi isə İbrahim və İsmailın hənif dini üzərə idilər.Bu, xüsusi olaraq, Hicaz və Məkkə torpağında mövcud idi.Nəhayət həmin torpağlarda Ömər bin Luhey əl-Xuzəi adlı şəxs peydə olmuşdur.Həmin adam Hicazın hökmdarı idi. Həmin şəxs zahidlik, ibadət və xeyirxahlıq ilə tanınırdı. Nəhayət həmin adam müalicə almaq üçün Şama yollanmış və Şam əhlinin bütlərə ibadət etdiklərini görmüşdür və bu, ona xoş gəlmişdir.Həmin şəxs Şamdan bütlər ilə qayıtmış və Nuhun tayfasından sonra yerin altında itib batmış bütləri,

vəddi, suvaı, yəğusu, yəuqu və digər bütləri qazıb çıxartmışdır.Tufan həmin bütləriyerin altında batırmışdır.Şeytan həmin şəxsin yanına gəlib həmin bütlərin yerini ona göstərmişdir.Nəhayət həmin adam bütləri oradan çıxardıb ərəblərin qəbilələrinə paylamış və ona ibadət etməyi əmr etmişdir. Onlar isə bunu qəbul etmişlər.Beləliklə də, Hicaz və digər ərəb diyarlarına şirk daxil olmuşdur.Həmin şəxs İbrahimin dinini dəyişmiş və bütlər üçün müxtəlif qurbanlıq heyvanlar buraxmışdır.Məhz bu səbəbdən, Peyğəmbər (salləllahu aleyhi və səlləm) onu cəhənnəmdə öz iç-alatını arxasınca dartdığını görmüşdür.

Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gəlişindən öncə haqq din üzərə olan kitab əhlindən az bir qsim istisna olmaqla bütün dünya, kitab əhli, müşrik ərəblər və digər ümmətlər açıq-aydın zəlalət içindəydilər.Lakin haqq din üzərə olan həmin kitab əhlinin az bir qismi Peyğəmbərin gəlişindən öncə yoxa çıxmışlar.Nəticədə zülmət bütün yer üzünü bürümüşdü.Hədisdə gəlmişdir: "Allah dünya əhlinə baxıb kitab əhlindən qalanlar istisna olmaqla hamını, ərəblərə və əcəmlərə qəzəblənmişdir."

Qaranlıq zülmətin, möhkəmlənmiş cahiliyyatın, silinmiş yolların və səmavi risalətlərin əsər-əlaməti qalmayan halın hökm sürdüyü bir ərəfədə Uca Allah Peyğəmbəri Muhammədi (salləllahu aleyhi və səlləm) insanları zülmətlərdən nura çıxartmaq üçün göndərmişdir.Uca Allah buyurur: *"Allah möminlərə lütf etdi. Çünki onların öz içərisindən özlərinə (Allahın) ayələrini oxuyan, onları (pis əməllərdən) təmizləyən,*

*onlara kitabı və hikməti öyrədən bir Peyğəmbər göndərdi. Halbuki bundan əvvəl onlar açıq-aydın zəlalət içərisində idilər."*[7] Yəni, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gəlişindən əvvəl.

Dediyimiz kimi cahiliyyat elmin yoxluğu olan cahilliyə aid edilir.Cahiliyyata aid edilən hər bir iş yaramazdır. Məhz bu səbəbdən, Uca Allah buyurur: *"İlkin Cahiliyyət dövründəki kimi açıq-saçıq olmayın ".*[8] Allah Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qadınlarına ictimai yerlərdə və insanların gözü önündə açıq-saçıq olmağı qadağan edir.Çünki cahiliyyat əhlinin qadınları açıq-saçıq olar və övrətlərini açardılar. Buna misal, onların təvaf zamanı etdikləri işdir.Onlar bunun fəzilətli iş olduğunu hesab edirdilər.

Habelə Uca Allah buyurur: *"Kafirlər öz qəlblərində cahiliyyət təəssübünə qapıldıqları zaman".*[9] Bu, pislənən bir haldır.Cahiliyyat təəssübü pislənən amildir.Yürüşlərin birində Peyğəmbər (salləllahu aleyhi və səlləm) ənsarlardan olan bir kişi ilə mühacirlərdən olan digər birisi arasında dava-dalaşı və ənsarın: Ey ənsarlar,-dediyini, mühacirin isə: Ey mühacirlər,-dediyini və hər birinin öz tayfasını səslədiyini eşitdiyi zaman demişdir: Mən sizin aranızda ikən cahiliyyat çağırışlarımı edirsiniz.Buraxın bu sözləri! Ondan üfunət qoxusu gəlir."[10] Yəni, qəbilə ilə qürur duymaq.Çünki bütün möminlər qardaşdırlar.Ənsar ilə mühacir arasında, habelə bir qəbilə

[7] Ali İmran:164.
[8] əl-Əhzab:33.
[9] əl-Fəth:26.
[10] Buxari:4622.Muslim:2584.Tirmizi:3315.Əhməd:3/393 .

ilə digər qəbilə arasında heç bir fərq yoxdur.Onlar bir bədən, bir-birini tamamlayan tikili kimi iman qardaşıdırlar.Müsəlmanların ərəblə qeyri-ərəb, ağ dərili ilə qara dərili arasında fərq qoymaması gərəkdir.Uca Allahın dediyi kimi insanlar yalnız təqva ilə fərqlənirlər: *"Allah yanında ən hörmətli olanınız Allahdan ən çox qorxanınızdır".*[11] *"Həqiqətən, möminlər qardaşdırlar. Buna görə də, iki qardaşınızın arasını düzəldin!".*[12] İnsanın mənşəyi və qəbiləsi ilə qürur duyması cahiliyyat işlərindəndir.

Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: Əgər biri beyət etmədən ölərsə cahiliyyat halı üzərə ölər."[13] Çünki cahiliyyat əhli hərcmərclik içində yaşayan insanlardır.Onlar nə bir rəhbərə nə də bir əmirə itaət etmirlər.Bu, cahiliyyat halıdır.

Bir sözlə bütün cahiliyyat işləri yaramazdır.Habelə bizə bütün işlərində cahiliyyat əhlinə bənzəmək qadağan olunub. Peyğəmbərin gəlişi ilə ümumi cahiliyyat sona çatmışdır.Bunun əvəzinə elm və iman gəlmiş, Quran və sunnə enmiş və elm yayılaraq cəhalət aradan qalxmışdır.Quran, sunnə və elm əhlinin sözləri mövcuddur.Belə olan halda cahiliyyat, ümumi cahiliyyat aradan qalxmışdır.Qaldı ki, bəzi insanlarda yaxud bəzi qəbilələrdə yaxud bəzi ölkələrdə müəyyən cahilliyin qalması məsələsinə, heç şübhəsiz ki, cüzi cahiliyyat mövcuddur.

---

[11] əl-Hucurat:13.

[12] əl-Hucurat:10.

[13] Muslim:1851.

Bu səbəbdən, Peyğəmbər (salləllahu aleyhi və slləm) bir kişinin qardaşını yamanlayıb: Ey qara qadının oğlu!- dediyini eşitdiyi zaman demişdir: "Onu anasına görəmi yamanladın! Həqiqətən, səndə cahiliyyat xisləti vardır."[14] Habelə (salləllahu aleyhi və səlləm) demişdir: "Ümmətimdə dörd xislət onların tərk etməyəcəkləri cahiliyyat işlərindəndir: Əsil-nəcabətlə öyünmək, mənşəyi yamanlamaq, ulduzlardan yağmur diləmək və ölü üçün ağı çəkmək."[15] Bu hədislər, bəzi insanlarda cahiliyyat işlərindən bəzi əlamətlərin qalacağını göstərir.Heç şübhəsiz ki, həmin işlər yaramazdır.Lakin bunu edən insanlar kafir olmurlar.Ümumi cahiliyyat isə -həmd olsun Allaha- aradan qalxmışdır.

Bu səbəbdən, insanların cəhalətdə yaxud dünyanın cəhalətdə olduğunu demək doğru deyil.Çünki bu, risalətin varlığını, habelə Quran və sunnəni danmaqdır.Bu cür sözlər demək olmaz.Lakin bəzi insnlardan cahilliyin olduğunu yaxud cahiliyyat xislətlərindən bəzisinin olduğunu demək qəbahətsizdir.Çünki Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gəlişindən öncəki və sonraki vaxtda fərqlər vardır.

Bəzi insanlar deyirlər: Madam ki, cahiliyyat sona çatıb bu məsələləri qeyd etməyə nə lüzum var ki? Allaha həmd olsun ki, biz müsəlmanıq.

Biz deyirik: Biz bu məsələləri insanlar ondan çəkinsin deyə qeyd edirik.Çünki elm tələbəsi onu biləcəyi zaman

---

[14] Buxari:30.Muslim:1661.Əbu Davud:5158.Əhməd:5/161.

[15] Muslim:934.Əhməd:5/344.

ondan yan duracaq.Onu bilməyəcəyi zaman isə ona düşmək ehtimalı vardır.Biz həmin məsələləri insan ondan yan durub çəkinsin deyə qeyd edir və araşdırırıq.Şair demişdir:

Şəri, ondan qorunmaq üçün öyrənmişəm

şəri tanımayan ondan yan durmaz

Bu, bir cəhətdəndir.Digər cəhətdən sən cahiliyyatı tanıyacağın zaman İslamın fəziləti və üstünlüyünü biləcəksən. Şair demişdir:

Gözəlliyi aşkar edən ziddidir

hər bir şey ziddi ilə bəlli olur

Ömər bin Xəttab (r.a) demişdir: "İslamda cahiliyyatın nə olduğunu bilməyən insanlar böyüyəcəyi zaman İslamın bağları bir-bir açılacaq." İnsan cahiliyyat işlərindən xəbərsiz olacağı zaman onun həmin işlərə düşməsi ehtimalı daha böyükdür.Çünki şeytan həmin işləri unutmamış və yatmamışdır.O, daimə ona dəvət edir.

Şeytan və onun zəlalət dəvətçilərindən olan davamçıları daimə insanları cahiliyyata və cahiliyyat işlərini dirçəltməyə, habelə şirk, bidət və xurafatlara və qədim abidələri dirçəltməyə çağırırlar.Bütün bu işlərin arxasında İslama son qoymaq və insanları cahiliyyata döndərmək məqsədi durur.İnsanın həmin işlərdən yan durub uzaqlaşması üçün onu öyrənməsi gərəkdir.

Şeyx demişdir: "Bu işdə ən önəmli və çox təhlükəli olan: Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyinə iman gətirməməkdir.." Çünki cahiliyyat əhli Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təkzib edib ona iman gətirməmiş və Allahdan ona gələn doğru yolu qəbul etməmişlər.

Şeyx (rahiməhullah) demişdir: "Əgər buna cahiliyyat əhlinin yolundan olan işlərin xoş gəlməsi əlavə olunarsa acınacaqlı hal və ziyan daha da böyüyər." Yəni, həm zahirdə həm də, daxildə fəsad baş verər.Daxilin fəsadı Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi dinə iman gətirməməkdir.Zahirin fəsadı isə cahiliyyat işlərini xoş görməkdir.Zahir və daxil fəsada uğrayacağı zaman ziyan daha da böyüyər.Bu, cahilliyin və cahiliyyat işlərini bilməməyin nəticəsidir.Bu səbəbdən cahiliyyat əhlinin yolunu xoş görmək olmaz.Üstəlik onu inkar edib ona nifrət etmək gərəkdir.Onu xoş görən şəxs isə cahiliyyat əhlindən olar.Şeyx buna növbəti ayəni dəlil gətirmişdir: *"Batilə iman gətirib Allaha küfr edənlər, şübhəsiz ki, ziyana uğrayanlardır!"*.[16] *"Batilə iman gətirib"* Yəni, batili təsdiq edənlər.Batil haqqın ziddidir.Haqqa müxalif olan hər bir şey batildir.Batil: İtib gedən faydasız bir şeydir.Uca Allah buyurur: *"Artıq haqdan sonra zəlalətdən başqa nə qalır?!"*[17]

---

[16] əl-Ənkəbut:52.
[17] Yunus:32.

# Birinci məsələ

## Övliyalar və saleh insanlara edilən dua

Onlar Allaha olan dua və ibadətdə salehləri şərik qoşur və Allahın bunu sevdiyini, habelə saleh insanların bunu sevdiyini düşündükləri səbəbilə onlardan Allah yanında şəfaət diləyirdilər.Uca Allah buyurur: *"Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilənlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"-deyirlər."*[18] *"Allahı qoyub özlərinə dost tutanlar: Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik! (deyirlər)."*[19]

Bu, Peyğəmbərin (salləllahu aleyhi və sələm) onlara müxalif olduğu ən əzəmətli məsələdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) ibadəti xalis Allaha aid edərək bunun bütün peyğəmbərlərin gətirdiyi Allahın dini olduğunu və əməllərdən yalnız xalis Allah üçün olanın qəbul ediləcəyini xəbər vermişdir.Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) xəbər vermişdir ki, əgər bir adam insanlara xoş gələcək işlər edərsə Allah ona cənnəti haram edəcək və onun qalacağı yer cəhənnəm olacaq.İnsanlar məhz bu məsələdən ötrü mömin və kafir olaraq ayrılmışlar.Habelə ədavət məhz bu zaman baş vermiş və cihad bundan ötrü vacib olmuşdur.Uca Allah

[18] Yunus:18.
[19] əz-Zumər:3.

buyurur: *“Fitnə qalmayıb, bütün din yalnız Allaha məxsus olanadək onlarla vuruşun.”*[20]

## Şərh:

Uca Allah buyurur: *“Mən cinləri və insanları yalnız Mənə ibadət etmələri üçün yaratdım.”*[21] İbadət sırf Uca Allahın haqqıdır.Kimliyindən asılı olmayaraq Allahdan qeyrisinə ibadət etmək olmaz.Cahiliyyat əhli bu məsələni alt-üst edərək onların yaradılış qayəsi olan Allaha ibadəti tərk edib bütlər, ağaclar, cinlər, mələklər, övliyalar və salehlər kimi Allahdan qeyrisinə ibadət etmişlər.Bununla da, onlar ibadəti Allahdan qeyrisinə yönəltmişlər.Onlardan bir qismi isə ümumiyyətlə Allaha ibadət etmir. Bunlar dinsizlər və ateistlərdən olan kafirlərdir.Onlardan bir qismi isə Allaha və onunla birgə qeyrisinə ibadət edir.Əslində onların hökmü eynidir.Çünki Allahla birgə qeyrisinə ibadət edən şəxs ümumiyyətlə Allaha ibadət etməyən mislindədir.Çünki onun ibadəti batildir.Uca Allah şirkdən razı qalmaz.Habelə O, şirk olan əməli qəbul etməz.Cahiliyyat işlərinin ən əzəmtlisi: İzzət və Cəlal sahibi olan Allaha şərik qoşmaq və bidət ortaya gətirməkdir.

Şeyxin (rahiməhullah) ilk olaraq bu məsələ ilə başlamasına səbəb onun cahiliyyat məsələlərinin ən təhlükəli məsələ olmasıdır.Çünki bu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) ilk

[20] əl-Ənfəl:39.
[21] əz-Zəriyat:56.

rədd etdiyi və insanları onu tərk etməyə çağırdığı məsələdir. Peyğəmbər (salləllahu aleyhi və salləm) digər peyğəmbərlər kimi ilk olaraq ibadəti xalis Uca Allaha aid etmək və Ondan başqasına olan ibadəti tərk etmək əmri ilə başlamışdır.Bu, peyğəmbərlərin ilk vəzifəsidir.Çünki digər işlər məhz bu əsasın üzərində qurulur.Əsas pozulacağı zaman digər işlərin heç bir faydası olmayacaq.Əsas fəsada uğrayacağı və tövhid yoxa çıxacağı zaman namaz, oruc, həcc, sədəqələr və ibadətlər heç bir fayda verməyəcək.Digər əməllərin heç bir faydası olmayacaq.Çünki şirk onu pozur və batil edir.

Onlar cahiliyyat dönəmində Allaha və bir çox başqa məbudlara ibadət edirdilər.Həmin məbudlardan: Övliya və salehlərə ibadət etməkdir.Nuhun tayfasında məhz bu cür hal baş vermişdir.Onlar salehlərə, Vadd, Suva`, Yəğus və Nəsra qarşı aşırıya varıb onların saleh olduqlarını, onların həmin tayfanı Allaha yaxınlaşdırdıqlarını və Allah yanında şəfaətçi olduqlarını əsas gətirib həmin şəxslərin qəbirlərinə ibadət etmişlər.Cahiliyyat dövrünün insanları həmçinin bu minval-la hərəkət etmişlər.Onlar övliyalar, salehlər və mələklərə ibadət edib deyirdilər: "Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!".Habelə deyirdilər: "Bunlar Allah yanında bizim şəfaətçilərimizdir".Həmin adamlar: "Bunlar Allahın şərikləridir",-demir və yalnız belə deyirdilər: Bunlar Allah yanında bizə vasitəçi olan, bizə şəfaətçi olan və bizi Allaha yaxınlaşdıran Allahın qullarıdır. Onlar bu əməllərini şirk adlandırmırdılar.Çünki şeytan bunu onlara gözəlləşdirib bunun şirk olmadığını və yalnız

salehlər ilə təvəssül və salehlər vasitəsilə şəfaət olduğunu onlara təlqin etmişdir. Əsas olan adlar deyil həqiqətlərdir. Onlar bunu şəfaət və yaxınlaşma adlandırsalar belə bu, şirkdir.Çünki adlar həqiqətləri dəyişmir.Allah ibadətdə Ona şərik qoşulmasına razı olmur.Uca Allah buyurur: *"Kim Rəbbi ilə qarşılaşacağına ümid bəsləyirsə, yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətə heç kəsi şərik qoşmasın!"*[22] Habelə buyurur: *"Dini xalis Allaha aid edərək ibadət et!".*[23] Habelə buyurur: *"Onlara dini yalnız Allaha xas edərək ibadət etmək əmr olunmuşdur."*[24] Habelə buyurur: *"Allaha dini xalis Ona aid edərək dua edin."*[25] İbadət, yalnız ixlas və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tabeçilik olacağı zaman faydalı olur.

Bu, ən əzəmətli cahiliyyat məsələsidir: Ölmüş və qaib olan övliya və salehlərə ibadət etmək, onlardan yardım diləmək, onlara pənah aparmaq, onlardan müxtəlif ehtiyacların ödənməsini istəmək.Günümüzdə qəbirlərə tapınanların halı tamamilə bu vəsflərə uyğundur.Hal-hazırda məzarlara ibadət etmək, ölülərə yaxınlaşmaq, Allahı qoyub onlara dua etmək və onlardan yardım istəməkdə öz əksini tapan bütün bu işlər cahiliyyat insanlarının etdikləri əməllərdir.Uca Allah buyurur: *"Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilənlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"-*

---

[22] əl-Kəhf:110.

[23] əz=Zumər:2.

[24] əl-Bəyyinə:5.

[25] Ğafir:14.

*deyirlər."*[26]. Hal-hazırda eyni şeylər baş verir. Qəbirlərə sitayiş edən bu şəxslərə irad tutulduğu və qəbirlərə ibadət etmək qadağan edildiyi zaman onlar deyirlər: Biz qəbirlərə ibadət etmirik. Çünki ibadət Allaha məxsusdur. Lakin bunlar bizimlə Allah arasında olan ortaqlar və Onun yanında bizim şəfaətçilərimizdir. Əslində isə Uca Allahın cahiliyyat əhlinə irad tutduğu məsələ məhz bu olmuşdur: *"Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilənlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"- deyirlər."*[27] Habelə buyurur: *"Allahı qoyub özlərinə dost tutanlar: Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik! (deyirlər)."*[28] Onlar ibadət etdiklərinin yaratmaq, ruzi vermək, öldürmək və diriltmək kimi işlərdə Allaha şərik olduqlarını hesab etdikləri üçün onlara ibadət etməmişlər. Onlar bu işlərin Allaha məxsus olduğunu etiraf edirdilər. Onlara yalnız Allaha yaxınlaşdırmaq üçün ibadət etdilər. Onlar deyirlər: Biz günahkar qullarıq. Bunlar isə Allah qatında nüfuza və ad-sana sahib olan saleh kişilərdir. Biz tövbəmizin və ibadətimizin qəbul edilməsində onlardan Allah qatında bizə vasitəçi olmalarını istəyirik. İnsan və cinlərdən olan şeytanlar onlara bu işi məhz bu cür gözəl göstərmişlər. Təəccüb doğuran amil, onların Quranı oxuyub bu ayələrin üzərindən keçib onlara diqqət yetirməmələridir. Bununla birgə onlar qəbirlərə ibadət etməyi davam etdirirlər. Bu isə, cahiliyyat əməlidir. Buna səbəb, həmin şəxslərin

---

[26] Yunus:18.

[27] Yunus:18.

[28] əz-Zumər:3.

cahiliyyat insanlarının əhvalları haqqında bilgisiz olmalarıdır.Onlar bu işlərin cahiliyyat işlərindən olduğunu bilməmişlər.Bu, cahiliyyat işləri haqqında bilgisizliyin nəticəsidir.

Daha sonra şeyx (rahiməhullah) demişdir: "Bu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) onlara müxalif olduğu ən əzəmətli məsələdir.O, ibadəti xalis Allaha aid edib bunun bütün peyğəmbərlərin gətirdiyi din olduğunu və əməllərdən yalnız xalis Allah üçün olanın qəbul ediləcəyini xəbər vermişdir. Habelə xəbər vermişdir ki, əgər bir adam insanlara xoş gələcək işlər edərsə Allah ona cənnəti haram edəcək və onun qalacağı yer cəhənnəm olacaq.İnsanlar məhz bu məsələdən ötrü mömin və kafir olaraq ayrılmışlar.Habelə ədavət məhz bu zaman baş vermiş və cihad bundan ötrü vacib olmuşdur. Uca Allah buyurur: *"Fitnə qalmayıb, bütün din yalnız Allaha məxsus olanadək onlarla vuruşun."*[29]

Allahın Özü ilə qulu arasında vasitə etməyə ehtiyacı varmı?

Uca Allah yaxın və duaları qəbul edəndir.O, hər şeyi eşidir və görür, rəhm edir və qullarının tövbəsini qəbul edir. Allah bizə duada vasitəçilər tutmağımızı əmr etməmişdir. Əksinə O, bir-başa Ona dua etməyi əmr etmişdir.*"Dini xalis Allaha aid edərək dua edin!"*.[30] *"Rəbbiniz buyurdu: "Mənə dua edin, Mən də sizin dualarınızı qəbul edim! Mənə ibadət etməyi təkəbbürlərinə sığışdırmayanlar cəhənnəmə zəlil olaraq*

[29] əl-Ənfəl:39.
[30] Ğafir:14.

*girəcəklər!"*[31] Uca Allah bizə bir-başa Ona dua etməyi əmr edib bizimlə Onun arasında vasitəçilər tutmağımızı əmr etməmişdir.

Bu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) onlara müxalif olduğu ən əzəmətli məsələdir.Həmin məsələ şirk məsələsidir.Çünki Uca Allah Peyğəmbəri (salləllahu aleyhi və səlləm) insanlara göndərdiyi zaman o, ilk olaraq Uca Allahın tövhidinə və şirkin rədd edilməsinə çağırmaqla başlamışdır. Peyğəmbər (salləllahu aleyhi və səlləm) deyirdi: "Lə iləhə illəllah deyin ki, qurtuluşa nail olasınız".[32] Habelə deyirdi: "Mən insanlara qarşı, onlar "lə iləhə illəllah" deyənə qədər savaşmaqla əmr olundum.Onlar bunu deyəcəkləri zaman məndən qanları və mallarını qorumuş olacaqlar."[33] Peyğəmbər (salləllahu aleyhi və səlləm) onların yığışdıqları yerlərdə, onların evlərində, həcc mövsümünün günlərində onların önünə çıxıb onları tövhidə çağırırdı.O, tövhidə və Allahı ibadətdə təkləşdirməyə çağırmaq üçün Taifə yollandığı kimi bundan ötrü müxtəlif yerlərə yollanırdı.Bu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) ilk olaraq başladığı iş olmuşdur.Çünki bu bir əsasdır.Dəvətçilərin məhz bu tərzdə həmin məsələyə diqqət ayırmaları və qurduqları dəvətdə tövhidə çağırışı ən önəmli iş etmələri gərəkdir.

---

[31] Ğafir:60.

[32] Əhməd:3/492.İbn Hibban:6528.Təbərani "əl-kəbir:5/61_4582 saylı hədis.Dəraqutni "əs-sunən:3/45.Beyhaqi "dəlailu-n-nubuvva:5/380.Hakim "əl-mustədrək:3/512_4275_saylı hədis.

[33] Buxari:1399,2946.Muslim:20,21.

Peyğəmbər (salləllahu aleyhi və səlləm) ibadəti xalis Allaha aid edib övliyalara, salehlərə yaxud digərləri kimi Allahdan qeyrisinə ibadəti tərk etmişdir.Bu, peyğəmbərlərin dinidir. Uca Allah buyurur: *“Səndən əvvəl elə bir peyğəmbər göndərmədik ki, ona: “Məndən başqa heç bir ilah yoxdur. Buna görə də yalnız Mənə ibadət edin!” - deyə vəhy etməyək.”*[34] Habelə buyurur: *“Biz hər ümmətə: Allaha ibadət edin, Tağutdan çəkinin! -deyə peyğəmbər göndərmişdik.”*[35] Bu, peyğəmbərlərin yoludur.Allaha ibadət etməyə çağırış və Ondan qeyrisinə ibadət etməyi tərk etmək.Bütün digər islahatlar isə bunun ardından gəlir.

Uca Allah əməllərdən yalnız xalis Onun vəchi üçün ediləni və şirkdən kənar olanı qəbul edir.Habelə əməlin Uca Allahın şəriətinə uyğun olması labüddür.Uca Allah bidətə və şirkə qarışmış əməli qəbul etmir.Uca Allah buyurur: *“Kim Rəbbi ilə qarşılaşacağına ümid bəsləyirsə yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətə heç kəsi şərik qoşmasın!”*[36] Habelə buyurur: *”Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın!”*[37] Uca Allah, Ona ibadət etmək əmri ilə kifayətlənməyib əlavə olaraq həmçinin şirki qadağan etmişdir.Çünki Allaha edilən ibadətə şirk daxil olarsa əməl qəbul olunmaz.Tağutun inkar edilməsi isə Allaha iman etməkdən ön-

[34] əl-Əhbiyə:25.
[35] ən-Nəhl:36.
[36] əl-Kəhf:110.
[37] ən-Nisə:36.

dədir. *”Hər kəs tağutu inkar edib Allaha iman gətirərsə, o, artıq qırılmaq bilməyən bir dəstəkdən yapışmış olur.”*[38]

Bu, “lə iləhə illəllah” kəlməsinin mənasıdır.Həmin kəlmə inkar və isbatdan ibarətdir.Şirkin inkar tövhidin isə isbat edilməsi.(لا إلـه : ilah yoxdur) sözləri bütün ibadət olunanları batil edir, (إلا الله : Allahdan başqa) ibadəti sırf Allaha isbat edir. Allah əməllərdən yalnız xalis Onun vəchi üçün ediləni qəbul edir.Habelə O, bidət və Peyğəmbərin (səlləllahu aleyhi və səlləm) yoluna müxalif olan əməli qəbul etmir. Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Kim bizim işimizdən olmayan bir əməl edərsə o, rədd edilər.”[39] Digər rəvayətdə gəlmişdir: “Kim bizim bu işimizə ondan olmayan yenilik gətirərsə o, rədd edilər.”[40] Bu səbəbdən, alimlər demişlər: Əməl yalnız iki şərtlə qəbul olunur:

Birinci şərt: Uca Allaha ixlasın olması.

İkinci şərt: Peyğəmbərə tabeçiliyin olması.

Şərtlərdən biri pozulacağı zaman həmin əməl qəbul edilməyəcək və saleh olmayacaq.

Uca Allah xəbər vermişdir ki, əgər biri ona xoş gələn bütlərə, övliyalara, ağaclara, daşlara və qəbirlərə ibadət edib ibadətdə Allahın kitabı və Peyğəmbərin sunnəsinə qayıtmaz və Quran və sunnəyə müxalif olacağı halda belə sadəcə ona xoş gələnə yaxud nəfsi istəklərinə uyarsa Allah ona

---

38 əl-Bəqərə:256.

39 Buxari:2550.Muslim:1718.Əbu Davud:4606.İbn Macə:14.Əhməd:6/256.

40 Buxari:2697.Muslim:17/1718.

cənnəti haram edəcək və onun qalacağı yer cəhənnəm olacaq.Uca Allah buyurur: *“Allaha şərik qoşana Allah, şübhəsiz ki, cənnəti haram edər. Onun düşəcəyi yer cəhənnəmdir.”*[41] Yəni, ona qəti olaraq cənnətə girməyi yasaq edəcək.Ərəb dilində “التحريم : haram etmə” yasaq etmə mənasında gəlir.Müşrikə qəti olaraq cənnətə girmək yasaq edilmişdir. Onun ora girməyə heç bir şansı yoxdur.Onun qalacağı yer cəhənnəmdir.Bu, Allaha şərik qoşmağın sonucudur. Onlar: *“Biz onlara yalnız Allaha yaxınlaşdırmaq üçün ibadət edirik”*,-desələr belə, onlar tövbə etmədən bu hal üzərə oləcəkləri zaman Allah onlara cənnəti haram edəcək və onların qalacaq yerlərini sonsuzluğa qədər cəhənnəm edəcək.Özünü xilas etmək istəyən şəxs buna diqqət yetirsin və bu və digər işlərdə cahiliyyat işləri üzərində qalmasın.

Şeyx demişdir: “İnsanlar məhz bu məsələdən ötrü mömin və kafir olaraq ayrılmışlar.” Yəni, tövhid və şirk məsələsinsdən ötrü olmuşdur.İnsanlardan bir qismi Peyğəmbəri (salləllahu aeyhi və səlləm) təsdiq edib ona iman gətiriş və ibadəti sırf Uca Allaha aid etmişlər.Bunlar möminlərdir. İnsanlardan bəzisi isə ona müxalif olub şirk üzərə, özlərinin və öncəki ata-babalarının ibadət etdikləri şeylər üzərə qalmışlar.Peyğəmbərlərə qarşı çıxan ümmətlərin halı məhz bu cür olur.Çünki onlar ata-babalarının yolu üzərə qalmaq istəyirlər.Uca Allah buyurur: *“Biz səndən əvvəl hər hansı bir məmləkətə qorxudan bir peyğəmbər göndərdiksə, onun naz-nemət içində yaşayan böyükləri sadəcə olaraq: Biz atalarımızı bir din üzərində gördük və biz də onların ardınca getməkdəyik!*

---

[41] Maidə:72.

*-dedilər."*[42] Habelə demişlər: *"İndi atalarımızın tapındığına ibadət etməyi bizə qadağanmı edirsən?".*[43] Bu, onların sözləri və dəlilləridir.Onlar Allaha ibadət etmək əvəzinə ata-babalarının yolundan tutunurlar.

Şeyx demişdir: "Ədavət məhz bu zaman baş vermiş".Yəni, müsəlmanlar və müşriklər, möminlər və kafirlər arasında ədavət məhz bu zaman baş vermişdir.Çünki möminlərin kafirlərə ədavət bəsləmələri vacibdir.Onlar ən yaxın insanlar olsalar belə kafir olacaqları zaman onları sevmək icazəli deyil.Uca Allah buyurur: *"Allaha və axirət gününə iman gətirən heç bir tayfanın Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlarla -öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar belə -dostluq etdiyini görməzsən. Onlar elə kimsələrdir ki, Allah onların qəlblərinə iman yazmış və Öz dərgahından onlara ruh vermişdir."*[44] Allah, Peyğəmbər və möminlərlə dostluq etmək, habelə küfr və kafirlərdən, şirk və müşriklərdən uzaq durmaq vacibdir. *"Biz sizi inkar edirik (dininizə küfr etdik). Siz bir olan Allaha iman gətirməyincə bizimlə sizin aranızda həmişə ədavət və nifrət olacaqdır!"*[45] Bu, İbrahimin dinidir.

Hal-hazırda dinlər arası dialoqa və dinlərin ortaq məxrəcə gəlməsinə çağıranlar vardır.Onlar deyirlər ki, bu dinlərin hamısı səmavi dinlərdir.Onlardan bəziləri daha da uzağa gedərək deyirlər: Yəhudi və nəsranilər kafir deyillər. Onların dedikləri bu sözlər Peyğəmbərin gətirdiyi dinə, Qurana və tabe olmağa əmr olunduğumuz İbrahimin millətinə ziddir. *"Ey iman gətirənlər! Əgər atalarınız və*

---

[42] əz-Zuxruf:23.
[43] Hud:62.
[44] əl-Mucədilə:22.
[45] əl-Mumtəhinə:4.

*qardaşlarınız küfrü imandan üstün tuturlarsa, onları özünüzə dost bilməyin. Sizdən onları dost tutanlar məhz onlar zalımlardır."*[46] Bunlar isə deyirlər: Yəhudi və nəsranilər kafir deyillər.Bu, hal-hazırda mövcud olan çağırışlardır.Bu çağırışlar möminlərlə kafirlər arasında olan dostluq və düşmənçilik anlamına son qoymağa yonəlib.Muhamməd Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman etməyən, istər bu kitab əhlindən istərsə də qeyrisindən olsun hər bir şəxs kafirdir.Çünki Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gəlişindən sonra hər bir şəxsin ona iman etməsi zəruridir. Ona iman etməyən hər bir şəxs kafirdir.Yəhudi və nəsranilər Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iman etmirlər.Onlar kafirlərdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Elə bir yahudi və nəsrani yoxdur ki, mənim haqqımda eşitdikdən sonra gətirdiyimə iman etmədikdə atəşə girməsin."[47] Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gəlişindən sonra heç kəs onun dinindən çıxmaq imkanına malik deyil. Hətta Peyğəmbər (salləllahu aleyhi və səlləm) belə demişdir: "And olsun Allaha ki, əgər qardaşım Musa sağ olsaydı onun mənə tabe olmaqdan başqa yolu olmazdı."

Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gəlişindən sonra İslamdan savayı doğru din qalmamışdır. *"Kim İslamdan başqa bir din ardınca gedərsə, (belə bir din) heç vaxt ondan qəbul olunmaz və o, axirətdə zərər çəkənlərdən olar!".*[48]

Hal-hazırda səslənən bu çağırış batildir.Hazırda ondan ötrü konfranslar və yığıncaqlar təşkil olunur və "dinlər arası dialoq" adlandırdıqları dinlər arasında yaxınlaşma çağırışları üçün müxtəlif vəsaitlər xərclənir.Subhanəllah! İman ilə

[46] ət-Təubə:23.

[47]

[48] Ali İmran:85.

küfr arasında dialoq!? Şirk ilə tövhid arasında dialoq!? Allahın düşmənləri ilə Allahın dostları arasında dialoq!?

Daha sonra şeyx demişdir: "Bundan ötrü cihad vacib olmuşdur." Uca Allah buyurur: *"Fitnə qalmayıb, bütün din yalnız Allaha məxsus olanadək onlarla vuruşun."*[49]

Bizim kafirlərlə münasibətdə üç şeyə riayət etməyimiz vacibdir:

Birinci: Onlara ədavət bəsləmək.Çünki onlar Uca Allahın və Peyğəmbərin düşmənləridir.

İkinci: Onları imana və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tabe olmağa çağırmaq.Bu, müsəlmanların üzərində vacib olan bir işdir.

Üçüncü: Onlar İslama çağırılacaqları və bunu rədd edəcəkləri zaman onlara qarşı cihad etmək.Onlara qarşı cihad etmək və savaşmaq vacib olur.Uca Allah buyurur: *"Fitnə qalmayıb, bütün din yalnız Allaha məxsus olanadək onlarla vuruşun."*[50] Müsəlmanlar savaşmaq iqtidarında olacaqları təqdirdə onlarla bizim aramızda sonuncu mərhələ savaş olacaq.Uca Allah buyurur: *"Müşrikləri harada görsəniz, öldürün, yaxalayıb əsir alın, mühasirə edin və bütün yollarıkeçidlərini tutun."*[51] Bu ayə, İslamda cihadın hikmətini bəyan edir.Cihadın hikməti: Fitnə olmayana qədər şirkin kökünü kəsməkdir.Burada fitnə deyildikdə şirk qəsd edilir.Yəni, şirk qalmayıb, bütün din Allaha məxsus olanadək onlarla

[49] əl-Ənfəl:39.
[50] əl-Ənfəl:39.
[51] ət-Təubə:5.

vuruşun.Bu, cihadın əsas məramıdır.Cihad etməkdə məqsəd hökmüranlıq və nüfuzu genişlətmək, məmləkətləri ələ keçirtmək və sərvətlər əldə etmək deyil.Məqsəd bu deyil. Məqsəd, İzzət və Cəlal sahibi olan Allahın kəlməsini uca etmək və yer üzündə şirkə son qoymaqdır.Məqsəd məhz budur.

Habelə İslamda cihadın məqsədi, bəzi yaramaz yazarların dediyi kimi müdafiə olunmaq deyil.Onlar deyirlər: Cihad müdafiədən ötrüdür.Yəni, onlar bizə təcavüz edəcəkləri zaman biz təcavüzü dəf etmək üçün onlara qarşı vuruşacağıq.Subhanəllah! Uca Allah buyurur: *“Müşrikləri öldürün.”*[52] *“Fitnə qalmayıb, bütün din yalnız Allaha məxsus olanadək onlarla vuruşun.”*[53] İslamda savaşın məqsədi: Dəvətin və dinin yayılması və şirkin yox edilməsidir. *“Fitnə qalmayıb, bütün din yalnız Allaha məxsus olanadək onlarla vuruşun.”*[54] İslamda savaş iki növdür.

Birinci növ: Müsəlmanlar aciz olacaqları zaman müdafiə savaşı.

İkinci növ: Müsəlmanlar güclü və qüvvətli olacaqları zaman tələb savaşı.

[52] ət-Təubə:5.
[53] əl-Ənfəl:39.
[54] əl-Ənfəl:39.

# İkinci məsələ

## Cahiliyyat əhli öz ibadətləri və dinlərində fərqli olmuşlar

Onlar öz dinlərində fərqlənirdilər.Uca Allah buyurur: *"Hər bir firqə öz dininə sevinər."*[55] Habelə dünyavi işlərdə onlardan hər biri özlərinin doğru olduğunu hesab edirdilər. Uca Allah dində bir olmaq haqqında buyurur: *"Allah: "Dini doğru-dürüst tutun, onda ayrılığa düşməyin!" -deyə Nuha tövsiyə etdiyini, sənə vəhy buyurduğunu, İbrahimə, Musaya və İsaya tövsiyə etdiyini dində sizin üçün də qanuni etdi."*[56] Habelə buyurur: *"Şübhəsiz ki, sənin firqə-firqə olub dinini parçalayanlarla heç bir əlaqən yoxdur."*[57] Habelə Allah onlara oxşamağı bizə qadağan etmişdir.Uca Allah buyurur: *"Açıq-aydın dəlillər gəldikdən sonra, bir-birindən ayrılan və ixtilaf törədən kəslər kimi olmayın!"*.[58] Habelə bizə dünyada firqə-firqə olmağı qadağan etmişdir: *"Hamılıqla Allahın ipinə möhkəm sarılın və ayrılmayın!"*. [59]

---

[55] ər-Rum:32.
[56] əş-Şura:13.
[57] əl-Ənam:159.
[58] Ali İmran:105.
[59] Ali İmran:103.

## Şərh:

Bu, Peyğəmbərin (səllallahu aleyhi və səlləm) cahiliyyat əhlinə müxalif olduğu ikinci məsələdir: Cahiliyyat insanlarının din və dünya işlərində parçalanmaları. Onların vəsfi parçalanma və ixtilafdır. Uca Allah buyurur: *"Müşriklərdən olmayın! O kəslərdən ki, öz dinini parçalayıb firqə-firqə oldular. Hər bir firqə öz dininə sevinər."*[60] Bu, yəhudi, nəsrani və bütpərəstlərdən olan cahiliyyat əhlinin vəsfi olmuşdur. Digər cahiliyyat millətləri həmçinin dinlərində parçalanmışlar. Onlardan hər biri ona çağırdığı və özünü ona nisbət etdiyi dinə sahib olmuşdur. Nəsranilər nəsraniliyə, yəhudilər isə yəhudiliyə çağırır. Habelə bu dinlərdən hər biri digərini təkfir edir. Uca Allah buyurur: *"Yəhudilər dedilər: "Nəsranilər bir şeyə istinad etmirlər". Nəsranilər də: "Yəhudilər bir şeyə istinad etmirlər", - söylədilər. Halbuki onların hər ikisi kitab oxuyur. Bilməyənlər də onlar kimi danışdılar."* [61] Bilməyən şəxslər isə, müşriklərdir. Çünki onlar nə kitaba nə də ki, səmavi dinə sahib deyillər. Onlar həmçinin biri-birini təkfir edir və öz aralarında ixtilaf edirlər. *"Allah onların aralarındakı bu ixtilafın hökmünü qiyamət günü verəcəkdir!"*.[62] Yəni, Uca Allah kimin haqq üzərə kimin isə batil üzərə olduğunu bəyan edəcək. O, hər bir şəxsin əməlinin qarşılığını verəcək. Uca Allahın dini birdir. Uca Allah buyurur: *"Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım."*[63] Habelə

[60] ər-Rum:31-32.
[61] əl-Bəqərə:113.
[62] əl-Bəqərə:113.
[63] Zəriyat:56.

buyurur: *“Ey insanlar! Sizi və sizdən əvvəlkiləri yaratmış Rəbbinizə ibadət edin ki, müttəqi olasınız!”*[64]

Uca Allahın dini yəhudi, nəsrani, bütpərəst, ərəb və qeyri-ərəblərdən olan bütün məxluqat üçün birdir.Bu din, tək və şəriksiz olan Allaha ibadət etməkdir.Lakin bunlar dinlərini bölmüşlər.Nəticədə onlardan olan hər tayfanın digər tayfadan fərqlənən dini ortaya gəlmişdir.Hətta yəhudilər öz aralarında ixtilafda olmuşlar.Nəsranilər həmçinin öz aralarında ixtilafda olmuşlar.Onlar müxtəlif firqələr olmuşlar.Onlar hal-hazırda da ixtilafdadırlar.

Həmçinin bütpərəst olan ərəblər ibadətlərində müxtəlif olmuşlar.Onlardan bəziləri günəşə, bəziləri aya, bəziləri bütlərə, bəziləri mələklərə, bəziləri övliya və salehlərə, bəziləri isə ağac və daşlara ibadət edirdilər.

Bu, kitab əhli və oxuyub yazmağı bilməyənlərdən olan cahiliyyat əhlinin durumu olmuşdur.Onlar bir din ətrafında birləşmirdilər.Onlar sadəcə firqə-firqə olmuşlar. *”Hər bir firqə öz dininə sevinər.”* İnsanın tutduğu batil yol ilə fərəhlənməsi onun cəzası və bəlasının böyüklüyünü göstərir. Çünki vacib olan, bunun tam əksidir.İnsan zəlalətə düşməkdən və yolunu azmaqdan, habelə həlaka düşməkdən qorxmalıdır. Lakin bunların durumu tam əksini göstərir: *”Hər bir firqə öz dininə sevinər.”* Onlar sahib olduqları yol ilə, onun haqq yaxud batil olması mahiyyətinə varmadan fərəhlənirlər.Onlar üçün önəmli olan, bunun onların ata-

[64] əl-Bəqərə:21.

babalarının, öz tayfalarının və yaxınlarının tutduğu yol olmasıdır.Bunun haqq yaxud batil olması onları marağlandırmır.Heç şübhəsiz ki, bu, bəla və sınaqdır. İnsanın batildən ötrü fərəhlənməsi onun cəzaya məruz qaldığını göstərir.Çünki insan batildən ötrü sevinəcəyi zaman ondan heç vaxt dönməyəcək.

Bu, cahiliyyat əhlinin vəsfidir.Uca Allah bizə bunu qadağan etmişdir.Uca Allah buyurur: *"Müşriklərdən olmayın! O kəslərdən ki, öz dinini parçalayıb firqə-firqə oldular. Hər bir firqə öz dininə sevinər."*[65] Habelə buyurur: "*"Şübhəsiz ki, sənin firqə-firqə olub dinini parçalayanlarla heç bir əlaqən yoxdur."*[66] Habelə Öz Peyğəmbərinə növbəti ayəni nazil edib buyurur: *"Allah: "Dini doğru-dürüst tutun, onda ayrılığa düşməyin!" -deyə Nuha tövsiyə etdiyini, sənə vəhy buyurduğunu, İbrahimə, Musaya və İsaya tövsiyə etdiyini dində sizin üçün də qanuni etdi."*[67] Allahın əmr etdiyi budur: Nuh, İbrahim, Musa, İsa və Muhammədin (salləllahu va səlləmə aleyhim əcməin) dinini doğru-dürüst tutmaq.O, bütün peyğəmbərlərin dinidir.Uca Allahın məhz bu peyğəmbərləri qeyd etməsinə səbəb, onların ən fəzilətli və əzmkar peyğəmbərlər olmalarıdır: Nuh, İbrahim, Musa, İsa və Muhamməd.Onlar əzmkarlıq sahibləri və ən fəzilətli peyğəmbərlərdir.Uca Allah bütün peyğəmbərlərdən, xüsusən də bu beş nəfərdən əhd almışdır.Uca Allah buyurur: *"Xatırla ki, Biz bir zaman peyğəmbərlərdən əhd almışdıq: səndən də, Nuhdan da,*

[65] ər-Rum:31-32.
[66] əl-Ənam:159.
[67] əş-Şura:13.

*İbrahimdən də, Musadan da, Məryəm oğlu İsadan da! Biz onlardan möhkəm bir əhd almışdıq."*[68] Bütün peyğəmbərlərin dini bir olmuşdur: Tək və şəriksiz Allaha ibadət etmək.Bu, ümumi olaraq bütün peyğəmbərlərin, xüsusi olaraq isə adı çəkilən beş nəfərin dinidir.Bu dində, ixtilaf və parçalanma qəbul edilməzdir. Onlardan hər birinin, habelə onlardan hər bir tayfanın ayrıca dini olmamışdır.Onların hamısının dini birdir.O, bütün bəşəriyyət üçün gələn Uca Allahın dinidir. *"Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım."*[69]

Bütün canlıların, cinlər və insanların dini birdir.Həmin din, tövhid və Allahı ibadətdə təkləşdirməkdir.Uca Allah insanların öhdəsinə düşəni peyğəmbələrin dili ilə açıqlamışdır.O, bizə kitab nazil etmiş, elçilər göndərmiş və məhz bunun din olduğunu demişdir.İbadət budur və o, "təuqifiy" olaraq gəlmişdir (Allahın təyin etdiyi çərçivədədir).Din həmçinin belədir.İnsanların özlərindən dinlər ortaya gətirmək ixtiyarı yoxdur.Bu, sırf Uca Allahın haqqıdır və dini təyin edən də məhz Odur. *"Allahın dində izin verməyiyi bir şeyi onlar üçün qanuni edən şərikləri vardır."*[70] Bu, Allahdan gələn inkardır.Din Allahın əmr etdiyi və peyğəmbərlərin dili ilə kitablarda endirdiyidir.Bu səbəbdən din "təuqifiy" olaraq gəlmişdir.Peyğəmbərlər ancaq Uca Allahın buyuruğlarını insanlara çatdıran şəxslərdir.Peyğəmbərlərin vəzifəsi budur.Onlar digərləri kimi bu din vasitəsi ilə Allaha yaxınla-

---

[68] əl-Əhzab:7.

[69] Zəriyat:56.

[70] əş-Şura:21.

şırlar.Onlar Uca Allahın onlara və ümmətlərinə əmr etdiyi din ilə ibadət edən qullardır.

Uca Allah buyurur: *"Açıq-aydın dəlillər gəldikdən sonra, bir-birindən ayrılan və ixtilaf törədən kəslər kimi olmayın!".*[71] Bu, dində parçalanıb ixtilafda olan cahiliyyat əhli mislində olmağı qadağan edən sözlərdir.Onların bunu etmələri, cahillik üzündən deyil nəfsi istəklərinə uymaları üzündən olmuşdur: *"Açıq-aydın dəlillər gəldikdən sonra".* Onlar, açıq-aydın dəlilləri tərk edib nəfsi istəklərinə tabe olmuşlar. Onları bu təfriqəçilik və parçalanmaya sürükləyən nəfsi istəklərdir.Onlar öz nəfsi istəklərini özləri üçün Allahdan savayı ilahlar etmişlər.Uca Allah isə heç bir insan üçün bəhanə yeri buraxmamışdır.Çünki O, elçilər göndərib kitablar endirmişdir. *"Mənim tərəfimdən sizə bir hidayət gəldiyi zaman Mənim hidayətimə tabe olanlara heç bir qorxu yoxdur və onlar qəmgin olmazlar". Kafir olaraq ayələrimizi təkzib edənlər isə cəhənnəmlikdirlər, onlar orada əbədi qalacaqlar."*[72]

Uca Allah Adəmi yer üzünə endirdiyi zamandan bəri O, insanları din və peyğəmbərsiz buraxmamışdır.Uca Allah daimə biri-birinin ardınca peyğəmbərlər göndərir və insanlara dini əmr edib onlara onu bəyan edirdi.Nəhayət qiyamət gününə qədər öz qüvvəsini itirməyəcək dinə sahib olan Muhamməd (salləllahu aleyhi və səlləm) sonuncu peyğəmbər olaraq göndərmişdir. Onun dini Quran və sunnə üzərində qurulmuşdur.Elə bir zaman kəsiyi olmamışdır ki, orada

[71] Ali İmran:105.
[72] əl-Bəqərə:38-39.

peyğəmbərlərin gətirdiyi din olmasın. *“Elə bir ümmət yoxdur ki, onun içindən qorxudan bir peyğəmbər gəlib-getməsin!”*[73] *“Biz peyğəmbərləri müjdə gətirən və əzabla qorxudan olaraq göndərdik ki, daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın.”*[74] Heç kəs üçün bəhanə yeri yoxdur: *“Bizə nə bir müjdə verən, nə də bir qorxudan kimsə gəldi”, -deməməyiniz üçün”.*[75] Uca Allah canlıların üzərindən hüccəti qaldırmışdır. Lakin cahiliyyat əhli peyğəmbərlərin gətirdikləri dinə cahilllik səbəbilə deyil yalnız inadkarlıq və nəfsi istəklərə uyma səbəbilə müxalif olmuşlar.Xüsusi olaraq yəhudi və nəsraniləri vurğulamaq olar.Onlar bunu bilirdilər.Məhz bu səbəbdən, Uca Allah onları kitab əhli adlandırmışdır.Onların, kitab və elm əhli olmaları ilə birgə Uca Allahın əmrinə müxalif olub öz nəfsi istəklərinə tabe olmaları onların mənfi cəhətidir.Uca Allah bu ümməti bu cür cahiliyyat məsləki üzərində olmaqdan qadağan etmiş və onlara Peyğəmbərə (salləllahu aleyhi və salləm) nazil etdiyi və səhabələrin və rəşidi xəlifələrin getdiyi dindən tutunmağı əmr etmişdir.Ümmətin qiyamət saatı gələnəcən tutunmalı olduqları din məhz budur. Onlar bir işdə ixtilafa düşdükləri zaman ixtilaf etdikləri işi Quran və sunnəyə ərz etməlidirlər. *“Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin!”.*[76]

---

[73] Fatir:24.

[74] ən-Nisə:165.

[75] əl-Maidə:19.

[76] ən-Nisə:59.

İxtilaf etmək bəşər övladının təbiətindəndir.Lakin Uca Allah bizi, ixtilaf edəcəyimiz və hansımızın doğru olduğunu bilməyəcəyimiz zaman Quran və sunnəyə yönəltmişdir.Bu vəziyyətdə biz Quran və sunnəyə qayıtmalıyıq.Əgər Quran və sunnə bir şeyin haqq olduğuna şahidlik edərsə biz onu götürəcəyik.Əgər onun haqq olmadığına şahidlik edərsə onu tərk edəcəyik.Çünki bizim hədəfimiz görüşləri müdafiə etmək yaxud ata-babaları və ya şeyxləri təzim etmək deyil haqqa tabe olmaqdır.Çünki müsəlmanlar bu kimi şeylərdən kənar olmalıdırlar.Haqq mömінin axtardığıdır.Onu harada taparsa götürəcək.Gerçək hədəf: *"Bu, daha xeyirli"* Mübahisə üzərə qalmağınızdan. *"Və nəticə etibarilə daha yaxşıdır."*[77] Yəni: Sonuc olaraq daha yaxşıdır.Uca Allahın bizim üçün mübahisəni həll edən və haqqa bələdçilik edən bu amili buraxması Onun bizə qarşı olan mərhəmətidir.Bu səbəbdən demişdir: *"Allahın ipindən möhkəm yapışın"*.[78] Allahın ipi, Qurandır.Bizdən bir qismi deyil hamımız ona sarılmalıyıq. Yəni, bütün canlılar və ələxsus bu ümmət: *"Və ayrılmayın! Allahın sizə verdiyi nemətini xatırlayın ki, siz bir-birinizə düşmən ikən O sizin qəlblərinizi birləşdirdi və Onun neməti sayəsində bir-birinizlə qardaş oldunuz. Siz oddan olan bir uçurumun kənarında ikən O sizi oradan xilas etdi."*[79] "*oddan olan bir uçurumun kənarında ikən*". Cahiliyyat dinində ikən. "*O sizi oradan xilas etdi*".Sizi İslam və bu Quran ilə xilas etmişdir.Elə isə, Allahın nemətinə şükr edin. Allahın

[77] ən-Nisə:159
[78] Ali İmran:103.
[79] Ali İmran:103.

ipindən yapışmaq Onun kitabından yapışmaq anlamındadır. Çünki həmin kitab ondan tutunacaq şəxsi nicata yetişdirən ondan üz çevirəni isə həlaka düçar edən möhkəm bir ipdir.

Uca Allah bizə burada cahiliyyat əhlinin durumunu xəbər verir və onları bu cür vəsf edir: *"O kəslərdən ki, öz dinini parçalayıb firqə-firqə oldular. Hər bir firqə öz dininə sevinər."*[80] Ardından bizə onlara bənzəməyi qadağan edir. Daha sonra bizi ixtilafdan qoruyan, habelə çəkişmə və həlaka düşməkdən xilas edən Qurandan tutunmağı əmr edir. Xilas yolu yalnız Uca Allahın kitabı və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsindədir. *"Hamılıqla Allahın ipindən möhkəm yapışın və ayrılmayın!"* Cahiliyyat əhli isə öz dinlərində ayrılmışdılar.Uca Allah buyurur: *"Hər bir firqə öz dininə sevinər."* Onlar, batil olsa belə öz məsləki ilə sevinirlər.Həmçinin onlar dünya işlərində parçalanmışdılar. Çünki əgər biri dinini zay edərsə mütləq dünyasını da zay edəcək.Bu səbəbdən, onlar dünya işlərində onları birləşdirəcək camaata sahib olmayıb firqələrə bölünmüşdülər. Hər bir qəbilə özləri üçün hökmlər təyin edir, hər bir qəbilə digər qəbilənin qanlarını və mallarını özləri üçün halallaşdırırdılar.

Bu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gəlişindən öncə ərəblərin durumu olmuşdur.Onlar dinlərini və dünyalarını zay etmişdilər.Onların arasında daimə qorxu, narahatçılıq və aclıq hökm sürürdü.Habelə cahiliyyat dönəmi daimə savaşlar, basqınlar və iğtişaşlarla yadda qalmışdır.Hətta

---

[80] Ər-Rum:32.

qardaşlas belə cahiliyyat dönəmində bir-birilə savaşırdılar. Belə ki, Mədinədə məskunlaşan əl-Əus və əl-Xazrəc qəbilələri nəsəb cəhətindən qardaş idilər.Onlar Qahtan qəbiləsinə mənsub idilər.Lakin onların arasında şiddətli müharibə baş qaldırmış və yüz ildən çox zaman kəsiyində davam etmişdir. Onlar həmin müharibəni Əus və Xəzrəc arasında olan "buas müharibəsi" adlandırmışlar. Yəhudilər isə bu müharibəni qızışdırırdılar.Uca Allah Muhammədi (salləllahu aleyhi və səlləm) göndərdiyi və o, Mədinəyə hicrət etdiyi zaman Allah onları birləşdirmiş və onların arasında gedən müharibəyə son qoyulmuşdur.Müsəlmanlar bir-birinə qardaş olmuş və Peyğəmbərlə (salləllahu aleyhi və səlləm) birə sanki bir yumruğa çevrilmişlər.Uca Allah onlara bunu xatırladıb buyurur: "*Allahın sizə verdiyi nemətini xatırlayın ki, siz bir-birinizə düşmən ikən O sizin qəlblərinizi birləşdirdi və Onun neməti sayəsində bir-birinizlə qardaş oldunuz.*"[81] Allah sizin qəlblərinizi İslama isitmiş və aranızda olan müharibələri söndürmuşdur.Bunun nəticəsində sizin dünyanız səhmana salınmışdır.Digər qəbilələr həmçinin İslama girdikləri zaman onların dinləri səhmana düşdüyü üçün dünya işləri də səhmana düşmüşdür.Onlar öz qanları və mallarına arxayın olub yer üzündə əmin-amanlıqla dolaşmağa başlamışlar.Artıq bir qəbilədən olan ərəb digər qəbilədən olanla qarşılaşdığı zaman ona zərər yetirmirdi.Onların arasında sevgi hökm sürürdü.Çünki onlar Allahın dinində qardaşa çevrilmişlər.

[81] Ali İmran:103.

Uca Allah buyurur: *"Şübhəsiz ki, sənin firqə-firqə olub dinini parçalayanlarla heç bir əlaqən yoxdur."*[82] Bu, dinini bölüb firqə-firqə olanlardan uzaq olmağı ifadə edən ayədir. Çünki məqsəd dinin bir olması və insanların həmin din üzərində bir camaat olmalarıdır.Uca Allahın əmr etdiyi məhz budur.Məhz bu yolda olanların dostu Peyğəmbərdir (salləllahu aleyhi və salləm).Dinini bölüb çəkişmələr və cahiliyyat üzərə qalan şəxslərdən isə Peyğəmbər (salləllahu aleyhi və salləm) uzaqdır.

Bizə fiqhi məsələlərdə ixtilafın gerçəyini bilmək qalır. Fiqhi məsələlərdə günümüzəcən ixtilaf yer alır.Lakin sual yaranır: Bu zərərli ixtilafdırmı?

Biz deyirik: İxtilaf iki qismdir:

Birinci qism: Dində ixtilaf etmək. Məsələn: İbadət və əqidə məsələlərində ixtilaf etmək.Bu, pislənən və haram olan ixtilafdır.Çünki din ictihad sahəsi və görüşlər meydanı deyil. Din və əqidə "təuqifiy" olaraq gəlmişdir. Orada ictihad etməyin yeri yoxdur.Bizə vacib olan, şəxsi görüşləri və ictihadları daxil etmədən Allahın bizə din və əqidə olaraq buyurduğundan tutunmaqdır.Habelə ibadət "təuqifiy" olaraq gəlmişdir.Ona dair dəlil gəldiyi zaman biz əməl edirik.Ona dair dəlil olmadığı zaman isə bu, təkr edilməsi vacib olan bidət olur.Peyğəmbər (salləllahu aleyhi və salləm) demişdir: "Kim bizim işimizdən olmayan bir yenilik gətirərsə o, rədd

[82] əl-Ənam:159.

edilər"[83] Habelə demişdir: "İşlərin yeni olanından çəkinin! Çünki hər yenilik bidət, hər bidət zəlalət, hər zəlalət isə atəşdədir."[84] Əqidə, ibadət və din məsələləri ümumi şəkildə ixtilaf üçün meydan ola bilməz.Bu məsələlərdə yalnız Quran və sunnədən gələn nasslara və ümmətin sələfinin yoluna tabe olmaq gərəkdir.

İkinci qism: Görüşlər və rəylər üçün yaxud fəqhi məsələlər və dəlillərdən əhkamların çıxarılması kimi ictihad üçün meydan olan işlərdə ixtilaf etmək.Bu kimi məsələlərdə ixtilaf baş verir.Çünki nasslardan dəlillərin çıxarılması məsələsində insanların idrakı fərqlənir.İcma olunan məsələlər isə məhdud çərçivədədir.Bu səbəbdən həmin məsələlərdə ixtilaf etmək olmaz.Lakin ictihad üçün meydan olan ictihadi məsələlər kimi icmaya daxil olmayan şeylərə gəldikdə isə, Uca Allah hər bir alimə ona uyğun idrak və anlama tərzi və onu nasslara  çatdıran ağıl əta etmişdir.Bu şeylərdə ictihad etmək şəriətdə öz təsdiqini tapmışdır.Artıq məlum olduğu kimi Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində ictihad hasil olmuşdur.Bu, əqidə və dində deyil ictihadda olan ixtilaf olmuşdur.O, sadəcə fiqhi məsələlərdə ixtilaf olmuşdur. İnsanlar Peyğəmbərin (salləllahu aleyhi və səlləm) zamanında ictihad edib ixtilaf edirdilər.Bu ictihad iki qismdir:

Birinci qism: İxtilaf etmiş tərəflərdən birində aşkar olan dəlil.Belə olan halda dəlil olan sözü götürmək dəlilsiz sözü isə tərk etmək gərəkdir.Fəqihlərin görüşləri dəlilə ərz

---

[83] Buxari:2550.Muslim:1718.Əbu Davud:4606.İbn Macə:14.Əhməd:6/270.
[84] Muslum:867.Nəsai:1578.İbn Macə:45.Əhməd:3/311.Dərimi:206.

edilir.Dəlilə istinad edən sözləri götürmək və ona müxalif olanı tərk etmək vacib olur.Habelə doğru görüşə müvəffəq olmayan və dəlilə müxalif olan müctəhidin haqqı qəbul edib doğru olana qayıtması tələb olunur.Onun yanlış ictihad üzərində davam etməsi qəbul olunmazdır.Habelə bizim ona, etdiyi yanlış ictihadda tabe olmağımız icazəli deyil.İmamlar bunu bizə vəsiyyət edib demişlər: Bizim sözlərimizi Quran və sunnəyə ərz edin! İmam Əbu Hanifə (rahiməhullah) demişdir: "Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) hədis gələcəyi zaman onu başımın və gözümün üzərinə qoyacam. Habelə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əshabından hədis gələcəyi zaman onu başımın və gözüm üzərinə qoyacam. Tabiinlərdən hədis gəldiyi zaman isə bəllidir ki, bizdə kişilər onlarda kişilərdir." Bu, dörd imamdan ən qədim olan Əbu Hanifənin sözləridir.

İmam Malik (rahiməhullah) demişdir: "Hər birimiz rədd edir və rədd edilirik.Yalnız bu qəbirin sahibi istisnadır." Peyğəmbəri (salləllahu aleyhi və səlləm) qəsd edir.Habelə demişdir: "Məgər bir kişidən mübahisədə daha mahir olan kişi gəldiyi zaman bu şəxslərin mübahisəsi səbəbilə Cəbrayılın Muhamməddə gətirdiyini tərkmi etməliyik?!".Bu, imam Malikin sözləridir.

Habelə (rahiməhullah) demişdir: "Bu ümmətin axırı yalnız əvvəlinin düzəldiyi işlərlə düzələ bilər." Ümmətin əvvəlini düzəldən nə olmuşdur? Quran və sunnə.Bu, imam Malikin sözləridir.

İmam Şafii (rahiməhullah) demişdir: "Müsəlmanlar icma etmişlər ki, əgər bir şəxsə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsi bəlli olarsa onu hər hansı bir şəxsin sözündən ötrü tərk etməsi icazəli olmaz." Habelə (rahiməhullah) demişdir: "Mənim sözüm Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözünə müxalif gəldiyi zaman mənim sözümü çırpın divara!". Habelə demişdir: "Hədis səhih olacağı zaman o, mənim məzhəbim olacaq." Bu, imam Şafiinin sözləridir.[85]

İmam Əhməd (rahiməhullah) demişdir: "(Hədisin) isnadını və onun səhihliyini bilmiş insanların Sufyənın görüşünü seçmələri məni təəccübləndirir.Uca Allah buyurur: *"Onun əmrinə qarşı çıxanlar başlarına gələcək bir bəladan, yaxud düçar olacaqları şiddətli bir əzabdan həzər etsinlər!"* [86] Fitnənin nə olduğunu bilirsənmi? Fitnə şirkdir.Ola bilsin ki, insan onun (yəni, Peyğəmbərin) bəzi sözlərini rədd edəcəyi zaman həmin şəxsin qəlbinə əyrilik düşsün və nəticədə o, həlak olsun."

Bu, müctəhid imamların sözləridir.Onlar elm və ictihad səriştəliyinə malik olduqları halda ictihad edirdilər.Bununla belə özlərinin məsum olduqlarını iddia etməmişlər. Əksinə onlar dəlilə uyğun gələn sözlərini götürməyi vəsiyyət etmişlər.Bu səbəbdən, hənbəli məzhəbi üzərində olan şafii məzhəbi üzərində olan şəxsin dəlilə sahib olduğunu görəcəyi zaman həmin şafiinin sözlərini götürməsi vacib olacaq.Habelə şafii məzhəbi üzərində olan şəxs hənəfi

[85] Siyəru ə`ləmi-n-nubələ:10/34-35.
[86] ən-Nur:63.

məzhəbi üzərində olan şəxsin dəlilə sahib olduğunu görəcəyi zaman həmin şəxsin sözlərini götürməsi vacib olacaq.Habelə maliki məzhəbi üzərində olan şəxs hənbəli məzhəbi üzərində olan şəxsin dəlilə sahib olduğunu görəcəyi zaman həmin şəxsin sözlərini götürməsi vacib olacaq.Çünki əsas məqsəd dəlilə tabe olmaqdır.Məqsəd filankəsin sözlərini qəbul etmək deyil.Müsəlman, imamlara deyil yalnız dəlilə təəssübkeşlik etməlidir.Budur Şeyxul-İslam ibn Teymiyyə və imam ibnul-Qayyim, habelə imam Muhammədd bin Abdul-Vahhəb.Onların hamısı bunu əmr edib deyirdilər: Alimlərin sözlərinə baxın və dəlilə dayanan sözü götürün.Buna dair sözlər onların kitablarında məşhurdur.

Bu, Əhli sunnə val cəmaatın məzhəbidir.Orada təəssübkeşlik yoxdur.Lakin bu o demək deyil ki, biz məzhəblərdən imtina edib onu tərk etməliyik.Biz həmin məzhəblərdən və həmin imamların fiqhindən yararlanmalıyıq.Çünki bu, böyük sərvətdir.Lakin biz dəlilə tabe olmalıyıq.Əgər biri dəlilə sahib olarsa biz onun sözünü qəbul edəcəyik.Vacib olan budur.

Dəlili bilməyən isə elm əhlindən soruşur.Uca Allah buyurur: *“Bilmirsinizsə, zikr əhlindən soruşun!”*.[87] Çünki sən üzərində olan öhdəçiliyi yerinə yetirmək istəyirsən.Dəlili biləcəyin zaman dəlili götür.Lakin dəlili bilməyəcəyin zaman elm əhlindən soruş.Vacib olan budur.

[87] ən-Nəhl:43.

Fiqhi ictihadın ikinci qismi: Deyilən sözlərdən heç birində dəlilin üzə çıxmamasıdır.Bununla da, hər iki görüş mühtəməl olur.Bu məqamda, deyilən sözlərdən heç biri dəlil vasitəsilə üstün sayılmayana qədər ictihadi məsələlərdə irad tutulmayacaq.Bu səbəbdən, görüşlərdən biri götürüldüyü zaman irad tutulmur.Lakin insanın bunu təəssübkeşlik və nəfsi istəklər səbəbilə etməməsi şərtdir.Onun məqsədi yalnız haqqa yetişmək olmalıdır.Bu səbəbdən hənbəli şafii məzhəbində olana, şafii isə maliki məzhəbi üzərində olana irad tutmamalıdır.Dörd imam və onların davamçıları hər zaman qardaş olmuşlar.Onların arasında qarşılıqlı ədavət və nifrət yer almamışdır.Bu hallardan bəzisi olubsa da, bu, yalnız diqqətə layiq olmayan bəzi təəssübkeşlər tərəfindən olmuşdur.Lakin dörd məzhəbin əksər əshabı arasında, heç vaxt qarşılıqlı ədavət, təfriqəçilik və nifrət yer almamışdır. Onlar, üstün görüşü üzə çıxarmayan bir neçə ehtimal daşıyan bəzi ictihadi məsələlərdə ixtilaf etmələri ilə birgə bir-biri ilə evlənir, bir-birinin arxasında namaz qılır, bir-birinə salam verir və qardaşlıq edirdilər.Onlar məhz bu məqamda məşhur sözlərini demişlər: İctihadi məsələlərdə irad tutulmaz!”.

Bu səbəbdən, əgər bir məmləkətin insanları müxalif yaxud zidd sözü aşkar etməyən ictihadi görüşlərdən biri üzərində olub həmin fiqhi görüşlərdən biri ətrafında birləşərlərsə heç kimsəyə bu birliyi parçalamaq icazəli olmayacaq. Əksinə bu görüşə müvafiq gəlib ixtilafdan yan durmaq gərəkdir.

# Üçüncü məsələ

## Onlar əmr sahibinə müxalif olmağı fəzilət ona itaət edib tabe olmağı isə alçaqlıq və rəzillik hesab edirlər

“Onlar əmr sahibinə müxalif olmağı və ona tabeçiliyi tərk etməyi fəzilət, ona eşidib itaər etməyi isə alçaqlıq və rəzillik hesab edirdilər.Peyğəmbər (salləllahu aleyhi və səlləm) cahiliyyat əhlinə müxalif olub əmr sahiblərinə eşidib itaət etməyi və onlara nəsihət etməyi əmr etmiş və bu məsələdə təkid edib, bunu təkrar təkrar söyləmişdir.

Peyğəmbər (salləllahu aleyhi və səlləm) bu üç məsələni səhih hədisdə bir arada cəm edib demişdir: “Uca Allah sizin üçün üç şeyi bəyənmişdir: Ona ibadət edib Ona heç bir şeyi şərik qoşmamağınızı, Allahın ipindən hamılıqla möhkəm yapışmağınızı və Allahın sizin üzərinizə təyin etdiyi əmr sahiblərinə nəsihət etməyinizi!”.[88] İnsanların dünya və din işlərində baş vermiş xələl yalnız bu üç məsələdə yaxud onlardan bəzisində xələl olduğu səbəbilə baş vermişdir.”

---

## Şərh:

[88] Muslim:1715.Əhməd:2/367.Malik:1863.

Cahiliyyat məsələlərindən: Onlar əmr sahiblərinə itaət etmir və bunu alçaqlıq hesab edirlər.Onlar rəhbərə asiliyi fəzilət və azadlıq hesab edirlər.Bu səbəbdən, onlar bir imam və əmir ətrafında birləşmirlər.Çünki onlar lovğalıq və təşəxxüs üzündən itaət göstərmirlər.

İslam isə cahiliyyat əhlinə müxalif olub müsəlman rəhbərlərə eşidib itaət etməyi əmr etmişdir.Çünki bu işdə müsəlmanların mənafeyi vardır.Uca Allah buyurur: *"Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin!"*[89] Uca Allah burada əmr sahiblərinə itaət etməyi əmr edir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) bunun həddini bəyan edib bunun asilik olmayan işlərdə olduğunu qeyd etmişdir: "Yaradana asilikdə yaradılana itaət edilməz!".[90] Habelə demişdir: "İtaət yalnız yaxşı işlərdə olur."[91]

Bu səbəbdən, müsəlman Allahın yasaq etdiyi günahdan savayı işlərdə əmr sahibinə itaət etməlidir.O, günah işi əmr edəcəyi zaman isə ona itaət edilməməlidir.Lakin insan digər işlərdə ona müxalif olmamalıdır.O, sırf günah olan məsələdə ona itaət etməməlidir.Əmr sahibi müsəlman olacağı sürəcə insan bundan ötrü digər işlərdə beyətini pozmamalı və ona müxalif olmamalıdır.Çünki əmr sahibi dində dürüst olmayacağı, məsələn küfr dərəcəsinə çatmayacağı şərtilə fasiq olacağı halda belə ona itaət etməkdə həmrəylik, insanların

[89] ən-Nisə:59.
[90] Muslim:1840.Nəsai:4205.Əbu Davud:2625.Əhməd:1/131.
[91] Buxari:4085.Muslim:1840.Nəsai:4205.Əbu Davud:2625.Əhməd:1/94.

canlarının qorunması, əmin-amanlığın bərqərar olması, zülmə məruz qalanın ədalət görməsi, hüquqların sahiblərinə qaytarılması və insanlar arasında ədalətlə hökmün verilməsi kimi mənafelər öz yerini tapacaq.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Allahdan sizə verilən açıq-aydın dəlil əsasında onda aşkar küfr görməyincə ona eşidib itaət edin!”.[92] Onun günahları küfrdən aşağı olacağı sürəcə ona eşidib itaət etmək gərəkdir.Onun günahları isə özünə zərər verir.Lakin onun rəhbərliyi və ona olan itaət müsəlmanların mənafeyi üçündür.

Bu səbəbdən, bəzi imamlara deyilmişdir: Filankəs fasiq-dir lakin səriştəlidir.Filankəs isə salehdir lakin zəifdir. Onlardan rəhbərliyə hansı birisi daha yararlıdır? Demişdir: Səriştəli fasiq.Çünki onun günahı özünə səriştəsi isə müsəlmanlar üçündür.Saleh kişinin salehliyi özünədir zəifliyi isə müsəlmanlara zərər verir.

Bu səbəbdən, əgər rəhbər özünə zərər verən günahlar edərsə ona itaət edilməlidir.Hətta əgər o, haqsızlıq və zülm edərsə belə ona itaət edilməlidir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Malını alıb belini vursa belə ona itaət et!”.[93] Çünki ona itaət etməyin xeyiri onun yaramaz halında olan zərərdən daha üstündür.Çünki ona qarşı üsyan qaldırmağın zərəri, günahkar olduğu halda onun itaətində qalmaq zərərindən daha böyükdür.Çünki ona qarşı üsyan qaldır-

---

[92] Buxari:6647.Muslim:1709.Əhməd:5/314.
[93] Muslim:1847.Əbu Davud:4344.

maq qanların tökülməsi, əmin-amanlığını pozulması və həmrəyliyin sona çatmasına səbəb olur.

Tarixi nəzərdən keçirək.Əmirlərə və rəhbərlərə çıxanların aqibəti necə olmuşdur? Osmanın (r.a) dönəmində ədavət toxumunu səpən bəzi ünsürlər itaətdən çıxıb möminlərin əmiri Osmanı qətlə yetirdikləri zaman nə baş vermişdir? Möminlərin əmirinə qarşı üsyanın qaldırılması və onun qətlə yetirilməsi səbəbilə günümüzəcən möminlərin başına gələn uğursuzluqlara nəzər salaq.Müsəlmanlar hələ də aramsız uğursuluqlar və fəsadlardan əziyyət çəkməkdədirlər.Bu, həmçinin digər rəhbərlərə aiddir.Cüzi fəsad ona qarşı üsyan qaldırmaq fəsadından daha yüngül olduğu üçün ona itaət etməkdə səbr etmək lazımdır.Bu səbəbdən, Peyğəmbər (salləllahu aleyhi və səlləm), əmr sahibi fasiq və zalım olarsa belə İslamdan çıxmayacağı sürəcə ona itaət etməyi vacib etmişdir.İnsan daha böyük fəsadı dəf etmək üçün bu cüzi fəsadlara səbr edəcək.Daha böyüyünü aradan qaldırmaq üçün zərərlərin ən yüngülünü işlətmək dində bəlli bir üslubdur.Çünki imamlarına qarşı çıxan elə bir camaat olmamışdır ki, onların ona qarşı cıxma fəsadı ona itaət etməkdə səbr etmək fəsadından daha böyük olmasın.

Bu, əmr sahibləri məsələsində cahiliyyat əhli ilə İslam əhli arasında olan fərqdir.Cahiliyyat əhli əmr sahiblərinə itaət etməyi münasib görmürlər və bunu alçaqlıq hesab edirlər.İslam isə müsəlmanların əmr sahiblərinə itaət etməyi əmr edir.Onların öz nəfslərinə qarşı müəyyən günahları yaxud insanlara qarşı haqsızlığı olarsa belə insan buna səbr

etməlidir.Çünki bu işdə müsəlmanların mənafeyi vardır. Əmr sahiblərinə qarşı çıxmaqda müsəlmanlara toxunacaq zərərlər əmr sahiblərinin İslamdan çıxarmayan günahlar üzərində olmalarına rəğmən müsəlmanların onların itaətində qalmalarında olan zərərdən daha böyükdür.Bu, həmin böyük məsələyə dair İslamın gətirdiyi əzəmətli bir qaydadır.Cahiliyyat əhli isə qeyd edildiyi kimi başçılığı qəbul etmir və itaət etməyi məqbul saymırlar.Hal-hazırda azadlıq və demokratiya haqqında danışan kafir millətlər onlara bənzəyirlər.Onların hazırda olan cəmiyyətləri nədir? Yabanılıq, heyvanlıq, qətl, qarət, insanların namusuna təcavüz, şərr və əmin-amanlığın pozulması. Bu dövlətlərin, böyük ölkələr olub qırıcı silahlara sahib olmalarına rəğmən onların durumu, -Allah qorusun- heyvani bir durumdur. Çünki onlar cahiliyyat əhlinin yolunda qalmışlar.

Peyğəmbər (salləllahu aleyhi və səlləm) əmr sahiblərinə eşidib itaət etməyi əmr etmişdir.Habelə onlara gizli şəkildə nəsihət etməyi əmr etmişdir.Onlar haqqında mənfi sözlər demək, onları təhqir etmək və onların qeybətini etmək isə onlara xəyanət etmək anlamına gəlir.Çünki bu, insanları onlara qarşı qaldıran və şərr əhlini sevindirən bir amildir.Bu isə, əmr sahiblərinə olan xəyanətdir.Onlara dua etmək, onların ayıblarını məclislərdə qeyd etməmək isə onlara olan nəsihətdən sayılır.İmama nəsihət vermək istəyən şəxs nəsihətini birbaşa onun özünə çatdırır və bunu ya şifahi ya yazılı şəkildə edir yaxud da ki, imama onun sözlərini çatdıracaq şəxsə

bunu həvalə edir.İnsan bunu edə bilməyəcəyi zaman üzürlü hesab olunur.

Ancaq insanın müxtəlif yerlərdə yaxud minbərlərdə yaxud yazılı kasetlərdə əmr sahiblərini təhqir edib onu pisləməsi heç də nəsihət deyil.Bu, sadəcə əmr sahiblərinə olan xəyanətdir.Onlara olan nəsihət, onların düzəlməsi üçün onlara dua etməyi, onların ayıblarını ört-basdır etməyi və insanlar arasında bunu aşkar etməməyi şamil edir.Habelə onlara nəsihətdən: Əmr sahibləri tərəfindən vəzifəyə təyinat alan şəxslərin onlara həvalə olunan işləri yerinə yetirməsi və yerinə yetirdikləri işlərlə əmr sahiblərini tanış etməsi.Bu, əmr sahiblərinə olan nəsihətdən sayılır.

Daha sonra şeyx (rahiməhullah) demişdir: "Peyğəmbər (salləllahu aleyhi və səlləm) bu üç məsələni səhih hədisdə bir arada cəm edib demişdir: "Uca Allah sizin üçün üç şeyi bəyənmişdir: Ona ibadət edib Ona heç bir şeyi şərik qoşmamağınızı, Allahın ipindən hamılıqla möhkəm yapışmağınızı və Allahın sizin üzərinizə təyin etdiyi əmr sahiblərinə nəsihət etməyinizi!".[94] İnsanların dünya və din işlərində baş vermiş xələl yalnız bu üç məsələdə yaxud onlardan bəzisində xələl olduğu səbəbilə baş vermişdir."

Şeyx (rahiməhullah) deyir: Peyğəmbər (salləllahu aleyhi və səlləm) bu üç məsələni cəm etmişdir.Yəni, yuxarıda qeyd edilən üç məsələ.Bu məsələlər:

[94] Yuxarıda keçmişdir.

Birinci məsələ: Cahiliyyat əhli övliyalara və saleh insanlara ibadət edib deyirdilər: *"Bunlar bizim Allah qatında şəfaətçilərimizdir."*

İkinci məsələ: Cahiliyyat əhli din və dünya işlərində parçalanmışdılar.

Üçüncü məsələ: Onlar əmr sahiblərinə itaət etmir və bunu alçaqlıq və rəzillik hesab edirdilər.Qısa sözlərlə dolğun mənalar çatdırmaq üslubunu almış Peyğəmbər (salləllahu aleyhi və səlləm) bu üç məsələni növbəti hədisdə cəm etmişdir: "Uca Allah sizin üçün üç şeyi bəyənmişdir: Ona ibadət edib Ona heç bir şeyi şərik qoşmamağınızı, Allahın ipindən hamılıqla möhkəm yapışmağınızı və Allahın sizin üzərinizə təyin etdiyi əmr sahiblərinə nəsihət etməyinizi!".[95]

Birinci: Ona ibadət edib Ona heç bir şeyi şərik qoşmamağınız.Şirkə daxil olan məsələlərdən övliya və salehlərə ibadət etməkdir.

İkinci: Allahın ipindən hamılıqla möhkəm yapışmağınız və parçalanmamağınız.Bu, cahiliyyat əhlinin din və dünya işlərində firqə-firqə olmasına əks olan haldır.Allahın ipi isə Qurandır.Ondan yapımaq isə ondan tutunmağınız və sizə əmr olunanı edib sizə qadağan olunandan yan durmağınızdır.Çünki Quran qulların həm din həm də dünya işlərində olan mənafelərini qoruyan rəbbani bir yoldur. Ondan tutunmaq rəhmət, onu tərk etmək isə əzab və bədbəxtlikdir.

[95] Yuxarıda keçmişdir.

Allahın sizin üzərinizdə əmr sahibi etdiyi şəxslərə nəsihət etməyiniz.Bu, əmr sahibinə tabeçilik göstərməyən cahiliyyat əhlinin yoluna müxalif məsələdir.Çünki burada əmr sahibinə tabeçilik, ona nəsihət etmək və itaət etmək, habelə ona qarşı üsyan qaldırmamaq, insanların önündə onun haqqında mənfi danışmamaq və insanların arasında onun ayıbllarını qeyd edib yaymamaq əmri vardır.Çünki bu əmr sahibinə xəyanət sayılır.Bəzi insanlar bunun nəsihət növündən olduğunu iddia etsələr belə bu, heç də nəsihət deyil.Bu sadəcə ayıbların açılması, şərr və rəhbər ilə rəiyyət arasında ədavət toxumunu səpməkdir.Bu işdə heç bir mənfəət ola bilməz, əksinə bu işdə xalis zərər vardır.

Daha sonra şeyx (rahiməhullah) insanların din və dünya işlərində baş vermiş xələli və buna səbəbin bu üç işdə yaxud bəzisində xələlin olduğunu bəyan etmişdir.Allaha şərik qoşmaq, firqə-firqə olmaq və əmr sahibinə qarşı çıxmaq.

# Dördüncü məsələ

## Kor-koranə təqlid və onun zərərləri

"Onların dini müəyyən əsaslar üzərində qurulmuşdur: Onun ən böyüyü isə təqliddir.O, ilkindən tutmuş sonuncuya qədər bütün kafirlərin ən böyük qaydasıdır.Uca Allah buyurur: *"Biz səndən əvvəl hər hansı bir məmləkətə qorxudan bir peyğəmbər göndərdiksə, onun naz-nemət içində yaşayan böyükləri sadəcə olaraq: Biz atalarımızı bir din üzərində gördük və biz də onların ardınca getməkdəyik! -dedilər."*[96] Habelə buyurur: *"Onlara: Allahın nazil etdiyinə tabe olun!- deyildikdə, onlar: Xeyr, biz atalarımızın getdiyi yola tabe olacağıq! -deyə cavab verərlər. Bəs şeytan onları cəhənnəm odunun əzabına çağırırsa necə?"*[97] Habelə buyurur: *"De: Mən sizə ancaq bir öyüd verəcəyəm. Allah xatirinə iki-iki, bir-bir durun, sonra da bir dərindən düşünün, (görəcəksiniz ki) sizin yoldaşınızda heç bir divanəlik əsəri yoxdur."* [98] Habelə buyurur: *"Rəbbinizdən sizə nazil edilənə tabe olun. Allahı qoyub başqa dostlara uymayın .Siz öyüd-nəsihətə olduqca az qulaq asırsınız!"*[99]

---

## Şərh:

[96] əz-Zuxruf:23.
[97] Luqman:21.
[98] Səba:46.
[99] əl-Əraf:3.

Cahiliyyat məsələlərindən: Onlar öz dinlərini peyğəmbərlərin gətirdiyi din üzərində qurmurlar.Onlar dinlərini yalnız özlərinin ixtira etdikləri əsaslar üzərində qurur və bu yoldan kənara çıxmağı qəbul edilməz hesab edirlər.Bu işlərdən biri də: Təqliddir.Təqlidin mənası bənzəmədir.Yəni onlar təqlid olunan şəxs örnək tutulmağa layiq olmayacağı halda belə bir-birinə təqlid edirlər.Uca Allah buyurur: *“Biz səndən əvvəl hər hansı bir məmləkətə qorxudan bir peyğəmbər göndərdiksə, onun naz-nemət içində yaşayan böyükləri sadəcə olaraq: Biz atalarımızı bir din üzərində gördük və biz də onların ardınca getməkdəyik! -dedilər.”*[100]

Naz-nemət içində yaşayanlar: Əsasən rifah içində yaşayan zəngin insanlara deyilir.Çünki onlar şərr əhli olub haqqı qəbul etmirlər.Zəif və kasıblar isə fərqli olurlar.Çünki onlar əsasən təvəzökar və haqqı qəbul edən olurlar.Naz-nemət əhli isə nüfuz və mal-dövlət sahibləri olurlar. “*naz-nemət içində yaşayan böyükləri*”.Yəni, onların mal-mülk və nüfuz sahibləri dedilər: *“Biz atalarımızı bir din üzərində gördük”* Yəni, onları bir ümmət və din üzərə gördük və biz də onların dininə tabe oluruq.Yəni, biz -ey peyğəmbərlər!- sizə ehtiyac duymuruq! Onlar atalarının yolunun peyğəmbərlərə tabeçilikdən azad etdiyini iddia edirlər. Məhz bu, kor-koranə təqliddir.Bu əməl, cahiliyyat məsələlərindəndir.

Xeyir işlərdə təqlid etmək isə tabeçilik adlanır.Uca Allah Yusuf haqqında buyurur: *“Mən ata-babalarım İbrahim,*

[100] əz-Zuxruf:23.

*İshaq və Yəqubun dininə tabe oldum. Bizə heç bir şeyi Allaha şərik qoşmaq yaraşmaz."*[101]

Habelə Uca Allah buyurur: *"(İslamı) ilk əvvəl qəbul edib irəli düşən mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedən kimsələrə gəldikdə".*[102]

Məhz bu səbəbdən Uca Allah cahiliyyat əhli haqqında demişdir: *"Onlara: Allahın göndərdiyinə tabe olun! -deyildiyi zaman, onlar: Biz ancaq atalarımızın getdiyi yolla gedəcəyik! -deyirlər. Bəs ataları bir şey anlamayıb doğru yolda deyildilərsə necə?".*[103]

Anlamayan və doğru yolda olmayan şəxs digər insanlar üçün örnək ola bilməz. İnsanlar üçün yalnız ağıl sahibi və doğru yolda olan örnək ola bilər.Kor-koranə təqlid isə cahiliyyat işlərindəndir.Habelə bu təzahür, təəssübkeşlik adlanır.Çünki bizim üçün örnək, Allahın Peyğəmbəri (salləllahu aleyhi və səlləm) və ona tabe olanlardır.

Daha sonra şeyx (rahiməhullah) demişdir: Uca Allah buyurur: *"Onlara: Allahın nazil etdiyinə tabe olun!- deyildikdə, onlar: Xeyr, biz atalarımızın getdiyi yola tabe olacağıq! -deyə cavab verərlər. Bəs şeytan onları cəhənnəm odunun əzabına çağırırsa necə?"*[104]

---

101 Yusuf:38.

102 ət-Təubə:100.

103 əl-Bəqərə:170.

104 Luqman:21.

Müşrik və kafirlərə: "*Allahın göndərdiyinə tabe olun!*", yəni, Qurana tabe olun deyildiyi zaman: *"Onlara: Allahın nazil etdiyinə tabe olun!- deyildikdə, onlar: Xeyr, biz atalarımızın getdiyi yola tabe olacağıq! -deyə cavab verərlər. Bəs şeytan onları cəhənnəm odunun əzabına çağırırsa necə?"*[105] Yəni, həmin ataları: "*cəhənnəm odunun əzabına*"-çağırır. Ayənin mənası: Atalarınız şeytana tabe olsalar belə siz onlara tabe olursunuz.Onların son mənzili yanar oddur? Ağıllı insanın öz işində və təqlid etdiyi şəxsdə tədbirli olması gərəkdir.

Daha sonra şeyx (rahiməhullah) demişdir: Uca Allah onlara demişdir: *"De: Mən sizə ancaq bir öyüd verəcəyəm. Allah xatirinə iki-iki, bir-bir durun, sonra da bir dərindən düşünün, (görəcəksiniz ki) sizin yoldaşınızda heç bir divanəlik əsəri yoxdur."*[106] Habelə buyurur: *"Rəbbinizdən sizə nazil edilənə tabe olun. Allahı qoyub başqa dostlara uymayın .Siz öyüd-nəsihətə olduqca az qulaq asırsınız!"*[107]

Yəni, Allahın Peyğəmbəri (salləllahu aleyhi və səlləm) onlara bu ayəni gətirmişdir. Onlar isə deyirlər: Biz atalarımızın yolundan tutunur və bu kişiyə itaət etmirik.Muhamməd (salləllahu aleyhi və səlləm) qəsd edirlər.

Uca Allah buyurur: Bu kişinin dediyi sözlərə baxın və bu sözlər haqqında bir düşünün.Düşünün və təəssübkeşliyə qapanmayın. "*iki-iki, bir-bir durun*". Toplum halında və fərdi şəkildə durun və Muhammədin (salləllahu aleyhi və səlləm)

[105] Luqman:21.
[106] Səba:46.
[107] əl-Əraf:3.

sizi çağırdığına nəzər yetirin.Əgər onun çağırdığı haqq olarsa sizə ona tabe olmaq vacib olacaq və ata-babaların yolu üzərə qalmaq yolverilməz olacaq." *Allah xatirinə*".Yəni, nəfsi istəklər və təəssübkeşlik səbəbilə deyil haqqı axtararaq Allah üçün durmağınız lazımdır. "*İki-iki, bir-bir*": Yığışıb düşünmək və bundan ötrü məclislər təşkil etmək.Çünki məclisdə iştirak edənlərin yaxud bir toplum insanın qarşılıqlı köməyi nəticəsində haqqa çatmaq ümidi vardır. Habelə əgər insan təkliyə çəkilib düşünər və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi din haqqında fikirləşərsə onun haqq olduğu ona bəlli olar.Bu zaman ona tabe olmaq vacib olacaq. "*Sonra da bir dərindən düşünün.Sizin yoldaşınızda heç bir divanəlik əsəri yoxdur*". Yəni, dəli olduğunu dediyiniz Muhamməd (salləllahu aleyhi və səlləm) heç də dəli deyil.Əksinə o, kişilərin və bütün yaradılanların ən ağıllısı, insanlara ən çox nəsihət edən və ən bilikli birisidir.Sizin ona dəli deməyə necə diliniz gəlir? Düşünün! Onun ağlına bir baxın! Onun davranışına və hərəkətlərinə bir baxın.Məgər bu, dəlinin davranışıdır? *"Sizin yoldaşınızda heç bir divanəlik əsəri yoxdur. O yalnız qarşıdakı şiddətli əzabla sizi qorxudandır."*[108] Əgər siz ona iman gətirib tabe olmasanız çox şiddətli bir əzabla üzləşəcəksiniz.Artıq o, sizin yanınıza nəsihətçi olaraq, sizin üçün xeyir və qurtuluş, habelə dünya və axirət yaxşılığı və səadətini istəyərək gəlmişdir.Sizin ona bu cür vəsf verməyinizə necə diliniz gəlir? Siz onun gətirdi-

[108] Səba:46.

yi haqqında düşünmədən və fikirləşmədən onun dəli olduğunu deyirsiniz.

Ağıllı insanın mütləq insanların sözlərinə nəzər salması və həmin sözləri araşdırıb hansının yanlış hansının doğru olduğunu ayırd etməsi və haqqı qəbul edib yanlış olanı rədd etməsi gərəkdir.Kor-koranə təqlid insanı batil üzərə qalmağa sövq etməməlidir.

# Beşinci məsələ

## İnsanların istinad etdiklərinə baxmadan çoxluğu dəlil gətirmək

“Onların ən böyük qaydalarından: Çoxluqla qürrələnmələri və bir şeyin doğru olmasına bunu dəlil gətirmələridir. Habelə bir şeyin batil olmasına onun qərib olduğunu və ondan tutunanların az olduğunu dəlil gətirirlər.Uca Allah isə buna müxalif olan din gətirmiş və bunu Quranın bir neçə yerində izah etmişdir.”

---

## Şərh:

Cahiliyyat məsələlərindən: Onlar bir şeyin haqq olduğuna çoxluğu dəlil gətirir, bunun əksinə isə azlığı dəlil gətirirlər.Onlara görə haqq, əksər insanların tutunduğu yoldur.Habelə onlara görə nahaq az insanların tutunduğu yoldur.Bu, haqqı və batili bilmək üçün onların qoyduğu ölçüdür.Heç şübhəsiz ki, bu, yanlış fikirdir.Çünki Uca Allah buyurur: “*Əgər yer üzündə olanların çoxuna itaət etsən, onlar səni Allahın yolundan azdırarlar. Onlar ancaq zənnə uyar və ancaq yalan danışarlar!*”[109] Habelə buyurur: “*Lakin insanların əksəriyyəti bilməz!*”.[110]Habelə buyurur: “*Onların əksəriyyətində əhdə vəfa görmədik.Biz onların əksəriyyətini*

[109] əl-Ənam:116.
[110] əl-Əraf:187.

*fasiq kəslər gördük."*[111] Habelə digər dəlillər.Çoxluq və azlıq ölçü ola bilməz.Gerçək ölçü haqqdır. Əgər biri, tək-tənha olarsa belə haqq üzərə olacağı zaman doğru yolda olacaq. Məhz beləsinə tabeçilik etmək vacibdir. Çoxluq batil üzərində olacağı zaman insanın onu rədd etməsi və onunla qürrələnməməsi vacibdir.Bu səbəbdən alimlər demişlər: Haqq kişilər ilə tanınmır.Yalnız kişilər haqq ilə tanınır.Bu səbəbdən, əgər biri haqq üzərə olarsa məhz ona tabeçilik göstərmək vacib olacaq.

İzzət və Cəlal sahibi olan Allah ümmətlərin əhvalatlarını bizə çatdırdığı zaman haqq üzərə bəzən azlığın olduğunu xəbər vermişdir.Uca Allah buyurur: *"Əslində onunla birlikdə (tayfasından) çox az adam iman gətirmişdi."*[112] Ümmətlərin Peyğəmbərə (salləllahu aleyhi və səlləm) ərz edildiyi hədisdə gəlmişdir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) bir dəstə insanla gələn peyğəmbər, bir və iki kişi ilə gələn peyğəmbər, habelə yanında heç kəs olmadan gələn peyğəmbər görmüşdür.Əsas məqsəd, hər hansı bir məzhəb yaxud görüş üzərində davamçıların çoxluğunun olması deyil.Əsas məqsəd, onun haqq yaxud batil olmasıdır.Bu üzdən əgər bir yol, onu tutub gedənlər az olsalar yaxud həmin yolu heç kəs qəbul etməsə belə haqq olarsa ondan tutunmaq gərəkli olacaq. Çünki xilas yolu məhz ondadır.Batil bir yoldan tutunan insanların çoxluğu isə həmin batilə heç vaxt güc qata bilməz.Bu, müsəlmanın daimə gözü önündə tutmalı olduğu ölçüdür.

---

[111] əl-Əraf:102.
[112] Hud:40.

Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "İslam qərib başlamış və başladığı kimi də dönəcək."[113]

Bu, şərr, fitnələr və zəlalət çoxalacağı zaman baş verəcək. Haqq üzərə isə yalnız qərib insanlar qalacaq.Onlar cəmiyyətdə yabancı insanlara çevriləcəklər.Peyğəmbər (salləllahu aleyhi və səlləm) göndərildiyi zaman yer üzü bütövlüklə küfr və zəlalət içində çabalıyırdı.O, insanları Allaha çağırdığı zaman onlardan bir-iki kişi onun dəvətini qəbul etdi.Daha sonra onlar çoxaldılar. Bu dönəmdə bütün Qureyş qəbiləsi, bütün ərəb yarımadası və bütün yer üzü zəlalət içində olmuşdur. Peyğəmbər (salləllahu aleyhi və səlləm) tək-tənha insanları Allahın dininə çağırırdı.Ona tabe olan insanlar isə bütün dünya ilə nisbətdə çox az idilər.

Əsas, çoxluq deyil.Əsas doğru səmt və haqqa müvəffəq olmaqdır.Bəli, çoxluq doğru yol üzərə olacaqları zaman bu, çox gözəl olacaq.Lakin bilmək lazımdır ki, Uca Allahın qoyduğu bir qanun və bir sunnət çoxluğun batil üzərə olmasıdır: "*Sən təşnə olsan da, insanların əksəriyyəti iman gətirən deyildir!*"[114] "*Əgər yer üzündə olanların çoxuna itaət etsən, onlar səni Allahın yolundan azdırarlar.*"[115]

---

113 Muslim:146.

114 Yusuf:103.

115 əl-Ənam:116.

# Altıncı məsələ

## İnsanların istinad etdiklərinə baxmadan öncəkilərin yolunu dəlil gətirmək

**"Öncəkiləri dəlil gətirmək.Uca Allah buyurur: *"Bəs əvvəlki nəsillərin halı necədir?"*[116] Habelə buyurur: *"Biz bunu ulu babalarımızdan eşitməmişik."*[117]**

## Şərh:

Peyğəmbərlər onlara haqq ilə gəldikləri zaman onlar ata-babalarını dəlil gətirmişlər.Musa (aleyhi-s-sələm) fironu imana çağırdığı zaman firon öncəkilərin yolunu dəlil gətirmişdir: *"Bəs əvvəlki nəsillərin halı necədir?"*[118].O, burada ondan öncəki kafirlərdən olan nəsillərin yolunu dəlil gətirmək istəyir.Heç şübhəsiz ki, bu, batil dəlil və cəhalətdən doğan hüccətdir. Habelə Nuh öz tayfasını Allaha çağırdığı zaman onlar demişlər: *"Biz bunu ulu babalarımızdan eşitməmişik."*[119].Onlar Allahın Peyğəmbəri Nuhun çağırışı müqabilində ata-babalarının yolunu əsas gətirmiş və həmin yolun doğru Nuhun gətirdiyi dinin isə batil olduğunu iddia

---

[116] Tahə:51.
[117] Muminun:24.
[118] Tahə:51.
[119] Muminun:24.

etmişlər.Çünki onun gətirdiyi din onların ata-babalarının yoluna müxalifdir.

Qureyş kafirləri demişlər: *“Biz bunu sonuncu dində də eşitməmişik. Bu ancaq bir uydurmadır.”*[120] Yəni biz Muhammədin (salləllahu aleyhi və səlləm) gətirdiyini ata-babalarının dinində belə eşitməmişik.Bu sadəcə bir yalandır. Onlar Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyini yalan olaraq vəsf etmişlər.Nə üçün? Çünki bu onların ata-babalarının yoluna, bütlərə ibadət etməyə ziddir.Onlar öz babaları İbrahim və İsmailin dininə qayıtmayıb yaxın keçmişdə olan ata-babalarının tutunduğu yolu əsas gətirmişlər. Onlar Məkkədəki Qureyş kafirlərindən olan ata-babalarıdır.Bu, kafirlərin və cahiliyyat əhlinin yoludur. Onlar öncəki ümmətləri dəlil gətirirlər.

Haqqı batildən ayırd etmək üçün ağıl sahiblərinin peyğəmbərlərin gətirdiyi dinə nəzər salması və peyğəmbərlərin gətirdikləri dinlə onların ata-babalarının yolu arasında müqayisə aparması gərəkdir.İnsanın haqqa aparan qapını öz üzünə bağlayıb: Biz yalnız ata-babalarımızın yolunu qəbul edir və buna müxalif olan yolları rədd edirik,-deməsi, özlərini xilas etmək istəyənlər qalsın heç ağıl sahiblərinin davranışı ola bilməz.

Hal-hazırdı qəbirlərə sitayiş edənlərə onların bu əməli yasaq edildiyi zaman onlar deyirlər: Filan yerdə bunu edirlər və filan insanlar bunu edirlər.Öncəki nəsillər bu yol üzərə

---

[120] Sad:7.

olmuşlar.Habelə mövlüdlar keçirən şəxslərə bu əməllər yasaq edildiyi və bunun bidət olduğu deyildiyi zaman onlar deyirlər: Bu, bizdən öncə edilən bir əməldir.Əgər bu, batil olsaydı onlar bunu etməzdilər.

Bu, cahiliyyat əhlinin gətirdiyi dəlillərdir.Əsas, insanların tutduğu yol deyil.Əsas, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi yoldur. Çünki insanlar xəta və doğru işlər etməyə məhkumdurlar.Lakin Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi yolun doğru olması qəti bilinir.Bu səbəbdən, ona tabe olmaq vacibdir.Uca Allah bizi ata-babaların öhdəsinə buraxmamışdır.Əgər ata-babaların yolu yetərli olsaydı belə olan halda biz peyğəmbərlərə ehtiyac duymazdıq.

Həmçinin sufilər deyirlər: Bizim əhvallarımız Peyğəmbərə tabeçilik göstərməkdən bizi azad edir.Bizim öz əhvallarımız var və bizim Allah ilə rabitəmiz var.Biz Allahdan birbaşa alırıq.Əhli sunnə isə dinlərini ölülərdən alırlar.Bununla onlar hədisləri rəvayət edən kişiləri qəsd edirlər.Biz isə dinimizi ölməz və diri olandan alırıq.Onlar deyirlər: Peyğəmbərlərə yalnız avam insanlar ehtiyac duyurlar.Xüsusi insanlar isə peyğəmbərlərə lüzum görmürlər.Çünki onlar Allaha yetişmiş və bilgiyə yiyələnmişlər.Bu səbəbdən, onlar peyğəmbərlərə ehtiyac duymurlar.Şeytat məhz bu cür onlara təlqin edir.O, deyir: Təriqətlərin davamçıları peyğəmbərlərə ehtiyac duymurlar.Çünki onlar bir-başa Allahdan alırlar.Bu, cahiliyyat dinidir.Bu növdən olan hadisələr çoxdur.

# Yeddinci məsələ

## Güc-qüvvət sahiblərinin yolunun haqq olduğunu dəlil gətirmək

“Dərrakə və işlərdə, habelə mal-mülk və nüfuzda güc-qüvvətə yiyələnmiş insaları dəlil gətirmək.Uca Allah bunu növbəti sözlərlə rədd etmişdir: *“And olsun ki, Biz onlara verdiyimiz imkanı (var-dövləti, qüdrəti) sizə verməmişdik.”*[121] Habelə buyurur: *“Halbuki əvvəlcə kafirlərə qələbə çalmaq üçün yalvarırdılar. Bildikləri (peyğəmbər) gəldikdə isə, ona küfr etdilər.”*[122] Habelə buyurur: *“Onu öz oğullarını tanıdıqları kimi tanıyırlar.”*[123]

---

**Şərh:**

Cahiliyyat məsələlərindən: Onlar ad-san və zəka sahiblərindən olan qüvvətli insanların yolunu dəlil gətirib onun haqq olduğunu deyirlər.Bu, onlara görə haqqın bilinməsi üçün bir əsasdır.Onlar insanlara baxır və qüvvət, mal-dövlət, cah-cəlal və nüfuz sahiblərini gördükləri zaman onların yolunu haqq hesab edirlər.Zəif və yoxsul insanların yolunu isə batil hesab edirlər.Bu, cahiliyyat əhlinin durumudur.

---

[121] əl-Əhqaf:26.
[122] əl-Bəqərə:89.
[123] əl-Bəqərə:146.

Bu əsaslandırma batildir.Çünki Uca Allah öncəki kafir ümmətlərin güc-qüvvət sahibləri olduqlarını və onların çox-lu sərvətlərə sahib olduqlarını bir çox ayələrdə xəbər vermişdir.Onlar nüfuz sahibləri, habelə zəka və dərrakə sahibləri olmuş lakin bu onlara fayda verməmişdir.Çünki onlar batil üzərində olmuşlar.Artıq Uca Allah bunu bir çox ayədə xəbər vermişdir.Uca Allah buyurur: *“Ayələrimiz özlərinə açıq-aşkar oxunduğu zaman kafir olanlar iman gətirənlərdən: "Bu iki tayfadan hansının məqamı daha yaxşı, hansının məclisi daha gözəldir?” -deyə soruşarlar.”*[124] Uca Allah onların sözlərini rədd edərək buyurur: *“Halbuki Biz onlardan əvvəl neçə-neçə nəsilləri məhv etdik ki, onlar mal-dövlət və simaca (bu kafirlərdən) daha üstün (daha gözəl) idilər.”*[125] Habelə buyurur: *“Məgər onlar yer üzündə dolaşıb özlərindən əvvəlkilərin axırının necə olduğunu görmürlərmi? Halbuki onlar bunlardan daha qüvvətli idilər. Göylərdə və yerdə Allahı aciz edə biləcək heç bir şey yoxdur. Həqiqətən, O (hər şeyi) biləndir, (hər şeyə) qadirdir!”*[126] Habelə buyurur: *“Biz onlardan əvvəl özlərindən daha qüvvətli neçə-neçə nəsilləri məhv etdik.”*[127] Habelə buyurur: *“Məgər özlərindən əvvəl neçə-neçə nəsilləri məhv etdiyimizi görmədilərmi? Onlara yer üzündə sizə vermədiyimiz imkanlar vermişdik.Göydən onlara bol yağış göndərmiş, altından çaylar axıtmışdıq. Biz onları günahlarına görə məhv etdik və onlardan sonra başqa yeni bir nəsil yaratdıq.”*[128]

Bu və bu kimi ayələr, insanlar zəlalət üzərə olacaqları zaman önəmli olanın qüvvət və mal-mülk olmayacağına

[124] Məryəm:73.
[125] Məryəm:74.
[126] Fatir:44.
[127] Qaf:36.
[128] əl-Ənam:6.

dəlalət edir.Çünki bu qüvvət, mal-dövlət və bu sərvətlər onlara fayda verməyəcək.

Uca Allah kafirləri tədriclə əzaba düçar etmək üçün onlara Öz nemətlərini verdiyini bəyan etmişdir.Uca Allah buyurur: *“(Kafirlər) edilmiş xəbərdarlığı unutduqları zaman (küfrlərini daha da artırmaq məqsədilə) hər şeyin qapılarını onların üzünə açdıq. (Kafirlər) özlərinə verilən nemətlərə sevindikləri vaxt onları qəflətən yaxaladıq və onlar (hər şeydən) məhrum oldular.Artıq o zalım tayfanın kökü kəsildi. Həmd olsun aləmlərin Rəbbi Allaha!”*[129] Habelə buyurur: *“Artıq bu kəlamı yalan sayanları Mənə tapşır. Biz onları özləri də bilmədən tədriclə əzaba giriftar edərik. Onlara (daha çox günaha batmaq üçün bir müddət) möhlət verərəm.”*[130] Habelə buyurur: *“Küfr edənlər onlara verdiyimiz möhləti heç də özləri üçün xeyirli sanmasınlar! Bizim onlara verdiyimiz möhlət ancaq günahlarını daha da artırmaları üçündür. Onlar alçaldıcı bir əzab görəcəklər!”.*[131]

Uca Allah, zamanımızdaki kafirlərə verdiyi kimi bu sərvətləri onlara verir, onları yer üzündə yerləşdirir, onlara mal-mülk və hökmüranlıq verir və onlara müxlətif ixtiralar və məharətlər əta edir.Ancaq bu onların yolunun haqq olduğuna, habelə Allahın onlara verdiyi nemətlərdən ötrü onlardan razı qaldığına dəlalət etmir.Uca Allah, həmin şəxs-lərin günahları artsın deyə onlara möhlət verir və onları

[129] əl-Ənam:44-45.
[130] Qələm:44-45.
[131] Ali İmran:178.

tədriclə əzaba aparır.Bu kimi amilləri isə yalnız cahiliyyat əhli dəlil gətirir.Elm və bəsirət sahibləri isə ümmətlərin getdikləri yolu nəzərdən keçirir.Elm və bəsirət əhli, bir yolun yolçuları yoxsul insanlar olsalar belə, həmin yol haqq olacağı zaman onu qəbul edir, habelə bir yolun yolçuları zənginlər olsalar belə həmin yol batil olacağı zaman onu rədd edirlər.

Buna dair ayələr çoxdur.Onlardan bəzisini şeyx burada qeyd etmişdir.Həmin ayələrdən birində, Uca Allah Ad tayfasını məhv etdiyini xəbər verdiyi zaman buyurur: *“And olsun ki, Biz onlara verdiyimiz imkanı (var-dövləti, qüdrəti) sizə verməmişdik.”*[132] *“Məgər görmədinmi ki, Rəbbin nələr etdi Ada?! Sütunlar sahibi İrəmə?!”.*[133] Yəni, İrəm qəbiləsi yaxud məskunlaşdıqları bölgə İrəm adlanmışdır. *“Sütunlar sahibi İrəmə?! Məmləkətlər (əhli) arasında onun kimisi yaradılmamışdı.Vadidə qayaları oyan?!”.*[134] Onlar dağları oyub orada müxtəlif naxışlar düzəldir və oranı özləri üçün məskənlər edirdilər. Bu yerlər, günümüzəcən qalmışdır. Həmin yerlər, karvanların Şama gedən yolunda yerləşir. *“Bu onların özlərindən sonra yalnız az bir hissəsi məskun olan (bomboş, xaraba qalmış) yurdlarıdır. Onlara Biz varis olduq.”* [135] *“Bu, zülmləri üzündən onların bomboş (viran) qalmış evləridir.”*[136]

Həmin insanlar kafir olduqları halda Uca Allah onlara çox böyük güc-qüvvət əta etmişdir.Onların yanına peyğəm-

---

[132] əl-Əhqaf:26.
[133] əl-Fəcr:6-8.
[134] əl-Fəcr:7-9.
[135] əl-Qasas:58.
[136] ən-Nəml:52.

bərlər gəldiyi zaman isə onlar sahib olduqları güc-qüvvət, sərvət və cəh-cəlal ilə qürrələnmiş və peyğəmbərlərə qarşı təkəbbürlük edərək şirkləri üzərində qalıb haqqı qəbul etməmişlər.Hətta Uca Allah Ad tayfasının sahib olduqları güc-qüvvətlə qürrələndiklərini xəbər verib buyurur: *“Ad qövmünə gəlincə, onlar yer üzündə nahaq yerə təkəbbür göstərib dedilər: “Bizdən daha qüvvətli kim ola bilər?!” Məgər onlar düşünmədilərmi ki, özlərini yaratmış olan Allah onlardan daha qüvvətlidir?!”.*[137]

Ağılı dəlil gətirmək.Uca Allah İsrail oğullarına, yəhudilərə dərrakə və elm əta etmişdir.Onlar sahib olduqları Tövrat və İncil vasitəsilə axır zamanda göndəriləcək Peyğəmbərin (salləllahu aleyhi və səlləm) vəsfini, göndəriləcək Peyğəmbərin peyğəmbərlərin sonuncusu olduğunu və onun hansı vəsflərə malik olduğunu bilirdilər.Yəhudilərlə Mədinədə yaşayan Əus və Xəzrəc qəbilələri arasında müharibələr olurdu. *“Öncələr kafirlərə qələbə çalmaq üçün yalvarırdılar.”*[138] Onlar deyirdilər: Axır zamanlarda bir peyğəmbər göndəriləcək və biz ona tabe olub onunla birgə sizi qıracağıq. *“Bildikləri (Peyğəmbər) gəldikdə isə, ona küfr etdilər.”* Yəni, Muhamməd (salləllahu aleyhi və səlləm) gəldiyi zaman İsrail oğulları ona həsəd etdilər.Çünki onlar nübuvvətin İsrail oğullarından olduğunu istəyir və bunu özləri üçün saxlayırdılar.Ancaq nübuvvət İsmail oğullarında olduğu zaman onlar Allahın Elçisini tanıdıqları halda ona

[137] Fussilət:15.
[138] əl-Bəqərə:89.

(salləllahu aleyhi və səlləm) həsəd etdilər.Onların bilgisi və dərrakəsi onlara heç bir fayda vermədi.

Heç də haqqı bilən hər bir kəs ona əməl etmir.Bəzən insanın əməl etməsinə həsəd yaxud təkəbbürlük yaxud dünya tamahı yaxud öndə getmək tamahı kimi amillər əngəl olur. İnsanı, haqqı bildiyi halda ondan uzaqlaşdıran amillər mövcuddur.

Hidayət və müvəffəqiyyət Uca Allahdandır.Bu bilik, elm və anlama tərzi ilə bir-başa bağlı deyil.Əslində məsələ Uca Allaha qayıdır.Bu səbədən Peyğəmbər (salləllahu aleyhi və səlləm) növbəti sözləri təkrar-təkrar deyərdi: "Ey qəlbləri çevirən və gözləri çevirən! Mənim qəlbimi dinin üzərində sabit elə!".[139] Adicə bilik, elm, anlayış və dərrakə kimi səbəblər gözəl səbəblərdir.Lakin bu, kifayət etmir.Bu isə, mömini ehtiyatlı olmağa və elmi və dərrakəsi ilə qürrələnməməyə sövq edir. İnsan daimə Rəbbindən haqq, hidayət və doğru səmt üzərə sabit-qədəm olmağı diləməlidir.Habelə onun güc-qüvvəti ilə öyünməməsi gərəkdir.Bəzən deyilir: Filan dövlət güclü dövlətdir və ona heç kəs qalib gələ bilməz.Çünki o, müxtəlif imkanlar, qırıcı və nüvə silahları ilə möhkəmlənmiş qüvvətli bir dövlətdir.Uca Allah buyurur: *"Allah sizə bir çox yerlərdə, həmçinin Hüneyn günündə kömək etdi. O gün çox olmağınız xoşunuza gəlsə də, bir faydası olmadı, gen dünya sizə dar oldu, sonra dönüb qaçdınız."*[140]

---

[139] Tirmizi:2140.İbn Macə:3834.
[140] ət-Təubə:25.

Bu, bir çox insanın qafil olduğu çox əzəmətli məsələdir. İnsan güc-qüvvət, sərvət, nüfuz və cəh-cəlalı dəlil gətirir. Onlar deyirlər: Bu, inkişaf etmiş millətdir və bu, həmin ümmətin haqq üzərində olduğuna dəlalət edir.Onlar bu səviyyəyə yalnız haqq üzərə olduqları səbəbilə çatıblar. Çünki onlarda siviizasiya, onlarda mədəniyyət vardır.Bəzi aldanmış insanlar onların küfr üzərində olmalarına baxmadan məhz bu cür sözlər deyirlər.

İnsan müsəlmanların maddi və istehsalat baxımından zəif olduqları səbəbilə onların haqq üzərə olmadıqlarını düşünür.Əslində həmin şəxs bunun onların dinində olan qüsur səbəbilə deyil məhz müsəlmanların özlərinin səhlənkarlığı səbəbilə olduğunu bilmir.

# Səkkizinci məsələ

## Zəiflərin yolunun haqq olmadığını dəlil gətirmək

“Bir yolun batil olmasına, ona yalnız zəiflərin tabe olduğunu dəlil gətirmək.Uca Allah buyurur: *“Onlar: “Sənə ən rəzil adamlar tabe olmuşkən, biz sənə imanmı gətirəcəyik?” - dedilər.”*[141] Habelə buyurur: *“Əcəba, Allahın aramızda lütfünü rəva gördüyü kəslər bunlarmıdır?”.*[142] Uca Allah onların dediyini rədd edərək demişdir: *“Məgər Allah şükür edənləri daha yaxşı tanıyan deyildirmi?”.*[143]

---

## Şərh:

Bu məsələ öncəki məsələnin əksidir.Güc-qüvvətli insanların tutduğu yolun haqq olduğunu dəlil gətirmək.Bu məsələdə isə bir yolun yolçularının zəiflər olduğu səbəbilə onun haqq olmadığını dəlil gətirməkdir.Əgər həmin yol haqq olsaydı onlar zəif olmazdılar.Bu, haqqı batildən ayırmaq üçün cahiliyyat əhlinin ölçüsüdür.Onlar qüvvət və zəifliyin Uca Allahın əlində olduğunu və bəzən zəif insanın zəif olduğu halda haqq üzərində, qüvvətlinin isə batil

[141] əş-Şuəra:111.
[142] əl-Ənam:53.
[143] əl-Ənam:53.

üzərində olacağını bilmirlər.Bu, Nuhun tayfasının məntiqidir.Belə ki, Nuh onları Allaha çağırdığı zaman *“Onlar: “Sənə ən rəzil adamlar tabe olmuşkən, biz sənə imanmı gətirəcəyik?” -dedilər.”*[144] Yəni, bizdən olan zəiflər.Əgər sən haqq üzərində olsaydın sənə güc-qüvvət sahibləri tabe olardılar.Digər ayədə gəlmişdir: *“Biz səni ancaq özümüz kimi (adi) bir insan sayır, elə ilk baxışda yalnız içimizdəki səfillərin sənə uyduğunu görürük.”*[145] Yəni, heç bir söz sahibi olmayanlar düşüncəsiz və təfəkkürsüz sənə tabe olmuşlar.

Habelə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində olan müşriklər zəif mömінləri məsxərəyə qoyurdular. Onlar Bilal, Salman, Ammar bin Yəsir və onun atası və anası kimi zəif mömінləri məsxərəyə qoyurdular.Hətta onlar demişlər: Bunlar sənin ətrafında olduqları halda biz səninlə birgə bir məclisdə oturmarıq.Bizim bir-birimizlə orta məxrəcə gəlmə-yimiz üçün sən gəl bizə başqa bir məclis təşkil et.Peyğəmbər (salləllahu aleyhi və səlləm) onların doğru yola gəlmələrinə istəkli olduğu səbəbilə onlar üçün ayrıca bir məclis təşkil etmək istəyinə düşdü.Uca Allah isə Peyğəmbərə irad tutaraq demişdir: *“Rəbbinin rizasını diləyərək səhər-axşam Ona dua edənləri yanından qovma. Onların (kafirlərin) əməllərinin sənə, sənin əməllərinin isə onlara heç bir dəxli yoxdur.Onları qovarsan, zalımlardan olarsan.Beləliklə, onları (insanları)*

[144] əş-Şuəra:111.
[145] Hud:27.

***bir-birilə imtahana çəkdik ki, onlar desinlər:*** ***“Əcəba, Allahın aramızda lütfünü rəva gördüyü kəslər bunlarmıdır?”***[146]

**Uca Allah buyurur:** *“Əcəba, Allahın aramızda lütfünü rəva gördüyü kəslər bunlarmıdır?”.*[147]**.Bunlar, yəni zəif** **səhabələr.** Onların xeyirdə **bizdən öndə** olmaları mümkün **deyil.** *“Əgər yaxşı bir şey olsaydı, onlar bu işdə bizdən qabağa düşə bilməzdilər.”*[148] **Hal-**hazırda alimlə**rin heç bir rəy və** düşüncə sahibi olmadıqlarını, dar düşüncəli olduqlarını, **gerçəkdən xəbərsiz** olduqlarını, sərt olduqlarını v.s sözlə**r** deyib onları bu cür vəs**f edənlər onlara bənzəyirlər.**

Şeyx bu məsələləri tarix üçün yazmamışdır.O, yalnız insanlar bu işlə**rdən çəkinsinlər deyə həmin risaləni** yazmışdır.Çünki bu işlər, cahiliyyat işlə**rindəndir.**

---

[146] əl-Ənam:52-53.

[147] əl-Ənam:53.

[148] əl-Əhqaf:11.

# Doqquzuncu məsələ

## Fasiq alimləri və cahil abidləri özlərinə örnək tutmaları

"Fasiq alimləri və cahil abidləri özlərinə örnək tutmaları. Uca Allah buyurur: *"Ey iman gətirənlər! alimlərdən və rahiblərdən çoxu insanların mallarını haqsızlıqla yeyir və (onları) Allah yolundan döndərirlər."*[149] Habelə buyurur: *"Dininizdə haqsız yerə ifrata varmayın. Əvvəlcə yolunu azmış, bir çoxlarını da azdırmış və doğru yoldan çıxmış bir tayfanın nəfsinin istəklərinə uymayın!".*[150]

## Şərh:

Cahiliyyat məsələlərindən: Fasiq alimləri dəlil gətirmək. Fasiq: Elmi və əməlində Allahın itaətindən çıxmışa deyilir. Fasiq alimlər: Elmlərinə əməl etməyənlər yaxud bildikləri halda Allahın adından yalan danışanlardır.Onlar özlərinin yalançı olduqlarını bildikləri halda alimlər adı altında öz şəxsi istəklərinə çatmaq və nəfsi istəklərinə tabe olmaqdan ötrü filan şey halaldır filan şey haramdır deyirlər.İnsanlar isə onlara etibar edirlər.Cahil abidlər isə elmsiz əməl edən-

[149] ət-Təubə:34.
[150] əl-Maidə:77.

lərdir.İnsanlar onlara etibar edib: Bunlar saleh kimsələrdir,- deyirlər.

Alim və abidlər Allahın dinində doğru səmt üzərə olmayınca heç kəsin alim və abidlə qürrələnməsi doğru deyil.Uca Allah yəhudi və nəsranilər haqqında buyurur: *“Ey iman gətirənlər! alimlərdən və rahiblərdən çoxu insanların mallarını haqsızlıqla yeyir və (onları) Allah yolundan döndərirlər.”*[151] *“Onlar Allahı qoyub alimlərini və rahiblərini özlərinə ilahlar qəbul etdilər.”*[152] Çünki həmin insanlar onlara haramı halal etdilər onlar isə bu işdə onlara itaət etdilər.Habelə halalı haram etdilər onlar da bu işdə onlara itaət etdilər.Bununla da, həmin şəxslər Allahdan başqa rəbblərə çevrilmişlər.Çünki halal və haram etmə Uca Allahın haqqıdır.Hçe kəsin, insanları razı salıb onların rəğbətini qazanmaq üçün öz nəfsi istəklərinə uyğun yaxud məqsədlərinə uyğun bir şeyi haram etməyə yaxud halal etməyə ixtiyarı yoxdur.Hal-hazırda bəzi şəxslər şəriətə düzəlişlər verirlər.Onlar insanların rəğbətini qazanmaq və onları razı salmaq üçün haramları halal edirlər.Onlar müxtəlif hiylələrə əl atır müxtəlif rüxsətlər axtarırlar.Onlar Allahın adından yalan danışıb müəyyən şəxslərin mənafeyini güdmələri səbəbilə Allahın filan şeyi halal yaxud filan şeyi haram etdiyini deyirlər.

Bunlar fasiq alimlərdir.Fasiq isə Allahın itaətindən çıxandır.Uca Allah buyurur: *“Ey iman gətirənlər! alimlərdən*

---

[151] ət-Təubə:34.
[152] ət-Təubə:31.

*və rahiblərdən çoxu”*.Bu, mömінlərin həzər etmələri üçün bir nidadır.Ayədə gələn “الأحبار: əhbar” sözu alimləri şamil edir.Bu söz əsasən yəhudilərin alimlərinə deyilir.Rəhbanilər isə abidlərdir.Bu isə əsasən nəsranilərin abidlərinə şamil edilir.Rəhbanilik nəsranilərdə, elm isə yəhudilərdədir. Lakin yəhudilər qəzəbə düçar olmuş, nəsranilər isə azmışlar. Uca Allah bizə namazın hər rükətində növbəti sözləri deməyi əmr etmişdir: *“Bizi doğru yola yönəlt! Nemət verdiyin kəslərin yoluna!”*. Onlar elm və əməl sahibləridir. “*Qəzəbə düçar olmuşların”.* Onlar əməlsiz elm sahibləridir. Onlar fasiq alimlərdir. “*Və azmışların (yoluna) yox!”*[153] Onlar dəlilsiz və sübutsuz Allaha ibadət edən nəsrani və digərlərindən olan rəhbanilərdir.Onlar yalnız bidətlər, yeniliklər və xurafatlarla Allaha ibadət edirlər.Allah bizə fasiq alimlərə və azmış abidlərə uymağı qadağan etmiş və bizə haqqı Quran və sunnədən olan dəlil əsasında götürməyi əmr etmişdir.

Hal-hazırda bir şəxsin hər hansı bir istəyi olduğu zaman: Filankəs buna fətva verib,-deyir və həmin sözün Quran və sunnəyə uyğun gəlib gəlmədiyinə ümumiyyətlə baxmır. Sən ona: Bu fətva yanlışdır,-dediyin zaman o, belə deyir: Mənlik deyil! Filankəs belə bir fətva verib vəssalam.

Lakin fətva onun nəfsi istəklərinə uyğun gəlmədiyi zaman deyir: Bu fətva doğru deyil yaxud çox sərtdir.Həmin şəxslər uydurma sözləri və alimlərin xətalarını bir yerə toplayıb onu bir kitabda edir və bunu, iddia etdikləri kimi

[153] əl-Fatihə:6-7.

insanlara genişlik olsun deyə onların ixtiyarına buraxırlar. Onlar deyirlər: İslam dini rahatlıq dinidir, insanları çətin vəziyyətə salmır. Onlara: Bunu Quran və sunnəyə ərz edin!- deyildiyi zaman onlar deyirlər: Bu, alimlərin sözləridir! Məgər alim Quran və sunnədən daha böyükdür ki, onun sözü Quran və sunnəyə ərz edilmir?!

Bunu yalnız nəfsi istəklərinə uymuş tayfa edir.Onlar *"Onlar Allahı qoyub alimlərini və rahiblərini özlərinə ilahlar qəbul etdilər."*[154] Onlara Peyğəmbərin çəkindirdiyi bidət yasaq edildiyi zaman onlar deyirlər: Filankəs bunu edir.O isə, alim yaxud saleh birisidir.Habelə filan ölkənin camaatı bunu edirlər.Onlar isə ibadət və təqva sahibləridir. Biz deyirik: Saleh olmaq və təqva kifayət etmir.Mütləq bunun Quran və sunnəyə müvafiq olması gərəkdir.

Alimlər və abdilərin sözlərini Quran və sunnəyə ərz etmədən götürmək cahiliyyat əhlinin üslubudur.Onlar öz alimləri və abidlərini Allahdan başqa rəbblər etmişlər.

[154] ət-Təubə:31.

# Onuncu məsələ

## Onlar din əhlini anlayış və düşüncədən məhrum olmaqda ittiham edirlər

"Dinin batil olması üçün həmin dinin əhlinin anlayış və düşüncə qıtlığından əziyyət çəkmələrini dəlil gətirmək. Uca Allah buyurur: *"Düşüncəsiz olan ən rəzil adamlarım sənə qoşulduğunu görürük."*[155]

---

Şərh:

Uca Allah Nuhun tayfasının belə dediklərini xəbər vermişdir: *"Düşüncəsiz olan ən rəzil adamlarım sənə qoşulduğunu görürük."*[156]. Yəni, zəiflər. *"düşüncəsiz"*, yəni heç bir anlayışa malik olmayan kəslər.Onlar peyğəmbərlərin davamçılarını yamanlayır və onların anlayışsız və işlərdə tədbirsiz olduqlarını, habelə uzaqgörən olmadıqlarını deyirlər.

Bu, günümüzdə bir çox fasiqlər və Allahın düşmənlərinin öyündüyü məsələdir.Onlar müsəlmanları və müsəlmanların alimlərini ələ salırlar və onların dar düşüncəli və anlayışsız olduqlarını deyirlər.Müsəlmanların alimləri elm, bəsirət və bilik əhli olmalarına rəğmən onlar bu cür iftira ilə

[155] Hud:27.
[156] Hud:27.

onları kiçildirlər.Çünki müsəlmanların alimləri Allahın nuru ilə hər bir şeyə baxıb Allahın əmri ilə əmr edir, Allahın qadağan etdiyindən qadağan edirlər.

Heç şübhəsiz ki, əməl sahibləri olan alimlər peyğəmbərlərdən sonra ən fəzilətli insanlardır.Alimin abiddən olan üstünlüyü ayın digər ulduzlardan olan üstünlüyü mislindədir.Bu səbəbdən, insanların qəlbində alimlərə qarşı nifrət oyatmaq üçün alimlərin şənini yalnız cahiliyyat əhlinə və peyğəmbərlərin davamçılarını bu cür vəsf edən Nuhun tayfasına bənzəyən şəxslər kiçildib onları dardüşüncəlik və anlayışdan məhrum olmaqda ittiham edirlər.Günümüzdə bəzi insanların dillərində bu kimi sözlər gəzir.Onlar deyirlər: Bu alimlər, heyz və nifas alimləridir.Onlar ayaq yolundan təmizlənmək haqqında əhkamların alimləridir.Onlar ikinci dərəcəli şeylərin alimləridir.Onlar gerçək durumu anlamırlar.Onlara görə gerçək durum siyasi işlər və rəhbərlərə qarşı inqilablar hazırlamaqdır.

# On birinci və on ikinci məsələlər

## Onlar yaramaz qiyasa etimad edib doğru qiyası rədd edirlər

"Yaramaz qiyası dəlil gətirmək.Uca Allah onların belə dediklərini xəbər verir: *"Siz də bizim kimi adi bir insansınız."*[157]

Habelə doğru qiyası rədd etmək:

Bunu və bundan öncəkini cəm edən səbəb: Cəm edən və ayıran amili anlamamaq."

**Şərh:**

On birinci və on ikinci məsələ: Onların yaramaz qiyasa etimad edib doğru qiyası rədd etmələridir.

Üsul alimlərinə görə qiyas iki növ olur:

**Birinci növ**: İllət qiyası.İllət qiyası: Aralarında birləşdirici amil olduğu səbəbilə şaxənin hökmdə özəyə əlavə edilməsi. Əgər onun şərtlərindən biri pozularsa qiyas yararsız olacaq və hər hansı bir hökmün isbatında ona etimad göstərilməyəcək.Bu, önəmli məsələdir.İbnul-Qayyim deyir: Əksər insanların azmasına başlıca səbəb yararsız

157 İbrahim:10.

qiyasdır.Yararsız qiyası ilk istifadə edən iblis olmuşdur.Uca Allah ona Adəmə səcdə etməyi əmr etdiyi zaman: *“Mən ondan daha xeyirliyəm, çünki Sən məni oddan, onu isə palçıqdan yaratdın! -dedi.“*[158] İblis odun palçıqdan daha xeyirli olduğunu iddia etmişdir.Belə olan halda o, Adəmdən daha xeyirlidir.Bu isə, batil qiyasdır.Çünki od palçıqdan xeyirli deyil.Əksinə palçıq (gil) oddan daha xeyirlidir.Çünki od hər şeyi yandırıb tələf edir.Gil isə müxtəlif şeylər və bitkilər bitirir.Habelə insanlar üçün onda xeyir vardır.Əgər biz bu cür müqayisə etsəydik palçıqın oddan daha xeyirli olduğunu deyərdik.Ancaq burada əsas tutulan qiyas deyil.Əsas olan Uca Allahın seçimi və üstünlüyünə etimad etməkdir. Çünki Uca Allah istədiyini edir və seçir.Onun hökmünə etiraz edilməz.O, sonsuz hikmət sahibidir.

Habelə müşriklər peyğəmbərləri təkzib etdikləri zaman bu cür qiyasa əl atmışlar.Onlar demişlər: *“Siz də bizim kimi adi bir insansınız.”*[159] Müşriklər peyğəmbərlərin risalətinin doğru olmadığına onların bəşər övladı olduğunu dəlil gətirmişlər.Çünki onların iddiasına görə risalətin insana verilməsi doğru deyil.Bu isə, batil qiyasdır.Çünki bu təfavüt ilə olan qiyasdır.Çünki Uca Allah peyğəmbərləri digərlərindən üstün etmiş və onları digərlərinin içərisindən seçib çıxarmışdır.Uca Allah onların halını və risalət üçün yararlı olmalarını daha yaxşı bilir. *“Allah mələklərdən də elçilər seçər, insanlardan da. Həqiqətən O, Eşidəndir, Görəndir! (Allah) onların önlərindəkini də, arxalarındakını da bilir.”*[160]

---

[158] əl-Əraf:12.
[159] İbrahim:10.
[160] əl-Həcc:75-76.

Onlar peyğəmbərlərə demişlər: *"Siz də bizim kimi adi bir insansınız. Bizi atalarımızın ibadət etdiklərindən döndərmək istəyirsiniz.Bizə açıq-aşkar bir dəlil gətirin!" Peyğəmbərləri onlara cavab verərək demişdilər: "(Bəli) biz də sizin kimi adi bir insanıq. Lakin Allah Öz qullarından dilədiyinə nemət bəxş edər."*[161]

Peyğəmbərlər cavab olaraq demişlər: Uca Allah bizə bu neməti əta etməklə və bizi risalət üçün seçməklə bizi üstün etmişdir.Sizin qiyasınız təfavüt ilə olan qiyasdır.Çünki bəşər övladları eyni deyillər.Onlardan mömin olanı və kafir olanı vardır.Habelə onlardan peyğəmbərlər, alimlər və saleh insanlar, habelə cahillər, kafirlər və fasiqlər vardır.Bəşər övladları bir-birindən fərqlənirlər.Burada təfavüt vardır. Bu səbəbdən, təfavüt ilə olan qiyas batil olur.Çünki bu, üsul alimlərinə görə qiyasa xələl gətirən amildir.

Əslində isə doğru qiyas, insanlara bəyan etsin deyə bəşəriyyətə göndərilən peyğəmbərin bəşər olmasını tələb edir.Uca Allah buyurur: *"De: Əgər yer üzündə arxayın gəzib dolaşanlar mələklər olsaydı, sözsüz ki, onlara bir mələk peyğəmbər göndərərdik!".*[162] Bu səbəbdən, risaləti təbliğ etməkdən ötrü göndərilən peyğəmbərin göndərildiyi kəslərin növündən olması gərəkdir.Hikmət, bəşəriyyət üçün gələn peyğəmbərin bəşər olmasını tələb edir.Əgər yer üzündə yaşayanlar mələklər olsaydı onlara, onların cinsindən olan mələk göndərilərdi.

[161] İbrahim:10-11.
[162] əl-İsra:95.

Bunların əcaib düşüncələrindən: Onlar insana risalətin verilməsini mümkünsüz sayır, daşa ibadət etməyi isə mümkünsüz hesab etmirlər.Onlar insana peyğəmbərliyin verilməsini ağılasığmaz və mümkünsüz saymaları ilə birgə rübubiyyət və üluhiyyətin daşlar və ağaclarda olmasını mümkünsüz saymırlar.Bu, Nuh və digər tayfalardan olan bütün küfr millətlərinin batil qiyasıdır.Onlar peyğəmbərlərin risalətini onların bəşər olmaları səbəbilə rədd edirlər. Nuhun tayfası demişdir: *"Bu sizin kimi yalnız adi bir insandır. (Peyğəmbərlik iddiası ilə) sizə böyüklük etmək istəyir. Əgər Allah istəsəydi mələklər göndərərdi. Biz bunu ulu babalarımızdan eşitməmişik.Bu adamda, sadəcə olaraq, bir dəlilik var.Hələ bir müddət gözləyin!".*[163] Habelə Qureyş Muhamməd (salləllahu aleyhi və səlləm) haqqında demişlər: *"Məgər içərimizdən vəhy yalnız onamı nazil olmuşdur?!"*[164] Bu, kafirlərdə olan ümumi bir qaydadır.Heç şübhəsiz ki, bu, batil qiyasdır.

<u>İkinci növ</u>: Bənzərlik qiyası.Bu qiyas növu: Şaxənin iki özəy arasında qalaraq nəhayət onlardan ən çox bənzəyənə əlavə edilməsidir.Uca Allah öz yaratdıqları ilə, istər illət qiyası istərsə də, bənzərlik qiyası ilə müqayisə edilmir.Ona dair yalnız "öncəlik qiyası" işlədilə bilər.Belə deyilir: Məxluqda sabit olan və naqisliyi gərəkdirməyən hər bir kamillik ilk növbədə Xaliqdə olur.Uca Allah buyurur: "*Ən*

---

[163] əl-Muminun:24-25.
[164] əl-Qamər:25.

*yüksək sifət isə Allaha məxsusdur."*[165] Habelə buyurur: *"Heç kəsi Allaha bənzətməyin. Allah bilir, siz isə bilmirsiniz!".*[166]

**Növbəti məsələ:**

Onlar doğru qiyası rədd etmişlər.Doğru qiyas: Bəşəriyyətə göndərilən peyğəmbərlərin onlar mislində bəşər olması, mələklərə göndərilən elçilərin isə mələk olmasıdır.Bu, doğru qiyasdır.Hikmət və sağlam fitrət elçilərin, dəvət olunan şəxslərdən fərqli deyil onlarla eyni növdən olmalarını tələb edir.

Onları bu iki məsələyə sövq edən səbəb, onların cəm edən və ayıran amillər haqqında bilgisiz olmalarıdır.Qiyası yararlı edən cəm edən amil və qiyasın səhih olmadığı ayıran amil.

---

[165] ən-Nəhl:60.
[166] ən-Nəhl:74.

# On üçüncü məsələ

## Elm və təqva əhlinə dair ifrata varma

“Alimlər və saleh insanlara dair ifrata varmaq.Uca Allah buyurur: *“Ey kitab əhli! Öz dininizdə həddi aşmayın! Allah barəsində yalnız haqqı deyin.”*[167]

**Şərh**:

Bu, çox ciddi məsələdir.Ərəb dilində gələn “الغلو : əl-ğuluv” kəlməsi həddi aşmağı ifadə edir.

Şəriətdə isə “əl-ğuluv” kəlməsi: Bir şəxsi, layiq olduğu məqamdan daha çox qaldırmağı ifadə edir.Məsələn, peyğəmbərlər və saleh insanlara qarşı aşırıya varıb onları rübubiyyət və üluhiyyət dərəcəsinə qaldırmaq.

Cahiliyyat əhli müəyyən şəxslərə qarşı aşarıya varıb onları sahib olduqları məqamdan daha çox qaldırmış və onları Allah ilə bərabər rəbblər etmişlər.Yəhudilər Uzeyirə dair ifrata varıb: O, Allahın oğludur,-demişlər.Nəsranilər isə Məryəm oğlu İsaya dair ifrata varıb onu bəşər və peyğəmbər vəsflərindən üluhiyyət dərəcəsinə çıxarmışlar. Onlar: O, Allahın oğludur,-demişlər.Habelə Nuhun tayfası saleh insalara dair ifrata varıb onlara surətlər və heykəllər düzəltmiş daha sonra Allahı buraxıb onlara ibadət etmişlər. Onları

[167] ən-Nisa:170.

üluhiyyyət dərəcəsinə qaldırmışlar. *“Və dedilər: “Öz ilahlarınızı tərk etməyin, (xüsusilə) Vəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri atmayın!”.*[168] Onları ilahlar etmişlər.

Habelə günümüzəcən gəlib çatan bir çox digər müşrik tayfalar.Onlar saleh insanlara dair ifrata varıb onların qəbir-lərini təvaf edir, onlara qurbanlar kəsir, onlara nəzr əhdləri verir, ölülərdən yardım diləyir, onları səsləyir və onlardan tələbatlarını istəyirlər.

İfrat və aşırıya varma sahibini şirkə sürükləyir.Bu səbəbdən Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Nəsranilər Məryəm oğluna dair aşırıya vardıqları kimi siz də mənə qarşı aşırıya varmayın! Mən ancaq bir qulam. Deyin: Allahın qulu və elçisi!”.[169]

Heç şübhəsiz ki, kitab əhlindən və oxuyub yazmağı bilməyən ərəblərdən olan müirikləri böyük şirkə salan amil onların peyğəmbərlər və saleh insanlara qarşı aşırıya varma-ları olmuşdur.Bu üzdən hər bir insan, ona layiq olan məqa-ma endirilməlidir.Peyğəmbərlərin risalət sahibləri olması, saleh insanların təqva sahibləri olması, alimlərin elm sahib-ləri olması və onların digər insanlardan daha üstün olması bilinməlidir.Alimin abiddən olan üstünlüyü ayın digər ulduzlardan olan üstünlüyü mislindədir.Onlardan hər birini öz məqamına qoyub sahib olduqları məqamdan yüksək qaldırmamaq gərəkdir.Uca Allah buyurur: *“Ey kitab əhli! Öz*

---

[168] Nuh:23.
[169] Buxari:3261.Əhməd:1/23.Dərimi:2784.

*dininizdə həddi aşmayın! Allah barəsində yalnız haqqı deyin. Həqiqətən, Məryəm oğlu İsa əl-Məsih ancaq Allahın peyğəmbəri, (Cəbrail vasitəsilə) Məryəmə çatdırdığı bir söz və Onun tərəfindən olan bir ruhdur. Allaha və peyğəmbərlərinə iman gətirin. (Allah barəsində) "üçdür" deməyin."*[170] Habelə buyurur: *"De: Ey kitab əhli! Dininizdə haqsız yerə ifrata varmayın. Əvvəlcə yolunu azmış, bir çoxlarını da azdırmış və doğru yoldan çıxmış bir tayfanın nəfsinin istəklərinə uymayın!".*[171] Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Dində aşırıya varmaqdan həzər edin! Həqiqətən də, sizdən öncəkiləri dində aşırıya varmaq həlak etmişdir."[172]

Məxluqlara qarşı aşırıya varmaq və Allahın onlara verdiyi məqamdan onları yüksək tutmaq olmaz.Çünki bu, Allaha şərik qoşmağa aparır.Habelə alim və abidlərə qarşı aşırıya varmaq belədir.Uca Allah yəhudi və nəsranilər haqqında buyurur: *"Onlar Allahı qoyub alimlərini və rahiblərini özlərinə rəbblər qəbul etdilər."*[173] Onlar öz alimləri və abidlərinə qarşı aşırıya varmış və onların halal etmə və haram etmə, habelə pak şəriətin dəyişdirilməsi kimi işlərdə səlahiyyətə malik olduqlarını etiqad etmişlər.

---

[170] ən-Nisə:170.
[171] əl-Maidə:77.
[172] Nəsai:3057.
[173] ət-Təubə:31.

# On dördüncü məsələ

## Haqqı inkar batili isə isbat etmək

“Yuxarıda qeyd edilən bütün məsələlər “inkar və isbat” qaydası üzərində qurulmuşdur.Onlar nəfsi istəklərinə tabe olub zənnə qapanır və peyğəmbərlərin gətirdiyindən üz çevirirlər.”

---

Şərh:

Şeyxin cahiliyyat əhlinə dair yuxarıdaki qeyd etdiyi bütün məsələlər yalnız inkar və isbat qaydası üzərinə qurulur.Onlar Allahın inkar etdiyini isbat edir, Allahın isbat etdiyini isə inkar edirlər.Məhz bu səbəbdən, onlar zəlalətə düşmüşlər.Uca Allah şirki inkar edib tövhidi isbat etmiş və tövhidi əmr etmişdir.Onlar isə əksinə gedib şirki isbat edib tövhidi inkar etmişlər.Onlar “lə iləhə illəllah” sözünün mənasına tamamən zidd getmişlər.Uca Allah buyurur: *“Batilə iman gətirib Allaha küfr edənlər, şübhəsiz ki, ziyana uğrayanlardır!”.*[174] İnkar edilən, batilə iman etməkdir.Onlar isə onu inkar etmək əvəzinə ona iman edib onu isbat etmişlər.İsbat edilən, Allaha iman etməkdir.Onlar isə Allaha küfr etmişlər.Onlar batili isbat etdikləri zaman isbat olunanı inkar etmişlər.

[174] əl-Ənkəbut:52.

Bu, onların tutub getdiyi və zəlalətdə vurnuxduqları cahiliyyat qaydasıdır.Əgər sən onların halını araşdırsan bu qaydadan kənar çıxmadıqlarını görərsən.Allaha şərik qoşan hər bir şəxs Allahın isbat etdiyini inkar etmiş, Allahın inkar etdiyini isə isbat etmiş olur.Haramı halallaşdırman yaxud halalı haramlaşdıran şəxs həmçinin bu növdəndir.Əgər biri Allahın halal etdiyini inkar edər, Onun haram etdiyini isbat edərsə cahiliyyat əhlinin etdiyi heç bir şeyi xaric etməyən həmin qaydaya daxil olar.Əgər biri tövhid əhlinə düşmən kəsilib şirk əhli ilə dostluq edərsə Allahın isbat etdiyini inkar, Allahın inkar etdiyini isə isbat edər.Çünki Uca Allah möminləri dost tutmağı əmr edib müşriklərlə dostluğu qadağan etmişdir.

# On beşinci məsələ

## Onlar haqqı qəbul etmədikləri səbəbilə batil üzrlər gətirirlər

“Onlar, Allahın onlara verdiyinə tabe olmamağa anlamadıqlarını üzr gətirirlər.Uca Allah buyurur: *“Dedilər: Bizim qəlblərimiz örtülüdür”.*[175] *“Onlar dedilər: Ey Şüeyb! Dediklərinin çoxunu başa düşmürük”.*[176] Uca Allah onların yalançı olduqlarını, habelə bunun onların qəlblərinə möhürün vurulması səbəbilə olduğunu və bu möhürlənmənin onların küfrü səbəbilə olduğunu bəyan etmişdir.”

---

Şərh:

Onlar haqqı qəbul etmədikləri üçün onu anlamadıqlarını üzr gətirmişlər.Uca Allah xəbər vermişdir ki, Peyğəmbər (salləllahu aleyhi və sələm) onları İslama çağırdığı zaman yəhudilər demişlər: *“Dedilər: Bizim qəlblərimiz örtülüdür. Əksinə, Allah onlara küfrlərinə görə lənət eləmişdir. Buna görə də onların ancaq az bir hissəsi iman gətirər.”*[177] Sanki bir pərdədir və ona peyğəmbərin sözləri çatmır və qəlblər onun sözləri ilə rahatlıq tapmır.Onlar bunu

---

[175] əl-Bəqərə:88.

[176] Hud:91.

[177] əl-Bəqərə:88.

Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təkzib etmək üçün bir dəlil seçmişlər.Bu ayənin məşhur mənası məhz budur."

Ayənin ikinci mənası: *"Dedilər: Bizim qəlblərimiz örtülüdür".*Yəni, qəlblərimiz elm ilə doludur və bizim heç kəsin sözlərinə ehtiyacımız yoxdur.Onlar Peyğəmbərə (salləllahu aleyhi və səlləm) ehtiyacsız olduqlarını iddia etmişlər.

Uca Allah səbəbin onların dediyi söz olmadığını və əsas səbəbin onların küfrü üzündən Allahın onları lənət etməsi olduğunu bəyan etmişdir.Yəni, onları Öz rəhmətindən qovub uzaqlaşdırmışdır.Onlar küfr içində olduqları səbəbilə haqqı qəbul etməz bir hala düşmülər.Habelə onlar Peyğəmbərin sözlərini anlamaz bir hala düşmüşlər.Çünki onlar ona diqqət ayırmır və ona əhəmiyyət vermirlər.Buna səbəb isə, Allahın onları cəza olaraq haqq yoldan azdırması olmuşdur. Uca Allah buyurur: *"Onlar (haqqdan) üz döndərdikdə Allah da onların qəlblərini (imandan) döndərdi."*[178] Haqqı qəbul etməyən şəxsi isə Uca Allah batil ilə sınağa çəkər və həmin şəxs bundan sonra haqqı qəbul etməyəcək bir hala düşər. Çünki O, onun qəlbini fəsada uğradar.Uca Allah buyurur: *Əksinə, Allah onlara küfrlərinə görə lənət eləmişdir. Buna görə də onların ancaq az bir hissəsi iman gətirər."*[179] *"Yəhudilər zülm etdiklərinə və bir çoxlarını Allahın yolundan döndərdiklərinə görə (əvvəlcə) özlərinə halal edilmiş gözəl nemətləri onlara haram etdik.Və qadağan olunmasına baxmayaraq, sələm (faiz) aldıqlarından, haqsız yerə xalqın*

[178] əs-Saff:5.
[179] əl-Bəqərə:88.

*malını yediklərindən dolayı (halal olanı onlara haram buyurduq).”*[180] Bu, yəhudilər haqqında gəlmişdir.Onlar demişlər: *”Bizim qəlblərimiz örtülüdür.”*.Bu, heç də doğru deyil.Onları cəza olaraq yalnız Allah haqqdan döndərmişdir.Çünki qəlbin əsası onun fitrət üzərə olub fitrəti ilə haqqı qəbul etməsidir.Lakin fitrət fəsada uğradığı zaman qəlb haqqı qəbul etməyəcək hala düşmüşdür.Buna torpağı misal göstərmək olar.Belə ki, torpaq korlanıb şoran olduğu zaman orada heç bir bitki çıxmır.Çünki həmin torpaq yararsız hala düşür.Qəlb həmçinin belədir.O, fəsada uğradığı zaman haqqı qəbul etməyəcək hala düşür.

Habelə Şueybin (aleyhi-s-sələm) tayfası.Fəsahəti və təsirli sözlərində olan qüvvəti və bəlağəti səbəbilə peyğəmbərlərin natiqi ləqəbini almışdır Şueyb, peyğəmbərlərin içində ən fəsahətli və natiqliyi ilə seçilən birisi olması ilə birgə onun tayfası belə demişlər: *“Onlar dedilər: Ey Şüeyb! Dediklərinin çoxunu başa düşmür və səni aramızda zəif görürük. Əgər əşirətin olmasaydı, səni daşqalaq edərdik. Yoxsa sən bizim üçün hörmətli bir adam deyilsən!”.*[181] Onlar Şüeybin sözlərini anlamırdılar.Çünki Uca Allah onların qəlblərinə, İsrail oğullarına etdiyi kimi möhür vurmuşdur.Bu, Uca Allahın qanunudur.Əgər biri haqq ona çatdığı zaman ona lovğalıq edib onu qəbul etməzsə həmin şəxs cəza olaraq qəlbin fəsada uğraması bəlasına düçar olar.

---

[180] ən-Nisə:159-160.

[181] Hud:91.

Həmçinin Qureyş kafirləri.Onlar Allahın Peyğəmbərinə (salləllahu aleyhi və səlləm) nə demişlər? *"Onlar deyərlər: Sənin bizi dəvət etdiyinə qarşı qəlblərimiz örtülü, qulaqlarımız da kardır və bizimlə sənin aranda pərdə vardır. Sən əməl et, biz də əməl etməkdəyik!"*.[182]

Kafirlərin üslubu birdir.Onlar peyğəmbələrin dəvətini onların sözlərini anlamadıqları bəhanəsi ilə qəbul etmirlər. Məgər bu, peyğəmbələrin qüsurlu təbliğatı səbəbilədir? Xeyir! Lakin bu, onların kafir olmaları, haqqdan üz çevirmələri, ona əhəmiyyət verməmələri və xeyirə can atmamaları səbəbilə olan daxili qüsurun nəticəsidir.

[182] Fussilət:5.

# On altıncı məsələ

## Yəhudilər Tövratı sehr kitabları ilə əvəzləmişlər

"Yəhudilər Allahın onlara verdiyi kitabı sehr kitabları ilə əvəzləmişlər.Uca Allah buyurur: *"Allah tərəfindən onlara əllərindəkini (Tövratı) təsdiq edən bir peyğəmbər gəldikdə kitab verilənlərdən bir qismi guya bilmirmiş kimi, Allahın kitabına arxa çevirdi.Süleymanın səltənətinə dair şeytanların oxuduqlarına (sehr kitablara) uydular. Süleyman kafir olmadı, lakin şeytanlar sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanları xalqa öyrədərək kafir oldular."*[183]

---

Şərh:

Yəhudilər, içində Muhammədin (salləllahu aleyhi və səlləm) vəsfləri olan və ona tabeçiliyi əmr edən Tövrata küfr etmişlər. Uca Allah buyurur: *"O kəslərə ki, əllərindəki Tövratda və İncildə yazılmış gördükləri rəsula-ümmi peyğəmbərə tabe olurlar, (O Peyğəmbər) onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər, təmiz (pak) nemətləri halal, murdar şeyləri haram edər, onların ağır yükünü yüngülləşdirər və üstlərindəki buxovları açar."* [184] Habelə İsa peyğəmbər onun gəlişini İncildə müjdələmişdir.Uca Allah buyurur: *"Ey İsrail oğulları!*

[183] əl-Bəqərə:101-102.
[184] əl-Əraf:157.

Həqiqətən, mən özümdən əvvəl nazil olmuş Tövratı təsdiq edən və məndən sonra gələcək Əhməd adlı bir peyğəmbərlə (sizə) müjdə verən Allahın elçisiyəm!”.[185]

Bu Peyğəmbər (salləllahu aleyhi və sələm), onun adı, risaləti və vəsfləri Tövrat və İncildə xatırlanır.Hətta onlar onu öz övladlarını tanıdıqları kimi tanıyrlar.Onlar Allahın kitabı Tövrata küfr etdikləri və Muhamməda (salləllahu aleyhi və sələm) tabeçilik əmrinə əməl etmədikləri zaman Uca Allah onları şeytanların əməlindən olan sehr kitablarını öyrənmək bəlasına düçar etmişdir.Onlar aləmlərin Rəbbinin vəhyini şeytanların əməli ilə əvəzləmişlər.Bu, onlara verilən bir cəzadır.Hər kim haqqdan üz çevirərsə batil ilə sınağa çəkilər.

Habelə haqqı tərk edən şəxs onların mislindədir.O, batilə düşməklə sınağa cəkilir.İnsanlardan peyğəmbərlərin tövhidə və Allahı ibadətdə təkləşdirməyə çağırışını tərk edən hər bir kəs şirkə və xurafatlara düşmək bəlasına düşür. Belə şəxslər onu dəlil gətirib insanlar arasında onu haqq olaraq yayırlar.Bu, bir çox xurafatçı alimlərin və qəbirə tapınanların alimlərinin gerçək halıdır.Onlar Allahın tövhidinə, Allahın kitabı və Peyğəmbərin sunnəsinə çağırmaq əvəzinə batilə, qəbirlərə ibadət etməyə, ölülərə bağlanmağa çağırırlar.Onlar insanlar arasında yaydıqları bu şeylərə şübhələr axtarır və vaxtlarını bu kimi batil işlərə sərf edirlər.

[185] əs-Saff:6.

# On yeddinci məsələ

## Batili peyğəmbərlərə nisbət etmək

Onlar öz batillərini peyğəmbərlərə nisbət edirlər.Uca Allah buyurur: "*Süleyman kafir olmadı*".[186] Habelə buyurur: "*İbrahim nə yəhudi, nə də nəsrani idi.*"[187]

Şərh:

Cahiliyyat əhlinin məsləkindən: Onlar üzərində olduqları küfr və zəlaləti peyğəmbələrə nisbət edirlər.Buna misal yəhudilərin sehri Süleyman peyğəmbərə nisbət etmələridir. Onlar demişlər: Sehr Süleymanın əməlindəndir.O, məhz bunun vasitəsilə cinləri və şeytanları özünə ram etmişdir. Onlar şeytanların, Allahın istədiyi şəkildə ram etdiyi məxluqlar olduqlarını bilməmişlər.Uca Allah onları, peyğəmbəri Süleymana (aleyhi-s-sələm) ram etmişdir.Həmin yəhudilər sehri insanlar içində yaymaq məqsədilə onu Süleymana nisbət etmişlər.Onlar deyirdilər: Bu, peyğəmbərlərin əməlindəndir. Habelə yəhudi və nəsranilər sahib olduqları küfr işləri hənif dininin imamı və peyğəmbərlərin atası İbrahimə (aleyhi-s-sələm) nisbət etmişlər.Onlar deyirlər: Bu, İbrahimin dinidir. Uca Allah onların bu sözlərini rədd edərək demişdir: "*İbrahim nə*

[186] əl-Bəqərə:102.
[187] Ali İmran:67.

*yəhudi, nə də nəsrani idi. O ancaq hənif müsəlman idi və müşriklərdən də deyildi."*[188] Bu, İbrahimin dinidir.O, yəhudi və nəsranilərdən fərqli olaraq tövhid dini üzərə olmuş və şirk və onun əhlindən uzaq olmuşdur.

Habelə yəhudilik və nəsranilik İbrahimdən bir çox əsr sonra ortaya çıxmışdır.Belə olan halda necə yəhudilik və nəsranilik ona nisbət olunur? Bu ən çirkin yalandır.Tarix onların yalançı olduğunu göstərir.Çünki onlarla İbrahim arasında uzun əsrlər vardır.Musaya nazil olan Tövrat, habelə İsaya nazil olan İncil yalnız İbrahimdən sonra nazil olmuşdur.Uca Allah buyurur: *"Ey kitab əhli, nə üçün İbrahim barəsində höcətləşirsiniz? Tövrat da, İncil də ancaq ondan sonra nazil edilmişdir, məgər başa düşmürsünüz?".*[189] *"Tövrat göndərilməmişdən əvvəl İsrailin yalnız özü özünə haram etdiyi şeylərdən başqa bütün təamlar (yeməklər) İsrail övladına halal idi."*[190]

Habelə bu ümmətdən olan bəziləri Muhamməd Peyğəmbərə (salləllahu aleyhi və səlləm) batili nisbət edir və batilinə dəstək vermək üçün yalan hədislər uydururlar.

Habelə bu ümmətdən bəziləri əqidə məsələlərində imamlara müxalif olduqları halda özlərini imamlara nisbət edirlər.Onlar mötəzili və əşari əqidəsində olduqları halda özlərini Əbu Hanifə, Malik, Şafii və Əhmədə nisbət edirlər. Onlar bu batil etiqadı sələfin imamlarına nisbət edirlər.Hə-

---

188 Ali İmran:67.

189 Ali İmran:65.

190 Ali İmran:93.

min imamlar isə mötəzili olmamışlar.Əksinə onlar mötəzili və kəlam əhli ilə mübarizə aparmışlar.

# On səkkizinci məsələ

## Peyğəmbərlərə müxalif olmalarına rəğmən özlərini onlara nisbət etmələri

“Onlar mənsubiyyət məsələsində ziddiyətə düşmüşlər.Onlar İbrahimə tabeçiliyi tərk etmələri ilə birgə özlərini ona nisbət etmişlər.”

---

Şərh:

Mənsubiyyətdə ziddiyətə düşmək: İnsanın bir şeyə müxalif olduğu halda özünü ona nisbət etməsidir.Bu nisbət olunma isə batil və yalandır.

Doğru nisbət olunma, insanın bir şeyə müvafiq olduğu halda özünü ona nisbət etməsidir.Özünü İbrahimə nisbət edən şəxs onun gətirmiş olduğu Allaha tövhid, ibadətin xalis Ona yönəldilməsi və müşriklərdən uzaq olmaq kimi şeylərdə ona müvafiq olub ona bu şeylərin heç birində müxalif olmamasıdır.

Bu növdən, yəhudilərin həcc etməkdən imtina etmələri və qibləyə yönəlməni rədd etmələri ilə birgə özlərini İbrahimə nisbət etmələridir.Bu səbəbdən, Uca Allah buyurur: *“Həqiqətən, insanlar üçün ilk bina olunan ev Bəkkədəki evdir ki, o, şübhəsiz, bütün aləmlərdən ötrü bərəkət*

*və doğru yol qaynağıdır.Orada aydın nişanələr İbrahimin məqamı vardır. Ora daxil olan şəxs əmin-amanlıqdadır.Yoluna qüvvəsi çatan hər bir kəsin həccə gedib o evi ziyarət etməsi insanların Allah qarşısında borcudur. Kim bunu inkar edərsə (özünə zülm etmiş olar). Əlbəttə, Allah aləmlərə möhtac deyildir!".*[191]

Habelə özünü dörd imama nisbət edən şəxslər.Onların həmin imamlara etiqadda müvafiq gəlmələri vacibdir.Onlara cəhmiyyə, mötəlizə və əşari kimi etiqadlarla müxalif olmamalıdırlar.

[191] Ali İmran:96-97.

## On doqquzuncu məsələ

## Saleh insanlara nisbət olunan bəzi insanların əməlləri səbəbilə onları pisləmək

**“Saleh insanlara nisbət olunan bəzi şəxslərin hərəkətləri səbəbilə saleh insanları pisləmək.Buna misal olaraq, yəhudilərin İsa peyğəmbəri, habelə yəhudi və nəsranilərin MuhamməDi (salləllahu aleyhi və səlləm) pisləmələrini göstərmək olar.”**

## Şərh:

Onlar, saleh insanlara nisbət olunan bəzi şəxslərin pis əməlləri səbəbilə həmin insanları pisləyir və onlara tabe olanların hərəkətlərini onlara nisbət edirlər.Əslində isə onlar həmin əməllərdən uzaqdırlar.Yəhudilər, nəsranilərdən olan İsanın davamçılarının zəlalətə düşmələri və Allahın üç ilahdan biri olduğunu yaxud Məsihin Allah olduğunu yaxud Allahın oğlu olduğunu etiqad etmələri səbəbilə onu pisləyirlər.

Habelə Muhammədin (salləllahu aleyhi və səlləm) dininə nisbət olunan quburilərin (qəbirlərə sitayiş edənlərin), cəhmilər, mötəzililər və xəvariclərin etdikləri səbəbilə onun şənini kiçildirlər.

Həmin peyğəmbərlərin şənini kiçildən şəxslərə deyirik: Bu, Musanın (aleyhi-s-sələm) dini deyil.Bu, İsanın (aleyhi-s-sələm) dini deyil.Bu, Muhammədin (salləllahu aleyhi və səlləm) dini deyil. Davamçılar zəlalətə düşdükləri zaman bunu özəyə nisbət etmək doğru deyil.Bu şeyləri yalnız bu əməlləri ixtira edənlərə nisbət etmək lazımdır.Yəhudilər Musanın risalətini təhrif edib dəyişdikləri səbəbilə həmin peyğəmbər pislənə bilməz.Habelə nəsranilərin şirk, xaçpərəstlik və sahib olduqları digər çirkin küfrləri İsanın dininə nisbət oluna bilməz. Habelə müsəlman olduqlarını iddia edən quburilərin yaxud müsəlman iddiasında olsalar belə rafizi və batinilərdən olan zındığların etdikləri Muhammədə (salləllahu aleyhi və səlləm) nisbət oluna bilməz.Bu şeylər, Muhammədin dininə nisbət oluna bilməz.Peyğəmbərə (salləllahu aleyhi və səlləm) yalnız ona tabe olub ona iman gətirənlər nisbət oluna bilər.Habelə saleh insanlara, onları özlərinə örnək tutub onara tabe olan insanlar nisbət oluna bilər.Uca Allah buyurur: *"(İslamı) ilk əvvəl qəbul edib irəli düşən mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedən kimsələrə gəldikdə, Allah onlardan, onlar da Allahdan razıdırlar."*[192] Habelə buyurur: *"Şübhəsiz ki, insanların İbrahimə ən yaxın olanı onun ardınca gedənlər, bu Peyğəmbər və ona iman gətirənlərdir."*[193]

---

[192] ət-Təubə:100.

[193] Ali İmran:68.

**Habelə dörd imama nisbət olunanlar, etiqadda zəlalət üzərə olub dəlilə müxalif olduqları halda həmin imamlara nisbət oluna bilməzlər.**

# İyirminci məsələ

## Onlar sehrbazlar və kahinlərin əməllərini övliyaların kəraməti olduğunu etiqad edirlər

“Onlar sehrbazlar və onlar mislində olanların qeyri-adi əməllərinin salehlərə verilən kəramətlər olduğunu etiqad etmiş və bunu, Süleyman peyğəmbərə nisbət etdikləri kimi həmçinin digər peyğəmbərlərə nisbət etmişlər.”

Şərh:

Qeyri-adi yaxud adətdən kənar işlər, yalnız Allahın edə biləcəyi bir şeydir.Bu, peyğəmbərin əli ilə ediləcəyi zaman möcüzə sayılacaq.Məsələn, Musanın əsasının ilana dönməsi, İsanın Allahın izni ilə cüzəm xəstələrini sağaltması və ölüləri diriltməsi, habelə Uca Allahın Muhamməddə (salləllahu aleyhi və səlləm) verdiyi möcüzələr.Onların ən əzəmətlisi isə bütün bəşəriyyəti heyran qoymuş Qurani Kərimdir.İnsanlar və cinlər onun mislində bir şey gətirməyə aciz qalmışlar.

Lakin qeyri-adi bir şey əməli-saleh və təqvalı bir mömin qulun əli ilə ediləcəyi zaman bu, həmin şəxsin əli ilə icra olunan Allahın bir kəraməti adlanacaq.Bu kəramət, din üçün bir hüccət olması yaxud müsəlmanların buna ehtiyac duymaları səbəbilə hasil olur.Məhz bu cür Məryəm (aleyhə-s-

sələm) üçün kəramət hasil olmuşdur.Belə ki, Zəkəriyyə onun yanına mehraba daxil olduğu zaman onun yanında ruzi-nemətlərə rast gəlmişdir.Məryəm həmin zaman mehrabda, ibadət olunan yerdə ibadətə aludə olmuşdur.Habelə mağara sahiblərinin uzun bir yuxuya getmələri və bədənləri çürümədən bu hal üzərə qalmaları və heç bir nöqsana uğramamları kimi hadisə.Bu, övliyaların kəramətləridir.

Ancaq kafirlərin əli ilə edilən və şeytanların əməllərindən olan adətdən kənar şeylərə bənzər işlər insanların əqidələrini pozman və onlara zərər yetirmək məqsədilə olan fırıldaqçılıq, hiylə və təxəyyüllü sehr yaxud şeytanların əməli və onların istifadə edilməsi hesab olunur.Belə şəxslərin havada uçması yaxud suyun üzərində yeriməsi əsla kəramət deyil.Bu sadəcə şeytan əməlidir.Çünki onlar şeytanlara küfr və şirk vasitəsilə yaxınlıq tapdıqları zaman şeytanlar onlara xidmət göstərir və onları havada saxlayır və onları suyun üzərində gəzdirirlər.

Kafirlərin əli ilə edilən fokuslar və şirk işlər şeytanların əməli yaxud həmin şəxslərin hiyləgərliyi və insanları aldatmalarıdır.Onlar sehri öyrəndikləri kimi bu kimi işləri öz aralarında öyrənirlər.Peyğəmbərlərə və onların davamçılarına bu kimi şeylər nisbət olunmaz.Bu səbəbdən, yəhudilər sehri Allahın peyğəmbəri Süleymana nisbət etdikləri zaman Uca Allah onların bu sözünü rədd etmiş və sehrin küfr olduğunu və küfrün peyğəmbərlərə nisbət olunmadığını bəyan etmişdir.Süleyman isə peyğəmbərlərdən biridir və onun sehrlə məşqul olması ona yaraşmayan bir işdir.

# İyirmi birinci məsələ

## Allaha fit vermək və əl çalmaqla ibadət etmək

**"Onlar fit verib əl çalmaqla Allaha yaxınlıq axtarmışlar."**

**Şərh:**

Peyğəmbərin (salləllahu aleyhi və səlləm) cahiliyyat əhlinə müxalif olduğu məsələlərdən biri də, onların Allaha fit vermək və əl çalmaqla ibadət etmələri, yəni yaxınlaşmalarıdır.Uca Allah buyurur: *"Onların Kəbənin yanındakı duaları fit verib əl çalmaqdan başqa bir şey deyildir."*[194] Yəni, müşriklərin Kəbənin ətrafında Allaha yaxınlaşmaları fit vermək və əl çalmaqla olurdu.Onlar bunu Kəbənin ətrafında edir və bunu dua adlandırırdılar.Onlar bunun vasitəsilə Uca Allaha yaxınlaşırdılar.Bunu onlara insan və cinlərdən olan şeytanlar gözəlləşdirmişdir. Çünki ibadət yalnız Uca Allahın buyurduğu şeylər ilə olur və o, "təuqifiy"dir.İnsan özündən heç bir şey ixtira etmək haqqına malik deyil yaxud Allahın buyurmadığı və dində əsli olmayan şeyləri digərindən mənisməyib Allaha ibadət etməsi yolverilməzdir.

Bu cəhətdən həmin iki xislətin, fit verməyin və əl çalmağın, insan bununla ibadəti qəsd etməzsə belə haram olması bəlli olur.Çünki bu işdə müşriklərə oxşarlıq vardır.

---

[194] əl-Ənfəl:35.

Peyğəmbər (salləllahu aleyhi və səlləm) əl çalmağı yalnız xüsusi olaraq ehtiyac olduğu zaman qadınlar üçün icazəli etmişdir.[195] Məsələn, imam namazda səhv etdiyi zaman onun diqqətinə çatdırmaq üçün bunu edə bilərlər.Çünki onlar kişilərin içində olacaqları zaman onların səsi ucaltmasında fitnə vardır. Kişinin əl çalmaqla özünü kafirlərə və qadınlara bənzətməsi isə yasaqdır.

İmam namazda səhv edəcəyi zaman onun diqqətinə çatdırmaq kimi ehtiyac anında belə kişiyə əl çalmaq caiz deyilsə bunun ehtiyacsız edilməsi isə aydındır ki, daha pisdir.Kişi imamın səhvini "təsbih" etməklə onun nəzərinə çatdırır.Bu məsələdə, müxtəlif tədbirlərdə əl çalmaqla özlərini kafirlərə oxşadan şəxslərə açıq-aydın rəddiyə vardır.

[195] Əbu Hureyra rəvayət edib demişdir: Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: "Təsbih (subhanəllah demək) kişilər, əl çalmaq isə qadınlar üçündür." Buxari:1203. Muslim: 422/106.

# İyirmi ikinci məsələ:

## Onlar dini oyun və əyləncəyə çevirmişlər

**"Onlar dinlərini oyun və əyləncəyə çevirmişlər."**

**Şərh:**

Ərəb dilində gələn "اللهو : ləhv" sözü: Haqqdan yayındıran hər bir batildir.Ərəb dilində gələn "اللعب : ləib" sözü ilə ciddiliyin əksi olan sözdür.Bu isə, faydasız şeylər-dir.İnsanın oyun və əyləncəni özünə din seçib bunu Allaha yaxınlaşdıran amil etməsi cahiliyyat dinindəndir.Bu, sufilərdə mövcud olan bir işdir.Onlar dəf çalmağ, mahnılar oxumaq kimi işləri Allaha ibadət edirlər. Onlar mahnıları və dəf çalmağı Allaha yaxınlaşdıran amil edirlər.

Mahnılar və musiqi alətləri oyun və əyləncədir.Bu işlər özlüyündə haramdır.Bu kimi işlər vasitəsilə Allaha ibadət etmək necə olar?

Hal-hazırda İslam naşidləri adlanan şeylər ixtira edib onu dedikləri kimi Allaha dəvət vasitəsi edənlər onlara bənzəyirlər.Allaha dəvət etmək dindəndir və ora insanları əyləndirən, habelə Allahı zikr etməkdən və Quranı qiraət etməkdən yayındıran mahnılar və nəğmələr daxil deyil.Əslində bu, dəvət üslubları deyil və sadəcə hizbçilik yollarının şüarlarıdır.Çünki dəvət yolları "təuqifiy"dir.

Peyğəmbər (salləllahu aleyhi və səlləm) insanları Quran və sunnə, habelə moizə, göstərişlər və gözəl şəkildə olan mübahisə ilə dəvət etmiş və xorla oxunan naşidləri dəvətin üslublarından etməmişdir.

İnsanın, Hassənin söylədiyi şerlər kimi müşrikləri rədd etmək və İslamı müdafiə etmək yaxud əmələ rəğbət oyatmaq və səfərin məşəqqətlərini azaltmaq üçün söylədiyi gözəl şerlər hal-hazırda xorla oxunan naşidlərə bənzəmir və bunu ilə müqayisə edilə bilməz.Çünki onların arasında açıq-aydın fərq vardır.

# İyirmi üçüncü məsələ

## Dünya ilə qürrələnmək

“Onlar dünya həyatına aldanmış və Allanın onlara əta etdiyi nemətlərin Onun razılığına dəlalət etdiyini düşünmüşlər. Uca Allah buyurur: *“Onlar: Bizim mal-dövlətimiz və övladımız daha çoxdur və bizə əzab da verilməyəcəkdir,-dedilər.”*[196]

---

## Şərh:

Cahiliyyat əhli onlara verilən övladlar və mal-dövlətın Allahın onlara qarşı lütfkar olduğu nəticəsində olduğunu və Allahın onlara əzab verməyəcəyini hesab etmişlər. *“Onlar: “Bizim mal-dövlətimiz və övladımız daha çoxdur və bizə əzab da verilməyəcəkdir”-dedilər. De: “Rəbbim istədi-yinin ruzisini artırar və azaldar. Lakin insanların əksəriyyəti (bunu) bilməz!” Sizi bizə yaxınlaşdıran nə var-dövlətiniz, nə də oğul-uşağınızdır.”*[197] Habelə buyurur: *“De: Həqiqətən, Rəbbim qullarından istədiyinin ruzisini bol edər, (istədiyininkini də) azaldar. (Allah yolunda) nə xərcləsəniz, Allah onun əvəzini verər. O, ruzi verənlərin ən yaxşısıdır!”.*[198] Mal-dövlətin, övladların və sərvətin çoxluğu Allahın insanı sevməsinə dəlil deyil.Çünki bəzən Allah tədriclə əzaba düçar etmək üçün kafirə çoxlu nemətlər verir.Hədisdə gəlmişdir:

---

[196] Səba:35.

[197] Səba:35-37.

[198] Səba:39.

"Həqiqətən, Allah dünyanı sevdiyinə də və sevmədiyinə də verir.Dini isə yalnız sevdiyinə əta edir."[199] Digər hədisdə gəlmişdir: "Əgər Allah yanında dünya ağcıqənədin qanadı dəyərində olsaydı kafir oradan bir qurtum su belə içməzdi."[200]

Budur Allahın yaratdıqları içində ən üstün olanı Peyğəmbər (salləllahu aleyhi və səlləm), habelə peyğəmbərlərdən sonra ən üstün insanlar olan onun səhabələri. Onlara aclıq, yoxsulluq və kasadlıq üz vermişdir.Kafirlər isə naz-nemət və cah-calal içində kefdə damağdadırlar.Heç şübhəsiz ki, bu, Allahın onları tədriclə əzaba giriftar etmək üçün edilir.

Dünyanın bər-bəzəyi həmin insanların Allah qatında dəyərini ifadə etmir.İnsanın Allah qatında dəyərinə, onun zənginliyi yaxud kasıblığından asılı olmayaraq yalnız onun saleh əməllərini dəlil gətirmək olar.Məhz bu cür şəxs Allahın yanında dəyərli olur.Mal-mülk və bol sərvətlər sahiblərinin Allah qatında ən dəyərli insanlar olmaları, kasıb və yoxsul insanların isə Allah qatında dəyərsiz olmaları səbəbilə bu hala düşmələri haqqında insanların meyarları, heç şübhəsiz ki, batil meyarlardır.

---

[199] Əhməd:1/378.
[200] Tirmizi:2320.İbn Macə:4110.

# İyirmi dördüncü məsələ

## Onlar, zəiflərin tutunduğu zaman haqqı tərk edirlər

**“Onlar, zəiflər haqqı daha öncə qəbul edəcəkləri zaman təkəbbür və təşəxxüs göstərərək ona boyun əyməyi tərk edirlər.Uca Allah buyurur:** *“Rəbbinin rizasını diləyərək səhər-axşam Ona dua edənləri yanından qovma!”.*[201]

Şərh:

**Cahiliyyat əhli, üzərində zəif insanlar olacağı zaman haqqı rədd edirlər.Bu səbəbdən, onlar demişlər:** *“Əcəba, Allahın aramızda lütfünü rəva gördüyü kəslər bunlarmıdır?”*[202] **Yəni, onlar cənnətə girməyə bizdən daha layiq deyillər.Biz onlardan daha öndəyik və onlardan daha şərəfliyik.Bunlar cəmiyyətdə heç bir qədir-qiyməti olmayan zəif kimsələrdir.Uca Allah isə onların sözünü rədd edərək demişdir:** *“Məgər Allah şükür edənləri daha yaxşı tanıyan deyildirmi?”.*[203] Uca Allah bu dini yalnız sevdiyinə əta edir. Dünyanı isə həm sevdiyi qullarına həm də, düşmənlərindən istədiyinə verir.

---

201 əl-Ənam:52.

202 əl-Ənam:53.

203 əl-Ənam:53.

# İyirmi beşinci məsələ

## Bir şeyin batil olmasına zəif insanların ona daha öncə nail olmalarını dəlil gətirmək

“Bir şeyin batil olmasına zəiflərin ona daha öncə nail olmalarını dəlil gətirmək.Uca Allah buyurur: *“Əgər yaxşı bir şey olsaydı, onlar bu işdə bizdən qabağa düşə bilməzdilər.”*[204]

Şərh:

Cahiliyyat adətlərindən: Bir şeyin batil olmasına zəiflərin ona daha öncə nail olmalarını dəlil gətirməkdir. Uca Allah müşriklərin belə dediyini xəbər verir: *“Əgər yaxşı bir şey olsaydı, onlar bu işdə bizdən qabağa düşə bilməzdilər.”*[205]. Onlar deyirlər: Biz bilikli, səriştəli və dərrakəli adamlarıq. İşlərin məcrasını bilirik.Muhamməddin gətirdiyi bu şeyin haqq olmadığını gördüyümüz zaman onu tərk etdik.Əgər o, haqq olsaydı biz onu daha öncə qəbul edərdik.Bizim onu tərk etməyimiz onun haqq olmadığına dəlildir.

Bu, ən böyük batildir.Çünki haqq, müəyyən təbəqədən olan insanların tabeçiliyinə dayanmır.Əslində isə haqqa tabeçilik, Allahın quluna verdiyi bir nemətdir.Uca Allah qullarından istədiyinə Öz nemətini verir və onu həmin

[204] əl-Əhqaf:11.
[205] əl-Əhqaf:11.

nemətə müvəffəq edir.Peyğəmbərlərin ardıcıllarının çoxu zaiflər olmuşlar.Uca Allah buyurur: *“Onlar: Sənə ən rəzil adamlar tabe olmuşkən, biz sənə imanmı gətirəcəyik? - dedilər.”*[206] Habelə Nuh tayfası haqqında buyurur: *“Sənə yalnız düşüncəsiz olaraq içimizdəki səfillərin uyduğunu görürük.”*[207] Yəni, onlar düşüncə sahibləri deyillər.Həmin şəxslər özlərinin düşüncə və ağıl sahibləri olduqlarını iddia etmişlər.Əgər Nuhun gətirdiyi din haqq olsaydı keçərli söz sahibləri və insanların başbilənləri ona tabe olardılar. Onların onu tərk etmələri həmin yolun haqq olmadığına dəlildir.Bu isə, batildir.Çünki haqqı inkar edənlərin çoxu naz-nemət içində yaşayan insanlar olurlar. Uca Allah buyurur: *“Biz hər hansı bir məmləkətə qorxudan bir peyğəmbər göndərdiksə, onun naz-nemət içində yaşayan zəngin başçıları ancaq: “Biz sizinlə göndərilənlərə küfr edirik!- dedilər.”*[208] Haqqa tabe olanların çoxu isə zəiflər və kasıblardır.Çünki onlarda lovğalıq olmur.

Bir şeyin haqq olmasına, ona tabe olanların zəngin insanlar yaxud nüfuz sahibləri olduğunu dəlil gətirmək, habelə bir şeyin batil olmasına, ona tabe olanların zəiflər olduğunu dəlil gətirmək cahiliyyat əhlinin meyarıdır.Haqqı və batili tanımaq üçün bu kimi şeyləri meyar və ölçü etmək doğru deyil.Bu səbəbdən, alimlər deyirlər: Haqq kişilərlə tanınmır və yalnız kişilər haqq ilə tanınır.

---

206 əş-Şuara:111.
207 Hud:27.
208 Səba:34.

# İyirmi altıncı məsələ

## Nəfsi istəklərinə uyğun gəlsin deyə Kitabın dəlillərini biləndən sonra onu təhrif etmək

“Anladıqdan sonra, Allahın kitabını bilə-bilə təhrif etmək”.

---

**Şərh:**

Yəhudi və nəsranilərin əməllərindən, onların Allahın kitabları olan Tövratı və İncili öyrənib anladıqdan sonra onu təhrif etmələridir.Onların nəfsi istəklərinə uyğun gəlsin deyə onlar həmin kitablarda əlavələr yaxud əksiltmələr etməklə yaxud onu doğru olmayan mənalar ilə təfsir etməklə onu təhrif etmişlər.Müsəlmanlar həmçinin bu bəladan əziyyət çəkməkdədirlər.İlk olaraq bu, nəfsi istəklərinə, arzu və şəhvətlərinə uymuş kitab əhlindən sadir olmuşdur.Onlar nassları təkzib edib onu danmaq iqtidarında olmadıqları zaman təhrif və yanlış təfsirlərə əl atmışlar.

Günümüzəcən müsəlmanlar, nəfsi istəklərinə uymuş adamların, habelə zəlalət firqələrinin və şəhvətlərini təmin etmək uğrunda çalışanların meydana gətirdiyi bu bəladan əziyyət çəkirlər.Misal üçün onlara: Sələmçilik haramdır,- deyildiyi zaman onlar deyirlər: Sələmçilik deyildikdə filan

şey qəsd edilir.Daha sonra sələmçilik sözünə öz nəfsi istəklərinə uyğun açıqlama gətirir.Hal-hazırda onların kitabları, yazıları və fətvaları vardır ki, onlar orada sələmçiliyi icazəli edirlər.

Onlara: Allah və Peyğəmbər bunu haram etmişlər,- deyildiyi zaman onlar deyirlər: Bu, Allahın və Peyğəmbərin haram etdiyi sələmçilik deyil.Allahın və Peyğəmbərin haram etdiyi sələmçilik, cahiliyyat əhlinin etdiyidir.Bu isə, yalnız çətin durumda olan şəxsin borcuna əlavə etməkdir.Əlavə faiz isə haram deyil.Yaxud deyirlər: Haram olan sələmçilik istehlak sələmçiliyidir.İstismar sələmçiliyi isə mübahdır. Onlar deyirlər: Əlavə faizin haramlığı Quranda qeyd edilmir.

Biz deyirik: Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsində gələn səhih hədislərdə əlavə faiz qeyd edilmişdir. Buxari və Muslimdə gələn hədisdə deyilir: "Qızıl müqabilində qızıl, gümüş müqabilində gümüş, buğda müqabilində buğda, arpa müqabilində arpa, xurma müqabilində xurma və duz müqabilində duz bir-birinin mislində, bərabər səviyyədə və əlbə-əl olur."[209] Bu, əlavə faizdir.Allahın Elçisi (salləllahu aleyhi və səlləm) bunu haram etmişdir.Uca Allah buyurur: *"Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun."*[210] Əlavə

[209] Muslim:1578.Tirmizi:1240.Nəsai:4561.Əhməd:5/314.Dərimi:2579.
[210] əl-Haşr:7.

faiz Uca Allahın ümumi sözlərinə daxildir: *"Sələmi haram etmişdir"*.[211]

Yəhudilər Tövratı, nəsranilər isə İncili təhrif edən şəxslər olmuşlar.Bu arada, öz istəklərini yaxud qeyrisinin istəklərini təmin etmək məqsədilə bu ümmətdən Quran və sunnəni təhrif edən şəxslər tapılmışdır.Müsəlmanın isə Quran və sunnəyə tabe olması gərəkdir.

Yəhudilərin təhrif etmələri: Uca Allah onlara: *"Buranın "qapısından (Allaha) səcdə edən halda "hittə!" ("bizi bağışla!") söyləyərək daxil olun!"*[212],-dediyi zaman onlar bu sözləri təhrif edib: *"Hintə"*, yəni buğda demişlər.Onlar bu sözə bir hərf əlavə etmişlər.

Habelə Allahın sifətlərini təhrif edənlərə: *"Rəhman olan Allah ərşə isteva etdi"*[213],-oxunduğu zaman onlar demişlər: İsteva sözü deyildikdə "İstəulə", yəni hökmü altına aldı qəsd edilir. Onlar yəhudilər kimi bu sözə bir hərf əlavə etmişlər.

Bu, əlavə ilə olan təhrifdir.Habelə əksiltmə ilə olan təhrif və mənada olan təhrif vardır.Axırıncı, Quranı doğru olmayan tərzdə təfsir etməkdir.Habelə hədisləri doğru olmayan tərzdə açıqlamaqdır.Bütün bunlar sözlərin mənalarının təhrif edilməsidir.

---

[211] əl-Bəqərə:275.
[212] əl-Bəqərə:58.
[213] Tahə:5.

# İyirmi yeddinci məsələ

## Batil kitabların yazılması və bunun Allaha nisbət edilməsi

**“Batil kitablar yazmaq və bunu Allaha nisbət etmək.Uca Allah buyurur:** *“Vay o şəxslərin halına ki, öz əlləri ilə kitab yazıb, sonra bir az pul almaqdan ötrü: “Bu, Allah tərəfindəndir!”- deyirlər.”*[214]

**Şərh:**

Yəhudilərin yaramaz işlərindən: Onlar öz əlləri ilə müxtəlif təliflər və kitablar yazıb onu cür-bəcür batil şey-lərlə doldurur daha sonra deyirlər: “Bu, Allah qatındandır.” Onlar bunu etməklə insanlardan mükafat almağı yaxud bu kitabları satıb çoxlu mal-dövlət əldə etməyi güdürlər.Batil kitablar yazıb onu insanlar arasında yaymaq, yəhudilərin və bu ümmətdən onlara oxşayanların peşəsidir.

Alim elmdən bir şey haqqında yazdığı zaman Uca Allahdan qorxub yalnız Quran və sunnəyə uyğun gələn şeyləri yazması gərəkdir.Çünki o, yazdığı şeylərin məsu-liyyətini daşıyır.İnsan yazdığı fətvada yaxud təlif etdiyi kitab və ya məqalədə yalnız Quran və sunnəyə uyğun gələni

[214] əl-Bəqərə:79.

yazmalıdır.İnsan öz xoşluğu və nəfsi istəyi ilə heç bir şey yazıb: Bu, şəriətdəndir yaxud bu, şəriətdir,-deməməlidir.

Günümüzdə İslam adı altında yazılan kitablar yaxud risalələr yaxud batil və azdırıcı fətvalar çərçivəyə salınma-yacaq qədər çoxdur.Bu isə, yəhudilərin əməllərinə bənzəyir.

Bu səbəbdən, kitab yaxud fətva yazmaq istəyən müsəlman Uca Allahın sərhədləri önündə dayanıb Allahdan qorxmalı və insanların xoşuna gəlməsə belə yalnız haqqı yazmalıdır.

# İyirmi səkkizinci məsələ

## Digərlərində olan haqqı rədd etmək

“Onlar yalnız öz tayfalarında olacağı zaman haqqı qəbul edirlər.Uca Allah buyurur: *“Onlar: “Biz özümüzə nazil edilənə iman gətiririk”, -deyirlər.”*[215]

---

**Şərh:**

Onlara: Allahın Muhammədə (salləllahu aleyhi və səlləm) nazil etdiyinə iman edin,-deyildiyi zaman onlar: *“Biz özümüzə nazil edilənə iman gətiririk”, -deyirlər.”*[216] Yəni, Musaya nazil olana iman edirik. *“Ondan başqasına isə küfr edirlər.”*[217] Yəni, digər kitablara. *“Halbuki o, onların əllərində olanı (Tövratı) təsdiq edən bir həqiqətdir.”*[218] Onlar deyirlər: Biz Musa Peyğəmbərə nazil olan Tövrata iman edirik.*“Ondan başqasına isə küfr edirlər.”* Yəni, İsaya nazil olan İncilə və Muhammədə nazil olan Qurana.*“Halbuki o, onların əllərində olanı (Tövratı) təsdiq edən bir həqiqətdir.”* İncil və Quran Tövratda olanı təsdiq edir.

Uca Allah onların sözlərini rədd edib demişdir: Əgər siz Musaya tabe olursunuzsa, necə olur ki, peyğəmbərləri öldü-

---

[215] əl-Bəqərə:91.
[216] əl-Bəqərə:91.
[217] əl-Bəqərə:91.
[218] əl-Bəqərə:91.

rürsünüz? Məgər Musaya peyğəmbərləri öldürmək buyuruğu gəlmişdir? Onlar Zəkəriyyə və Yəhyə peyğəmbəri öldürmüş və İsanı öldürmək əzminə düşmüşlər.Uca Allah isə onu öz dərgahına qaldırmış və onlardan qorumuşdur. Habelə onlar Muhamməmdi ödürmək əzminə düşmüşlər. Onların işi-gücü peyğəmbərləri öldürməkdir.Uca Allah buyurur: *“Hər dəfə sizə ürəyinizə yatmayan bir şey (əmr, buyuruq) gətirən peyğəmbərə təkəbbür göstərmirdinizmi? Məhz buna görə də onların bir qismini təkzib etdiniz, bir qismini isə öldürdünüz.”*[219] Onlar bəzi peyğəmbərləri təkzib etmiş bəzi peyğəmbərləri isə ödürmüşlər.Nə üçün? Çünki o, onların nəfsi istəklərinə xoş gəlməyən şeyləri gətirmişdir.Onlar deyirlər ki, bizə nazil olana iman etmişik.Məgər bu, onlara nazil olana iman etməkdir?

Habelə onlara nazil olan Tövratda Muhamməmdin (salləllahu aleyhi və səlləm) vəsfi, onun risaləti və xüsusiyyətləri bəyan edilmişdir.Nə üçün onlar Muhamməmdə (salləllahu aleyhi və səlləm) iman gətirməmişlər? Muhamməmdə (salləllahu aleyhi və səlləm) iman, onlara nazil olana iman etmək anlamına gəlir. Onlar isə onu inkar etmişlər.Onlar deyirlər: *Biz özümüzə nazil edilənə iman gətiririk”.*

Habelə bu, növbəti sözləri deyəni şamil edir: “Mən yalnız filan alimə tabe oluram.” Əslində isə onun haqqı qəbul etməsi və heç bir imama yaxud müəllimə yaxud şeyxə təəssübkeşlik etməməsi gərəkdir.Misal üçün təriqətlərin şeyxlərinə olan təəssübkeşliyi göstərmək olar.Onların

[219] əl-Bəqərə:87.

müridləri və ardıcılları onlara tabe olur və yalnız onların dedikləri haqqı qəbul edirlər. Bu isə batil işdir.Çünki Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) savayı hər hansı müəyyən şəxsə tabe olmaq vacib iş deyil. Əgər biri: Peyğəmbərdən savayı müəyyən bir şəxsə tabe olmaq vacibdir,-deyərsə mürtəd olub İslamdan çıxar.Daha sonra o, tövbəyə dəvət edilər.Əgər tövbə etməzsə qətlə yetirilər. Şeyxul-İslam ibn Teymiyyə (rahiməhullah) məhz bu cür qeyd etmişdir. Çünki bunu deyən şəxs filan şəxsi Peyğəmbərlə (salləllahu aleyhi və səlləm) bir müstəviyə qoyur.

Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) başqa heç bir şəxsə tabe olmaq vacib deyil.Alimlər və imamlara gəldikdə isə, onlar haqqa müvafiq gəldikləri zaman insanlar onlara tabe olurlar. Alim ictihad edib xəta etdiyi zaman isə, imamlardan biri olsa belə onun sözünü götürmək icazəli deyil.Onlar özləri bunu deyirlər.Onlar deyirlər: Ancaq Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözlərinə uyğun gələn sözlərimizi götürün!

# İyirmi doqquzuncu məsələ

## Onlar tabe olduqlarını iddia etdikləri şəxslərin sözlərinə əməl etmirlər

“Bununla birgə onlar öz tayfalarının sözlərinə əməl etmirlər.Uca Allah buyurur: *“Onlara söylə: “Əgər siz iman edən kəslərsinizsə, bəs nə üçün əvvəllər Allahın peyğəmbərlərini öldürürdünüz?”.*[220]

Şərh:

Yəni, bu yəhudilər onlara Tövratda nazil olana tabe olduqlarını iddia edirlər.Bunu iki məsələ təkzib edir:

Birinci: Onlar peyğəmbərləri öldürürlər.Tövratda peyğəmbərləri öldürmək buyuruğu yoxdur.Əksinə orada onlara iman gətirmək, onları yüksək tutmaq və onlara tabe olub onların izlərinə düşmək buyuruğu gəlir.

İkinci: Tövrat Muhamməde (salləllahu aleyhi və səlləm) tabe olmağı əmr edir. *“O kəslərə ki, əllərindəki Tövratda və İncildə (adını, vəsfini və əlamətlərini) yazılmış gördükləri rəsulaümmi peyğəmbərə tabe olurlar, (O Peyğəmbər) onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər, təmiz nemətləri halal, murdar şeyləri haram edər, onların ağır yükünü*

[220] əl-Bəqərə:91.

*yüngülləşdirər və üstlərindəki buxovları açar."*[221] Bu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) Tövratda olan vəsfidir.Onlar nə ona iman gətirmiş nə də ki, iman gətirdiklərini iddia etdikləri peyğəmbərlərin və alimlərin sözlərini deyib onların dediklərinə əməl etməmişlər.

[221] əl-Əraf:157.

# Otuzuncu məsələ

## Parçalanmanı seçib vəhdəti tərk etmək

“Bu, Allahın müdhiş ayələrindəndir.Onlar Allahın bir olmaq haqqında tövsiyəsini tərk edib onlara yasaq olan parçalanmanı seçmişlər.Nəticədə onlardan hər bir dəstə sahib olduğuna sevinmişlər.”

**Şərh:**

Uca Allahın müdhiş ayələrindən: Onlar Allahın kitabı və peyğəmbərlərə nazil edilən şəriət ətrafında vahid olmağı və ona sarılmağı tərk etdikləri zaman Allah onları təfriqəçilik, parçalanma, qarşılıqlı ədavət və sahib olduqları batilə sevinc bəlasına düçar etmişdir.Bu, onlara verilən cəzadır.Çünki insan batildən ötrü sevinəcəyi zaman onu tərk etməyəcək. Lakin əgər insan buna sevinməz və ona şübhə ilə yanaşarsa onun tövbə edib qayıtmaq ehtimalı böyük olar.Ancaq insan batilə inanacağı və ondan ötrü sevinəcəyi zaman ondan dönməyəcək.Bu, Uca Allahdan olan bir cəzadır.Çünki əgər biri haqqı tərk edərsə batil ilə sınağa çəkilər.Habelə əgər biri vəhdəti tərk edərsə parçalanma, təfriqəçilik, çəkişmə və qarşılıqlı ədavət bəlasına düşər.Din və dünya işlərində öz aralarında ixtilaf edən insanların mütləq bir-birinə ədavət, və nifrət etdiklərini görə bilərsən.Bəzən bu, onların arasında savaşa yol açır.Habelə Quran və sunnədən tutunub bir olan

toplumun arasında mütləq rəğbət, sevgi, qarşılıqlı yardım və dəstəyin olduğuna rast gələ bilərsən.Onlar sanki bir bədəndirlər.Bu səbəbdən, insanlar yalnız Quran və sunnə-nin ətrafında birləşməklə salamat qala bilərlər.Vəhdət isə yalnız Quran və sunnəyə tabe olmaqdadır.Bundan savayı olan isə təfriqəçilik və əzabdır.

Özlərinin dedikləri kimi müsəlmanların birliyini istəyən bu adamlara deyiləcək: Əgər siz müsəlmanların birliyini istəyirsinizsə əqidəni bir edin.Əgər siz müsəlmanların vəhdətini və birliyini istəyirsinizsə belə olan halda hamı-lıqla Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi tövhid əqidəsində olun və insanları başlı-başına buraxmayın. Bu, qəbirə sitayiş edəndir, bu, sufidir, bu, şiədir. İlk öncə əqidəni bir edin və "lə iləhə illəllah" kəlməsinə sarılın.Daha sonra Allahın nazil etdiyi hökmü bir edin və müxtəlif qanunları, quruluşları, qəbiləçilik adətlərini və.s şeyləri kənara qoyun.Allahın kitabına və sunnəyə dönün! Müsəlmanlar ancaq bunun üzərində birləşə bilərlər.Bir əqidə və bir mənbə.Bu isə Allahın nazil etdiyi hökm və bir olan başçılıqdır.Bu isə müsəlmanların əmr sahibinə eşidib itaət etməklə olur.Müsəlmanları birləşdirən amil məhz budur.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Uca Allah sizin üçün üç şeyi bəyənmişdir: Ona ibadət edib Ona heç bir şeyi şərik qoşmamağınızı, Allahın ipindən hamılıqla

möhkəm yapışmağınızı və Allahın sizin üzərinizə təyin etdiyi əmr sahiblərinə nəsihət etməyinizi!”.[222]

[222] Muslim:1715.Əhməd:2/367.

# Otuz birinci məsələ

## Haqq dinə düşmənçilik etmək və batil dini sevmək

“Bu, həmçinin Onun müdhiş ayələrindəndir.Onlar mənsub olduqları dinə son dərəcə ədavət bəsləmiş, eyni zamanda onlara və onların peyğəmbəri və dəstəsinə ədavət bəsləyən kafirlərin dininə son dərəcə sevgi göstərmişlər. Buna misal olaraq, Peyğəmbər (salləllahu aleyhi və sələm) onlara Musanın (aleyhi-s-sələm) dinini gətirdiyi zaman onlar sehr kitablarına tabe olmuşlar.Bu isə, firon əyanının dinidir.”

Şərh:

Peyğəmbərin müxalif olduğu cahiliyyat əhlinin məsələlərindən: Onlar tabe olmağa əmr olunduqları dinə ədavət bəsləmiş və düşmənlərinin dininə tabe olmuşlar. Məlum olduğu kimi yəhudilər Musanın (aleyhi-s-sələm) dini üzərə olmuşlar.Onların düşmənləri isə onlara ən ağır əzab verən, onların övladlarını öldürən, onların qadınlarını sağ buraxıb onları ən alçaq işlərdə işlədən firon və onun ətrafı olmuşlar.Nəhayət Uca Allah peyğəmbəri və kəlimi Musanı (aleyhi-s-sələm) göndərmişdir.Uca Allah onun əli ilə onları düşmənlərindən qurtarıb onları izzətli və şərəfli etmiş, onların düşmənlərini isə onların gözü önündə rəzil edib dənizdə

batırmışdır.Bununla da, onları sevindirmişdir. Uca Allahın Musaya verdiyi kitabda, onların əllərində olan Tövratda Muhammədin (salləllahu aleyhi və səlləm) vəsfləri və ona tabe olmaq əmri gəlmişdir.Bu vəsflər: *“O kəslərə ki, əllərindəki Tövratda və İncildə (adını, vəsfini və əlamətlərini) yazılmış gördükləri rəsula-ümmi peyğəmbərə tabe olurlar, (O Peyğəmbər) onlara yaxşı işlər görməyi buyurar, pis işləri qadağan edər, təmiz nemətləri halal, murdar şeyləri haram edər, onların ağır yükünü yüngülləşdirər və üstlərindəki buxovları açar.”*[223] Buna səbəb, onların özlərinə çətinləşdirməsi olmuşdur.Məhz bu üzdən Uca Allah onlara çətinləşdirmiş və onların küfrü və inadkarlığı səbəbilə onlara halal edilmiş pak şeyləri haram etmişdir. Əgər onlar Muhammədə (salləllahu aleyhi və səlləm) iman etsəydilər Allah onların ağır yükünü yüngülləşdirər və üstlərindəki buxovları açardı. Lakin onlar həsəd aparıb demişlər: Axır zamanda gəlişi vəd olunan bu peyğəmbərin ərəblər və İsmail oğullarından olması necə ola bilər? Onun İsmail oğullarından deyil İsrail oğullarından olması daha münasib olardı.Məhz bu cür demişlər.Onlar Muhammədə və onun ümmətinə həsəd aparıb ona küfr etmişlər.Ancaq onlar onun Allahın Elçisi olduğunu bilirdilər.Onları buna sövq edən amil həsəd və təkəbbürlük olmuşdur.Allah bizi ondan qorusun!

Onlar Muhammədə küfr etdikləri zaman Musaya, onun gətirdiyi kitaba küfr etdikləri zaman isə Tövrata küfr etmişlər.Onlar Muhammədə olan həsəddən ötrü sahib

[223] əl-Əraf:157.

olduqları Tövrata küfr edib Tövratı onların düşməni fionun dini olan sehr kitablarına dəyişmişlər.Çünki sehr fironun tayfasında geniş yayılmışdır.Onlar nazil edilmiş vəhyi tərk edib düşmənlərinin dini olan sehri almışlar.Bu, qəribə işlərdəndir.Uca Allah buyurur: *“Allah tərəfindən onlara əllərindəkini (Tövratı) təsdiq edən bir peyğəmbər gəldikdə kitab verilənlərdən bir qismi guya bilmirmiş kimi, Allahın kitabına arxa çevirdi.”*[224] Bu, həmin peyğəmbər, onun vəsfləri və onun gətirdiyi dindir.Onlar lovğalıq və inadkarlıq üzündən heç bir bilgisi olmayan cahillərin əməlini etmişlər.Uca Allah: Çünki onlar bilmirlər,- deməmişdir.O, demişdir: “*Guya bilmirmiş kimi*”.[225] Çünki bilən öz biliyinə əsasən əməl etməyəcəyi zaman sanki bilmirmiş kimi olacaq.Çünki elmin səmərəsi əməldir.Əməl etməyəcəyi zaman o və cahil insan bərabər olacaqlar.Üstəlik cahil birisi günah baxımından ondan daha yüngül olacaq. *“(Yəhudilər) Süleymanın səltənətinə dair şeytanların oxuduqlarına uydular.”* [226] Yəni, sehrə uydular.

Sehrin kökü, onun şeytanların əməli olmasıdır.Daha sonra müxtəlif zamanlarda kafirlər onu bir-birinə ötürmüşlər.Habelə firon və onun tayfası ona varis olmuşlar. Habelə yahudilər Tövratın əvəzinə ona varis olmuşlar.Sehr qədimdir.Lakin kafirlər onu nəsil-bənəsil biri-birinə ötürmüşlər.

---

[224] əl-Bəqərə:101.
[225] əl-Bəqərə:101.
[226] əl-Bəqərə:102.

Bu, bir cəzadır.İnsan haqqı tərk edəcəyi zaman batil ilə sınağa çəkiləcək.Bu, dəyişmək bilməyən bir qanundur.Bəzi müsəlmanlar Allahın kitabı və Peyğəmbərin sunnəsini tərk edib insanların sözlərini qapmışlar.Onlar məntiq elmini və kəlam elmini mənimsəmişlər.Onlar Uca Allahın kitabı və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsini tərk edib bu şeyləri mənimsədikləri zaman eyni qəbildən olan insanlara çevrilmişlər.Çünki onlar Allahın kitabı və Peyğəmbərin sunnəsindən üz çevirdikləri və əqidələrini Quran və sunnədən almadıqları zaman əqidəni kafirlərin və dinsizlərin elmlərindən almaq bəlasına düçar olmuşlar.

Haqqı tərk edən hər bir şəxsi bu cür aqibət gözləyir.Həmin şəxs batil ilə sınağa çəkiləcək.Hər kim Əhli sunnə vəl cəmaatın məzhəbini tərk edərsə zəlalət firqələrinin məzhəbləri ilə sınağa çəkilər.Habelə Quran və sunnəyə, habelə Əhli sunnə vəl cəmaatın mənhəcinə müxalif olan zəlalət camaatları ilə birgə dəstələr quran şəxslər zəlalət firqələrinin sırasına düşmək bəlasına düçar olar.Bu, Uca Allahın qoyduğu qanundur.Bu amil müsəlmanı haqqı tərk etməkdən çəkindirir.Çünki insan haqqı tərk edəcəyi zaman batil ilə sınağa çəkiləcək.İnsan haqq əhlinə tabeçiliyi tərk edəcəyi zaman batil əhlinə tabe olacaq.Bu, həmişə belə olub.

# Otuz ikinci məsələ

## Haqq onların xoşlarına gəlmədiyi insanlarda olduqda ona küfr edirlər

"Xoşlarına gəlməyən insanlarda olacağı zaman haqqa küfr edirlər.Uca Allah buyurur: *"Yəhudilər dedilər: "Nəsranilər bir şeyə istinad etmirlər". Nəsranilər də: "Yəhudilər bir şeyə istinad etmirlər", -söylədilər."*[227]

**Şərh:**

Bu, ən ciddi məsələlərdən biridir: Onların xoşlarına gəlməyən insanlarda olacağı zaman haqqa küfr etmələri. Onlar həmin insanlarda olan haqqı onlardan xoşlamadıqlarına görə tərk edirlər.

Müsəlmanın haradan gəlməsindən asılı olmayaraq haqqı qəbul etməsi gərəkdir.Çünki haqq möminin itirdiyi şeydir. Onu harada taparsa alacaq.Onu dostu yaxud düşmənindən alacaq.Çünki o, haqqı axtarır.Ancaq insan yalnız şəxslər etibarı ilə haqqı qəbul edəcəyi zaman bu, cahiliyyat əhlinin dini olacaq.

Buna misal, Uca Allahın yəhudi və nəsranilər haqqında xəbər veridiyidir.Onlar isə kitab və elm əhlidir.Yəhudilər

[227] əl-Bəqərə:113.

nəsranilərdə olan haqqı rədd etmişlər.Nəsranilər isə yəhudilərdə olan haqqı rədd etmişlər.Uca Allah onlar haqda buyurur: *“Yəhudilər dedilər: “Nəsranilər bir şeyə istinad etmirlər”. Nəsranilər də: “Yəhudilər bir şeyə istinad etmirlər”, -söylədilər.”*[228] Onları buna nəfsi istəklər sövq etmişdir. Yəhudilər nəsranilərə nifrət etdikləri zaman onlarda olan haqqı danmışlar.Habelə nəsranilər yəhudilərə nifrət etdikləri zaman onlarda olan haqqı danmışlar. *“Halbuki onların hər ikisi kitab oxuyur.”*[229] Onlara haqqı qəbul etməyi əmr edən kitabı oxuyurlar. *“Bilməyənlər də onlar kimi danışdılar.”*[230] Heç bir kitaba sahib olmayanlar eyni üslubla hərəkət etmişlər.Hər tayfa digərini təkfir edir və onlarda olan haqqı danır.

Bir sözlə, müsəlmanın yəhudi və nəsranilərin sunnəsindən kənar durması vacibdir.Bu isə, sevmədiyi birisi ilə olacağı zaman haqqa küfr etməkdir.Bir şəxsdən xoşlanmamağın səni onda olan haqqı rədd etməyə sövq etməsin! Lakin bu hal-hazırda mövcuddur.Bir dəstə yaxud bir camaat alimlərdən birindən xoşlanmadığı zaman onda olan haqqı rədd edirlər.Onların həmin alimdən xoşlanmamaları, onları onda olan haqqı qəbul etməməyə, onu diqqətsiz qoymağa, onu tərk etməyə və onun kitabları və yazılı dərslərindən çəkindirməyə sövq edir.Bu nə üçün baş verir? Onların həmin şəxsi sevməmələrindən ötrü.

---

[228] əl-Bəqərə:113.
[229] əl-Bəqərə:113.
[230] əl-Bəqərə:113.

Ey müsəlman! Sənin sevməyəcəyin şəxsdə olarsa belə haqqı qəbul etməyin gərəkdir.Şəxsi düşmənçilik və nəfsi istəklər haqqı qəbul etməyə mane olmamalıdır.

Bir yəhudi Peyğəmbərin (salləllahu aleyhi və səlləm) hüzuruna gəldiyi zaman demişdir: Siz şərik qoşursunuz.Siz deyirsiniz: "Allah və Muhamməd istəsə!".Peyğəmbər (salləllahu aleyhi və səlləm) isə onlara "Yalnız Allah istəsə!"[231] demələrini əmr etmişdir. Onlara: Allah və Muhamməd istəsə,-demələrini qadağan etmişdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) bu haqqı qəbul etmiş və əshabına həmin xətanı tərk etməyi əmr etmişdir.

Habelə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) hüzuruna yəhudi başbilənlərindən biri gəlib demişdir: "Allah göyləri sağ əlində bükəcək və dağları bir barmağına yerləri isə bir barmağına qoyacaq."[232] Peyğəmbər (salləllahu aleyhi və səlləm), həmin xəbərə təsdiq olaraq arxa dişləri görünənəcən gülümsədi.[233]Uca Allah bu ayələri nazil etdi: *"Allahı lazımınca qiymətləndirmədilər. Halbuki qiyamət günü yer bütünlüklə Onun ovcunun içində olacaq, göylər isə Onun sağ əli ilə büküləcəkdir. (Allah müşriklərin Ona) aid etdikləri sifətlərdən tamamilə uzaq və ucadır!".*[234] Yəhudi aliminin sözü haqqa uyğun gəldiyi zaman Peyğəmbər (salləllahu aleyhi və səlləm) bunu qəbul etdi və buna sevindi.

Bir sözlə müsəlmanın haqqı qəbul etməsi vacibdir. Onun şəxsi düşmənçiliyi, şəxsi marağları, habelə bəzi haqq

---

[231] Əhməd:1/214.

[232] Buxari:4533.Muslim:2786.Tirmizi:3238.Əhməd:1/378.

[233] Buxari:4811,7414,7315.Muslim:2786.

[234] əz-Zumər:67.

əhli barəsində gəzən şayələr onu həmin alimin sözünü rədd etməyə sövq etməməlidir.Əksinə insan bundan faydalanmalıdır.Hətta əgər həmin alim doğru səmtdə olmayacağı və onun haqqında deyilən tənqidlər və pis fikirlər doğru olacağı halda belə o, haqqı rədd etməməlidir.O, haqqı deyəcəyi zaman onu qəbul etmək vacib olacaq.Bunu şəxsdən ötrü deyil haqqdan ötrü etmək lazımdır.Vacib olanda məhz budur.Elm tələbələrinə bu rəbbani yoldan tutunmaq vacibdir.Haqqı, harada olmasından asılı olmayaraq qəbul etmək.

# Otuz üçüncü məsələ

## Onlar iqrar və inkar məsələsində ziddiyətə düşmüşlər

“Onlar dinlərindən olduğunu iqrar etdikləri şeyləri inkar etmişlər.Buna misal, onların Kəbəni həcc etməyə dair hərəkətidir. Uca Allah buyurur: *“Özünü səfehliyə qoyanlardan başqa kim İbrahimin dinindən üz çevirər?”.*[235]

Şərh:

Yəhudilər İbrahimin dini üzərində olduqlarını iddia edirlər.Lakin qiblə İbrahimin tikdiyi Kəbəyə tərəf yönəldiyi zaman onlar bunu sərt şəkildə rədd etmişlər.Çünki onlar Kəbəni və İbrahimin dinindən olan həcci qəbul etmir və qibləyə yönəlməni inkar edirlər.Onlar bunun haqq olduğunu, Kəbənin İbrahimin qibləsi olduğunu, habelə Kəbəni inşa edənin İbrahim olduğunu və İbrahimin onu Allahın əmri ilə tikdiyini bilirlər.Uca Allah buyurur: *“Yadına sal ki, o zaman İbrahimə Kəbənin yerini bildirib...”.*[236] Habelə buyurur: *“Onu da yadına sal ki, İbrahim və İsmail evin (Kəbənin) bünövrəsini ucaltdıqları zaman...”.*[237] Bununla

[235] əl-Bəqərə:130.
[236] əl-Həcc:26.
[237] əl-Bəqərə:127.

da, Kəbə Allahın əmri ilə İbrahimin inşa etdiyi tikili olmuşdur.Kəbə onun qibləsidir.Onlar isə bunu inkar edirlər. Habelə həcc, İbrahimin dinindəndir.Onlar isə bunu inkar edirlər.Bununla birgə onlar İbrahimin dini üzərində olduqlarını iddia edirlər.Lakin onların Muhamməddə (salləl-lahu aleyhi və səlləm) olan nifrəti onları bütün bu şeyləri inkar etməyə sövq etmişdir.

Kəbə və namazda ona tərəf yönəlmək, İbrahimin buraxdığı bir mirasdır.Həcc və ümrə üçün onu ziyarət etmək İbrahimin dinindən olan bir əməldir.Bunlar İbrahimin dininə mənsub olur, eyni zamanda həmin dinin ən əzəmətli ayinlərini inkar edirlər.Bu, qəribə bir ziddiyətdir.

Habelə İslama mənsub olub onun bəzi əhkamlarını rədd edən hər bir şəxs onların mislindədir.Onlardan bəzisi deyirlər: Mən müsəlmanam.Daha sonra qəbirləri təvaf edir, qəbirdə olanlara dua edir, onlarla təbərrük edir və qəbirlərə tapınır.Həmin adama: Bu, şirkdir,-deyildiyi zaman o, bundan əl çəkmir üstəlik davamiyyətli şəkildə bunu edib bu əməli ona yasaq edənlərə nifrət bəsləyir.Bu, mənsubiyyətdə olan ziddiyətdir.Çünki insan İslama mənsub olur və həmin dinin ən əzəmətli şüarı olan tövhiddə ona müxalif olur.

# Otuz dördüncü məsələ

## Hər firqə yalnız özünü təmizə çıxarır

**“Hər firqə** özünün nicat tapmış firqə olduğunu iddia edir.Uca Allah onların sözlə**rini təkzib edərək buyurur**: ***“Onlara söylə:*** *Əgər doğru deyirsinizsə,* ***dəlilinizi gətirin!”.***[238] Daha sonra Uca Allah doğru olanı **bəyan edərək buyurur**: ***“****Əksinə, yaxşı işlə****r görüb özlərini Allaha təslim edənlərin R****əbbi yanında mükafatı vardır.”*[239]

---

**Şərh**:

**Cahiliyyat məsələlərindən: Onlardan hər dəstə məhz özlərinin haqq üzərə** olduğunu, qeyrilə**rinin isə batil üzərə** olduqlarını iddia edir.Bu, yə**hudi, nəsrani və onlara bənzəyənl**ərin halıdır: ***“Dedilər: “Cənnətə yəhudilərdən və nəsranilərd****ən başqası girmə****yəcək!”.***[240] **Onlar hidayəti və cənnətə** daxil olmanı **yəhudi və nəsranilər üçün xüsusi** etmişlə**r.**

**Zəlalət firqə**ləri onların mislində**dir.Hər firqə məhz özlərinin haqq üzərə** olduqlarını, qeyrilə**rinin isə batil üzərə** olduqlarını iddia edir.Hə**r firqə** Peyğə**mbərin (salləllahu aleyhi və səlləm) xəb**ər verdiyi nicat tapmış firqə **ol**duğunu iddia edir:

---

[238] **əl-Bəqərə:111.**
[239] **əl-Bəqərə:112.**
[240] **əl-Bəqərə:111.**

"Ümmətim yetmiş üç firqəyə bölünəcək.Onların hamısı cəhənnəmlikdir, yalnız birindən savayı".Lakin Peyğəmbər (salləllahu aleyhi və salləm) həmin firqənin, onu digər firqələrdən ayıran əlamətini qeyd etmişdir: "Onlar dedilər: Ey Allahın Elçisi hansıdır o? O, dedi: Mənim və mənim səhabələrimin yolunda olandır."[241]

Bu səbəbdən, Uca Allah buyurur: *"Onlara söylə: Əgər doğru deyirsinizsə, dəlilinizi gətirin!"*.[242].Yəni, cənnətə yalnız yəhudi yaxud nəsranilərin girəcəyinə dair dediyiniz sözə dəlilinizi gətirin.Çünki bu, iddiadır.İddia isə yalnız dəlillə qəbul olunur.Buna görə də ardından demişdir: *"Əksinə, yaxşı işlər görüb özlərini Allaha təslim edənlərin Rəbbi yanında mükafatı vardır."*[243] "*yaxşı işlər görüb*". Yəni, Peyğəmbərə (salləllahu aleyhi və salləm) tabe olandır.Əgər bir insanda bu şərtlər mövcud olarsa o, cənnət əhlindən olar.Əgər birində bu iki şərt yaxud onlardan biri pozularsa o, cənnət əhlindən olduğunu iddia etsə belə atəş əhlindən olar.

Uca Allah buyurur: "*Özlərini Allaha təslim edənlərin*". Hər kim bu doğru yol üzərə olarsa nicat tapmış firqədən olar.Çünki Peyğəmbər (salləllahu aleyhi və salləm) demişdir: "Mənim və mənim səhabələrimin yolunda olandır." Bu, sunnədən olan bir əsasdır.Qeyd olunan ayə isə Qurandan olan bir əsasdır.Əgər biri cənnəti istəyirsə Allaha təslim

[241] Tirmizi:2641.
[242] əl-Bəqərə:111.
[243] əl-Bəqərə:112.

**olsun və əməlini sunnə üzərində düzəltsin.Habelə Allahın ona dair heç bir dəlil nazil etmədiyi bidətlər və yeniliklərdən yan dursun.**

# Otuz beşinci məsələ

## Onlar haram işlərlə Allaha yaxınlaşırlar

“Onlar övrət yerlərini açmaqla Allaha yaxınlaşırlar.Uca Allah buyurur: *“Fahiş iş etdikləri zaman: “Atalarımızı belə gördük. Bunu bizə Allah əmr etmişdir”, - deyirlər.”*[244]

---

**Şərh:**

Cahiliyyat əhli təvaf zamanı övrət yerlərini açmaqla Allaha yaxınlaşırdılar.Şeytan onlara əməllərini gözəlləşdirmişdir.Belə ki, Həram əhlindən olmayan insanlar uzaqdan gəldikləri zaman onlar üzərində olan patlarda Hərama girmirdilər.Çünki onlar həmin paltarda günahlar edib Allaha asi olmuşlar.Əgər Həram əhlindən biri onlara geyinib təvaf etmək üçün paltar verməsəydi onlar Həramın girəcəyində öz paltarlarını soyunub ora çılpaq vəziyyətdə daxil olardılar.Şeytan məhz bu cür onlara bu əməli gözəlləşdirmişdir.Onlar bu fahiş işi gördükləri zaman demişlər: Biz, ata-babamızı bu yol üzərə gördük. ”*Bunu bizə Allah əmr etmişdir*”.

Diqqət yetirin! Uca Allahın övrət yerinin açılmasını fahiş iş adlandırır.Zamanımızda olan bir çox insanlar isə bunu inkişaf və mədəniyyət hesab edirlər.

---

[244] əl-Əraf:28.

Daha sonra Allah onların sözünü rədd edərək buyurur: *“De: Allah fahiş işlər əmr etməz. Allaha qarşı bilmədiyiniz şeyimi deyirsiniz?”.*[245] Yəni, Allah qullarına övrət yerlərinin açılmasını əmr etmir.O, yalnız onlara övrət yerlərini örtməyi əmr etmişdir. Çünki insan bunu etməklə fitnədən uzaqlaşır və əxlaqi cinayətlərə düşməkdən qorunur.Onlar Allahın adından yalan danışıb Onun haqqında elmsiz söz söyləmişlər.Onlar buna iki batil dəlil gətirmişlər.Onlardan hər biri digərindən daha batildir.Birinci: “*Atalarımızı belə gördük.*” İkinci isə daha çirkin və böyükdür: “*Bunu bizə Allah əmr etmişdir*”.Onlar Allahın adından yalan danış-mışlar.Uca Allah onların sözünü rədd edərək demişdir. *“De: Allah fahiş işlər əmr etməz. Allaha qarşı bilmədiyiniz şeyimi deyirsiniz?”.*Allahın adından elmsiz söz danışmaq çox təhlükəli bir cinayətdir.

Daha sonra Uca Allah qadağan etdiyi şeyləri bəyab edərək buyurur: *“De: Rəbbim yalnız aşkar və gizli fahiş işləri”.*Fahiş iş: Çirkinlikdə son həddə çatmış günahdır.Bu günahlardan biri də, övrət yerini açmaqdır. ”*Aşkar*”, insanların gözü önündə olan. ” *Gizli*”, insanın gizlində etdiyi və özü ilə Allah arasında olan. ”*Allahın haqqında heç bir dəlil nazil etmədiyi hər hansı bir şeyi Ona şərik qoşmağınızı*”. Uca Allah qəti olaraq müşriklər üçün heç bir dəlil və sübut endirməmişdir.Uca Allaha yalnız tövhid üçün dəlil endirmişdir.Şirkə gəldikdə isə, Uca Allah onu qadağan etmişdir. ”*Və Allaha qarşı bilmədiyiniz şeyləri deməyinizi*

[245] əl-Əraf:28.

*haram buyurmuşdur.*"[246] Allahın adından elmsiz söz demək şirkdən daha böyük günahdır.Onların Allahın adından elmsiz dedikləri sözlərdən biri də: "Övrət yerlərini açmağı bizə Allah əmr etmişdir",-söyləmələridir. Bu səbəbdən, Uca Allahın kitabında və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsində dəlil olmadan hər hansı bir şeyin halal yaxud haram olduğunu demək çox təhlükəlidir.

Nəhayət Uca Allah buyurur: *"Ey Adəm oğulları! Hər ibadət vaxtı gözəl libaslarınızı geyin".*[247] Yəni, hər namaz vaxtı övrət yerlərinizi örtün.Habelə Kəbəni təvaf etmək ora daxildir.

Bir sözlə, cahiliyyat əhli Allaha övrət yerlərini açmaqla yaxınlaşır və bunu Allaha ibadət hesab edirdilər.Bu isə ən çirkin yalan və böhtandır.Biz bu məsələdən, zərurət müstəsna olmaqla mütləq şəkildə övrət yerini açmağın haram olduğunu anlayırıq.Müalicə kimi zəruri hal yaxud ər ilə arvad arasında olan münasibətlər müstəsnadır.Bu iki haldan savayı olan hallarda övrət yerlərini açmaq sərt şəkildə haram edilmişdir.Çünki bu, fahiş işlərə və cinayət etməyə sürükləyən bir amildir.Şeytan çılpaqlığın zina və livata sürüklədiyini gözəl bilir.Məhz bu səbəbdən, o, insanları övrətlərini açmağa təşviq etmiş və bunu müasirlik, mədəniyyət və inkişaf adlandırmışdır.Habelə o, örtünməyi və abırlı libas taxmağı eybəcər surətdə göstərib demişdir: Bu işlər geridə qalma və köhnə adətlərdir.

[246] əl-Əraf:33.
[247] əl-Əraf:31.

Hal-hazırda hicab barədə və onun tərk edilməsi haqqında deyilənlərə diqqət yetirin! Qazetlər, jurnallar, yığıncaqlar və digər yerlərdə hicab taxan qadınların məsxərəyə qoyulması məlum və çox rats gəlinən bir təzahürdür.Lakin iman əhli öz dinlərindən tutunacaqları zaman bütün bu şeylər onlara zərrə qədər belə zərər verməyəcək.

# Otuz altıncı məsələ

## Onlar halalı haram, haramı isə halal etməklə Allaha yaxınlaşırlar

“Halalı haram etməklə Allaha yaxınlaşmaq.Buna misal, onların şirk vasitəsilə Allaha yaxınlaşmalarıdır.”

---

Şərh:

Cahiliyyat məsələlərindən: Onlar Allahın vacib etdiyi şeyləri haram etməklə Allaha yaxınlaşmışlar.Müşriklər haqqında öncə qeyd olunduğu kimi onlar təvafda övrət yerlərini örtməyi haram etmişlər.

Habelə yəhudi və nəsranilər.Nəsranilər bir çox pak şeyləri özlərinə haram etmişlər.Yəhudilərə haqsız olaraq insanların mallarını yemək yasaq edildiyi bir halda onlar faiz və sələmçilik kimi Allahın haram etdiyi bir çox şeyləri özlərinə halal etmişlər.Müşriklər həmçinin bir neçə növ davar hevanlarını haram etmişlər.Onlar həmin heyvanları müxtəlif adlarla çağırır və həmin heyvanları bütlər üçün haram edirdilər.Uca Allah möminlərə bunu qadağan edib buyurur: *“Ey iman gətirənlər! Allahın sizə halal buyurduğu pak nemətləri haram etməyin və həddi aşmayın. Doğrudan da, Allah həddi aşanları sevməz!”.*[248] Mömin Allahın halal etdiyini haram etməklə həddi aşmamalı, eyni zamanda

[248] əl-Maidə:87.

etinasızlıq göstərib haramları halal etməməlidir.Mömin mötədil olmalıdır.Halalı haram etmək, haramı isə halal etmək cahiliyyat əhlinin dinidir.İnsan yalnız Allahın kitabından olan dəlilə əsasən bir şeyi halal yaxud haram edə bilər.İnsan bunun, nəsranilərdə rəhbanilik yaxud müşriklərdə Kəbəni çılpaq təvad etmək kimi Allaha yaxınlaşdıran amil olduğunu hesab edəcəyi zaman Allahın buyurmadığı şəkildə Ona yaxınlıq axtarmış olacaq və Allaha asilik və günahla yaxınlaşmış olacaq.Habelə bu Allahın izn vermədiyi bir din ixtira etmək anlamına gəlir.

Məsələ çox təhlükəlidir.Cahiliyyat əhlinin şirk vasitəsilə Allaha yaxınlaşmaları daha acınacaqlı haldır.Bu, qədim zamanlarda olmuş və hal-hazırda da vardır.Qəbirləri təvaf edənlər, ona qurban kəsənlər və nəzr edənlər deyirlər: Bu, Allaha yaxınlaşmaqdır. “*Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!.*”[249] “*Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!*”.[250] Bu, ilk müşriklərin, habelə İslama nisbət olunan müasir müşriklərin əməlidir.Onlar deyirlər: Bu, Uca Allaha saleh insanlar vasitəsilə yaxınlaşmaqdır.Onlar deyirlər: Bunlar bizim şəfaətçilərimizdir.Onlar bizi Allaha yaxınlaşdırırlar.

---

[249] əz-Zumər:3.
[250] Yunus:18.

## Otuz yeddinci məsələ

## Onlar alimləri və rahibləri Allahdan savayı özlərinə rəbblər seçmişlər

**"Alimləri və rahibləri Allahdan savayı rəbblər etmək vasitəsilə yaxınlaşmaq."**

## Şərh:

Uca Allah yəhudi və nəsranilər haqqında buyurur: *"Onlar Allahı qoyub alimlərini və rahiblərini, Məryəm oğlu Məsihi özlərinə rəbblər qəbul etdilər. Halbuki onlara ancaq bir olan Allaha ibadət etmək əmr olunmuşdu."*[251] Rahiblər, abidlərdir. Yəhudi və nəsranilər Uca Allaha asilik olan işlərdə alimlərə və rahiblərə tabe olmaqla Allaha ibadət edirdilər.Belə ki, həmin alimlər və rahiblər onlara Allahın halal etdiyi şeyləri haram, haram etdiyi şeyləri isə halal edir onlar isə həmin adamlara itaət edir və bunun ibadət olduğunu sanırdılar. Onlar deyirdilər: Alimlərə itaət etmək vacibdir.Biz isə deyirik: Onlara itaət yalnız onlar Allaha itaət edəcəkləri zaman vacib olur.Allaha müxalif olan işlərdə isə itaət yoxdur. Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Yaradana asilikdə məxluqa itaət yoxdur."[252] Hətta əgər

[251] ət-Təubə:31.
[252] Muslim:1840.Nəsai:4205.Əbu Davud:2625.Əhməd:1/131.

onlar insanların ən zahid alimləri və abdiləri olasalar belə Allaha asilikdə onlara itaət etmək olmaz.

Onlar haqq üzərə olmayacaqları təqdirdə bizim onlara tabe olmağımız icazəli deyil.Əgər biri, onların Allahın haram etdiyini halal, halal etdiyini isə haram etdiklərini bildiyi halda onlara tabe olarsa artıq onları rəbblər qəbul etmiş olar.Yəni, onları Uca Allaha şərik qoşmuş olar.Çünki halal və haram etmək xalis Allahın haqqıdır.Hər hansı bir şəxsin halal və haram edib əhkamlar ixtira etməsi icazəli deyil. İnsan yalnız Allahın kitabı və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsində gələn dəlilə əsasən hərəkət etməlidir.Uca Allah buyurur: *“Diliniz yalana vərdiş etdiyi üçün: “Bu halaldır, o haramdır!”- deməyin, çünki (bununla) Allaha iftira yaxmış olursunuz.Allaha iftira yaxanlar nicat tapmazlar! (Onlar üçün dünyada) az bir mənfəət vardır, (axirətdə isə) onları şiddətli bir əzab gözləyir!”.*[253] Biz alimlərə mütləq şəkildə, onların doğru yaxud yanlış qərarlar vermələrinə nəzər salmadan itaət etmirik.Biz onlara yalnız doğru qərarlarda tabe olur, onların yanlış görüşlərini isə tərk edirik.Biz Allaha itaət edənə itaət edir, Allaha asilik edənə isə asilik edirik və onun yanlış qərarına müxalif oluruq.Haqq din məz budur.

Lakin əgər sən həmin alimin yanlışlıq etdiyini bilmirsənsə belə olan halda sən üzürlüsən.Ancaq əgər biri: Əgər o, xəta edibsə onun xətası onun əleyhinədir,-deyərsə, biz deyəcəyik: Belə etmək olmaz.Bu sözlər sənə qiyamət günü fayda verməyəcək.Onlar öz etdiklərinə cavabdeh sən isə öz etdiklərinə cavabdehsən.Fətvalar yalnız Allahın kitabı və

[253] ən-Nəhl:116-117.

Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsindən olan dəlillər üzərində qurulacağı zaman ona etimad göstəriləcək.Ancaq əgər biri onun dəlilsiz olduğunu bilərsə onun həmin görüşü götürməsi haram olacaq.Lakin bundan bilgisiz olan şəxs üzürlüdür.Ancaq hər bir halda insanın doğru olanı axtarıb araşdırması gərəkdir.

# Otuz səkkizinci məsələ

## Allahın ad və sifətlərinə dair küfr etmək

**“Sifətlərə dair küfrə meyl etmək.Uca Allah buyurur:** ***“Etdiyiniz əməllərin çoxunu isə Allahın bilməyəcəyini zənn edirdiniz.”***[254]

## Şərh:

Sifətlər: Uca Allahın Özünə isbat etdiyi sifətləridir.Ərəb dilində gələn “الإلحاد : ilhad” sözü: Doğru səmtdən kənara meyl etməkdir.Burada qəsd olunan: Allahın sifətlərinə dair batilə meyl etməkdir.Bura həmçinin Allahın sifətlərini inkar etmək daxildir.Allahın sifətlərini inkar etmək isə “ilhad” sayılır.Çünki bu, haqqdan uzaqlaşmaq və haqqdan dönmək anlamına gəlir.Cahiliyyat əhli Allahın sifətlərinə dair küfrə meyl edirdilər.Yəni, onlar Allahın sifətlərini danır və onu inkar edirdilər.Buna dəlil olaraq Uca Allah buyurur: *“Siz qulaqlarınızın, gözlərinizin və dərilərinizin əleyhinizə şəhadət verəcəklərindən qorxub çəkinmir, etdiyiniz əməllərin çoxunu isə Allahın bilməyəcəyini zənn edirdiniz.”*[255] Onlar düşünmüşlər ki, Allah onların etdikləri bir çox əməlləri bilmir. Bununla da, Allahın elm sifətini inkar etmişlər.

Bu, ayədə gələn əsas məqamdır.Çünki elm əzəmətli sifətlərindən biridir.Uca Allah hər şeyi bilir.Qulların heç bir

[254] Fussılət:22.
[255] Fussılət:22.

əməli Ona gizli qalmır. *“O, göylərdə və yerdə olanları da, sizin gizlində və aşkarda nə etdiyinizi də bilir.”*[256] O, keçmişdə olanı və gələcəkdə olacağı bilir.Habelə O, olmayanı və əgər olsaydı necə olardı, bunu da bilir.Uca Allahın elmi əhatəli və hər şeyi şamil edəndir.Əgər biri Allahın onun bəzi əməllərini bilmədiyini zənn edərsə həmin adam Allahın sifətlərində küfrə meyl etmiş olacaq və elm sifətini inkar etmiş olacaq.

Daha sonra Uca Allah buyurur: *“Sizin öz Rəbbiniz barəsindəki bu zənniniz sizi məhv etdi”.* Yəni, sizi həlaka sürüklədi. *”Və ziyana uğrayanlardan oldunuz!”.*[257].Bu isə onu göstərir ki, əgər biri Uca Allahın sifətlərindən birini inkar edərsə özünü cahiliyyat əhlinə bənzətmiş olacaq və ağır cəza təhdidinə düşəcək.Buradan bəlli olur ki, cəhmiyyə, mötəzilə, əşariyyə və məturudiyyə kimi Allahın sifətlərini inkar edən firqələr bu çirkin xisləti cahiliyyat əhlindən mənimsəmişlər. Habelə onlar qorxunc bir təhdidə məruz qalırlar.Çünki onlar Allah barəsində yaramaz zənnə düşmüşlər.

Habelə Allahın “isteva: ucalmaq, qərar tutmaq” sifətini “istilə: ələ keçirtmək” kimi, əl sifətini qüdrət kimi yozmaq və onu doğru mənasından batil mənaya yönəltmək kimi işlər Allahın sifətlərinə dair küfrə meyl etməkdir.Habelə həmin sifətlərin mənalarını Allaha buraxmaq və nassların dəlalət etdiyi mənaları danmaq Allahın sifətlərinə dair küfrə meyl etməkdir.

[256] ət-Təğabun:4.
[257] əl-Fussılət:23.

# Otuz doqquzuncu məsələ

## Allahın adlarına dair küfrə meyl etmək

**“Adlara dair küfrə meyl etmək.Uca Allah buyurur: *“Onlar isə Rəhman olan Allaha küfr edirlər”.*[258]**

## Şərh:

**Cahiliyyat əhli sifətlərə dair küfrə meyl edirdilər.Həmçi**nin Uca Allahın adlarına dair küfrə **meyl edib h**əmin adları **inkar edirdilər.Uca Allah buyurur:** ***“Onlar isə Rəhman olan Allaha küfr edirlər”.***[259] **Ər-Rahmən:** Uca Allahın adlarından **biridir.**Peyğə**mbər (salləllahu aleyhi və səlləm)** müşriklə**rlə sülh** bağlamaq istə**diyi zaman Suheyl bin Amr g**əlib demişdir: **Buyur bizimlə** sizin aranızda bir saziş yaz! Peyğə**mbər (salləllahu aleyhi və səlləm)** bir yazarı çağırıb dedi: “Bismillə**hi-r-Rahməni-r-Rahim.Səhl bunu** eşitdiyi zaman dedi: Allaha **and olsun ki, biz R**əhmanın nə olduğunu bilmirik.”[260] **Onlar dedilər: Biz Yəmənənin r**əhmanından başqa rə**hman** tınımırıq.Bununla da, onlar Museylimə**ni q**əsd etmişlə**r. Çünki Museylimə rəhman deyə** çağırılırdı**.Uca Allah bunun** ardından **növbəti ayəni nazil etdi:** ***“Onlar isə Rəhman olan Allaha küfr edirlər. De: O mənim R****əbbimdir.Ondan başqa heç*

---

[258] **ər-Rad:30.**

[259] **ər-Rad:30.**

[260] **Buxari:2583.**Əhmə**d:4/332.**

*bir ilah yoxdur. Mən ancaq Ona təvəkkül etdim və tövbəm də yalnız Onadır!".*[261]

Həmçinin Peyğəmbər (salləllahu aleyhi və səlləm) Məkkədə olarkən namaz qılıb duada belə demişdir: Ey Allahım! Ey Rəhman! Müşriklər bunu eşitdiyi zaman dedilər: Bu kişiyə bir baxın! Ey Allah və ey Rəhman dediyi bir halda özünün bir ilaha ibadət etdiyini iddia edir.Əslində o, iki ilaha ibadət edir.Uca Allah bunun ardından növbəti ayəni nazil etmişdir: *"De: İstər Allah, istərsə də Rəhman deyib çağırın. Hansını desəniz (olar), çünki ən gözəl adlar yalnız Ona məxsusdur."*[262] Allahın adları çoxdur.Adların çoxluğu həmin adlara sahib olanın çox olduğuna dəlalət etmir.Bu, yalnız həmin çoxsaylı adlara sahib olanın əzəmətinin bir göstəricisidir.

Bir sözlə, müşriklər Allahın adlarını inkar edirlər.Habelə əgər cəhmiyyə firqəsi kimi zəlalət firqələrindən biri Allahın adlarını rədd edər yaxud mötəziliyyə firqəsi kimi ləfzləri isbat edib mənaları rədd edər yaxud əşariyyə kimi bir qismini isbat bir qismini isə inkar edərsə cahiliyyat əhlinin irsini yaşatmış olar.Uca Allah Öz adlarını isbat edərək buyurur: "*Ən gözəl adlar Allahındır.Onu bu adlarla çağırıb dua edin.*"[263] Habelə buyurur: "*Ən gözəl adlar Allahındır*."[264] Peyğəmbər (salləlla-hu aleyhi və səlləm) demişdir: "Sahib olduğun, Özünü adlandırdığın yaxud yaratdıqlarından birinə öyrətdiyin yaxud kitabında nazil etdiyin yaxud yanında olan

---

[261] ər-Rad:30.
[262] əl-İsra:110.
[263] əl-Əraf:180.
[264] Tahə:8.

qeyb elmində gizli saxladığın hər bir ad ilə Səni çağırıram."[265] Uca Allahın adları çoxdur.Allah onlardan bir qismini kitabında nazil etmişdir. Həmin adlar Quranda çoxdur.Bunlar: Ər-Rahmən, Ər-Rahim Əl-Aziz, Əl-Hakim, Ər-Rauf, Ət-Təvvab, Əl-Ğaffər və digər adlardır.

Habelə Uca Allah "əl-Həşr" surəsinin axırında buyurur: *"O, Özündən başqa heç bir ilah olmayan, mülkün sahibi, müqəddəs olan, (qullarına) salamatlıq, əmin-amanlıq bəxş edən, (hər şeydən) göz-qulaq olub (onu) qoruyan, yenilməz qüvvət sahibi, məcbur etməyə qadir olan, (hər şeydən) böyük (hər şeyin fövqündə) olan Allahdır. Allah (müşriklərin) Ona qoşduqlarından (şəriklərdən) ucadır.O, (hər şeyi) yaradan, yoxdan var edən, (hər şeyə) surət verən Allahdır. Ən gözəl adlar ancaq Ona məxsusdur."*[266]

Bu səbəbdən, Uca Allahın adlarına iman etmək vacibdir. Peyğəmbər (salləllahu aleyhi və səlləm) səhih hədisdə demişdir: "Həqiqətən, Allahın doxsan doqquz adı vardır.Kim onu sayarsa cənnətə girər."[267] Uca Allahın adlarına dair dəlillər çoxdur.Allahın adlarına iman etməyən şəxs Uca Allaha iman etmiş olmaz.

[265] Əhməd:1/391.
[266] əl-Həşr:22-24.
[267] Buxari:2585.Muslim:2677.Tirmizi:3508.İbn Macə:3860.Əhməd:2/267.

# Qırxıncı məsələ

## Uca Rəbbi danmaq

**"Danma.Buna misal, firon və onun** əyanının **dediyi sözdür."**

**Şərh:**

**"التعطيل : Tə`tıl" sözünün ərəb dilində əsli:** Bir şeyi boşaltmaqdır.**Belə deyilir: "عطل المكان : attalə-l-məkən" yəni, yeri** boşaltmaq.**Habelə deyilir: "امرأة عاطل : imra**ətun atıl" **yəni, bər-bəz**əyi olmayan qadın.Mə**lum olur ki, "التعطيل :** ta`tıl" **sözünün m**ənası bir şeyi digə**rindən kənar etməkdir.**

**Burada məqsəd:** Kainatı Yaradandan ayırmaq **və bu** kainatı Yaradanın olduğunu inkar etmə**kdir.Onlar: Bu kainat** yalnız tə**biət nəticəsində ortaya g**əlmişdir,**-deyirlər.**

Muattılə (Allahı dananların) imamı isə **firondur.O,** demiş**dir:** *"**Ey** əyanlar! Mən sizin üçün özümdən başqa bir ilah olduğunu bilmirəm."*[268] Əslində b**u, t**əşəxxüs və inadkarlıq qəbilindən bir iş olmuşdur.O, demişdir: ***"Firon dedi: Ey Haman! M**ənim üçün bir uca qəsr tik ki, bəlkə, yol**lara** yetişim**- Göyl**ərin yollarına (yetişim) və Musanın Allahını görüm. Doğrusu, mən onu yalançı sayıram!".*[269] ***"Ey Haman! M**ənim üçün od qalayıb palçıqdan kərpic bişir və bir qüllə*

---

[268] **əl-Qasas:38.**

[269] Ğafir:36**-37.**

*tikdir ki, (ora qalxıb) bəlkə, Musanın ilahına tamaşa edim. Axı mən onu, həqiqətən, yalançı sayıram!".*[270] Ta`tıl məhz budur.

Fitrət və ağıllar bu sözün yalan olduğuna dəlalət edir. Çünki məxluqatın Xaliqsiz mövcudiyyəti mümkünsüzdür. Habelə failsiz felin olması mümkünsüzdür. *"Yoxsa onlar heç bir şeydən yarandılar?! Yaxud onlar (öz-özlərini) yaradanlardır?! Yoxsa göyləri və yeri yaratdılar?! Xeyr, onlar ürəkdən inanmırlar!".*[271] Onlar bu suallardan heç birinə cavab verə bilməmişlər.Onlar nə başqalarını nə də ki, özlərini yaratmamışlar. Onlar Yaradan olmadan əmələ gəlməmişlər. Yaradanın olması labüddür.Yaradan olacağı zaman ortaya sual çıxacaq: Həmin yaradan onların özləridirmi? Özlərini onlarmı yaratmışlar? Göylər və yerdə olan hər hansı bir şeyi onların bütlərimi yaratmışdır? Əsla! Fitrət və ağıllar bunu təkzib edir.

Habelə Uca Allah digər bir ayədə onlara meydan oxuyaraq buyurur: *"Allahdan başqa sizə göylərdən və yerdən ruzi verən bir xaliq varmı?!".*[272] Onlar buna cavab verməmişlər.

---

[270] əl-Qasas:38.
[271] ət-Tur:35-36.
[272] Fətir:3.

# Qırx birinci məsələ

## Allaha nöqsan nisbət etmək

"Uca Allaha nöqsan nisbət etmək.Onlar öz rahiblərini nöqsan saydıqları bəzi işlərdən uzaq tutduqları bir halda övlad, möhtaclıq və yorğunluq kimi şeyləri Allaha nisbət etmişlər."

Şərh:

Nöqsan, kamil vəsfə zidd gəlir.Uca Allaha nöqsan nisbət etmək Onun rübubiyyətini ləğv etmək anlamına gəlir.Misal üçün Allaha övlad nisbət etmək.Çünki valideyin övlada ehtiyac duyur, habelə həmin övlad ona bənzəyir.Yəhudilər demişlər: Üzeyir Allahın oğludur. Habelə nəsranilər demişlər: Məsih Allahın oğludur.Ərəblərin müşrikləri isə demişlər: Mələklər Allahın qızlarıdır.Bu arada isə nəsranilər öz alimlərini övlad və zövcədən uca tuturlar.Çünki bu, onlara nisbətdə nöqsan sayılır.Onlar öz rahiblərini uca tutduqları şeylərdən Allahı uca tutmurlar.Habelə ərəblər qız uşaqlarını bəyənmir, eyni zamanda özləri üçün rəva bilmədikləri və özləri üçün nöqsan və ayıb hesab etdikləri şeyləri Allaha nisbət edirdilər. *"Onlar Allaha qızlar isnad edirlər.Allah*

*pakdır, müqəddəsdir. Özlərinə isə istədiklərini aid edirlər."*[273] *"Özlərinin bəyənmədiklərini Allaha isnad edərlər."*[274]

Xəbər verilir ki, alimlərdən biri rum hökmüdarının yanına bir məktubla yollanmışdır.Həmin alim onun hüzuruna daxil olduğu zaman demişdir: Zövcə və övladlar necədir? Bu zaman hökmüdarın hüzurunda olanlar qəzəblənmiş və onların başçısına zövcə və övladın nisbət edilməsini mənfi qarşılamışlar.Alim isə onlara dedi: Siz başçınızı zövcə və övladdan uca tutur ancaq bunu Allaha nisbət edib onu bu şeylərdən uca tutmursunuz.Bununla da, onları susdurmuş və rüsvay etmişdir.

---

[273] ən-Nəhl:57.
[274] ən-Nəhl:62.

# Qırx ikinci məsələ:

# Mülkdə olan şirk

"Məcusilərin sözləri kimi mülkdə olan şirk."

## Şərh:

Cahiliyyat əhlinin məsələlərindən: Məcusilərin sözləri kimi mülkdə olan şirkdir.Məcusilər: Farsların ölkələrində olan və oda sitayiş edən insanlardır.Onlar deyirlər: Bu kainatın iki yaradanı vardır: Nur və zülmət.Nur xeyiri yarartmış, zülmət isə şəri yaratmışdır.Habelə onlar bu etiqada görə "sənəviyyə: iki ilahlılar" adlanmışlar.Bu heç şübhəsiz ki, rübubiyyətdə şirkdir.

Onların məzhəbinə əsasən insan məhrəm qadınlarla evlənə bilər.Habelə onların məzhəbinə əsasən insan mal-mülkdə və zövcələrdə digəri ilə müştərək ola bilər.Onlara görə heç bir şəxs xüsusi mülkə sahib ola bilməz.Onlar qadınlarda və mal-mülkdə bir-birinə şərik olurlar.Hal-hazırki zamanda olan kommunizm və sosializm bu yol üzərədir.

Bu isə dinlər və fitrətlərə zidd olan batil məzhəbdir.Kainatı yaradan təkdir, birdir və ehtiyacsızdır.O, nə doğub nə də doğulub və Onun heç bir tayı-bənzəri yoxdur.Uca Allah bizə fərdi mülkiyyəti halal etmiş məhrəmlərlə eviliyi isə haram etmişdir.

# Qırx üçüncü məsələ

## Qədəri danmaq

**"Qədəri danmaq."**

## Şərh:

Qədərin mənası: Allahın hər bir şey haqqında olan bilgisi, habelə bu şeyləri baş verməmişdən öncə təqdir etməsi və lövhi məhfuzda yazması daha sonra onu yaratmasıdır. Buna iman etmək, imanın altı dayağından biridir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: İman Allaha, mələklərinə, kitablarına, peyğəmbərlərinə, axirət gününə, habelə qədərin xeyiri və şərinə iman etməyindir."[275]

Uca Allah buyurur: *"Şübhəsiz ki, Biz hər şeyi qədəri ilə yaratdıq."*[276] Qədər, Uca Allahın fellərindəndir.Onun mülkündə təqdir etmədiyi və istəmədiyi heç bir şey baş vermir. Çünki Uca Allah olanı və olacağı Öz əzəli elmi ilə bilir. Uca Allah əzəli elm vəsfinə malikdir.Daha sonra O, bunu lövhi məhfuzda yazmışdır.Uca Allah buyurur: *"Yer üzündə baş verən və sizin öz başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o, bir kitabda yazılmamış olsun.Bu, Allah üçün çox asandır!".*[277] Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Bil ki, sənin başına gələnlər səndən yan keçmə-

---

[275] Muslim:8.Tirmizi:2610.Nəsai:4990.Əbu Davud:4695.İbn Macə:63.Əhməd:1/28.

[276] əl-Qəmər:49.

[277] əl-Hədid:22.

yəcəkdi.Səndən yan keçən isə sənin başına gəlməyəcəkdi. Artıq qələmlər qaldırılmış səhifələr isə qurumuşdur."[278]

Elə bir şey yoxdur ki, o Allahın istəyi ilə olmasın. Baş verən hər bir şeyi yalnız Uca Allah yaradır. *"Allah hər şeyin xaliqidir."*[279] Uca Allah həm xeyiri həm də, şəri yaratmış və xeyiri və şəri təqdir etmişdir.Bu, qədərə iman mərtəbələri adlanır:

Birinci: Allahın hər bir şeyi bildiyinə dair iman.

İkinci: Allahın lövhi məhfuzda hər şeyi yazdığına dair iman.

Üçüncü: Bu kainatda baş verən hər bir şeyin Allahın istəyi ilə baş verdiyinə dair iman.Hər bir şey yalnız Onun istəyi ilə baş verir.

Dördüncü: Allahın hər bir şeyi yaradan və hər bir şeyin havadarı olduğuna dair iman.

Bu, qədərə olan imandır.Cahiliyyat əhli qədəri inkar edirdilər.Buna dəlil Qurani Kərimdə gələn üç ayədir.Birinci ayə "əl-Ənam" surəsindədir.Uca Allah buyurur: *"Müşriklər belə deycəklər: "Əgər Allah istəsəydi, nə biz, nə də atalarımız müşrik olar və nə də biz bir şeyi haram edə bilərdik."*[280] Digər ayədə buyurur: *Müşriklər dedilər: "Əgər Allah istəsəydi, nə biz, nə də atalarımız Ondan başqa heç bir şeyə tapınmaz, Onsuz (Allahın razılığı olmadan) heç bir şeyi haram*

---

[278] Əbu Davud:4699.İbn Macə:77.Əhməd:5/183.

[279] əz-Zumər:62.

[280] əl-Ənam:148.

*etməzdik".*[281] Habelə digər ayədə buyurur: *"Onlar dedilər: Əgər Rəhman istəsəydi, biz onlara ibadət etməzdik!".*[282]

Alimlər bu ayələrin təfsirinə dair iki görüş irəli sürmüşlər:

Birinci görüş: Burada gələn "*Əgər Allah istəsəydi*" ifadəsində məqsəd qədərin rədd edilməsidir.Onlar deyir-lər: Əgər Allahın istəyi olsaydı bizə bu şeyləri etməyə imkan verməzdi.Onlar qədəri inkar etmiş və etdikləri şeyləri Allahın istəyindən kənar olduğunu qəsd etmişlər.Onlar qədəri rədd edib etdiklərini müstəqil şəkildə özlərinə aid etmişlər.Bu isə tamamilə mötəzililərin məzhəbinə bənzəyir. Çünki onlar deyirlər: Uca Allahın iman və küfrdə, habelə xeyir və şərdə istəyi yoxdur. Bu yalnız yaradılanların etdiyidir.Bununla da, mötəzililər cahiliyyat əhlinin sözünü demiş olurlar.

İkinci görüş: Burada gələn "*Əgər Allah istəsəydi*" ifadəsində məqsəd, yəni Allahın bizim bu etdiklərimizdən razı qalmasıdır.Çünki əgər O, bundan razı qalmasıydı bizə bunu etməyə imkan verməzdi.Belə olan halda onlar qədərə iman etmiş olurlar.Lakin onlar bunu, etdikləri küfrü icazəli etmək üçün dəlil gətirirlər.Üstəlik iş o yerə çatır ki, onlar deyirlər: Bu, Allaha olan itaətdir.Çünki Allah istəmiş biz isə Onun istəyinə və qədərinə itaət etmişik.

---

[281] ən-Nəhl:35.
[282] əz-Zuxruf:20.

İkinci görüş, yəni onların öz çirkin əməllərinə dair qədəri dəlil gətirmələri və Allahın onlardan bunu istədiyini demələri cəbriyyə firqəsinin sözüdür.Belə ki, onlar qədəri isbat etmiş və öz çirkin əməllərini keçərli etmək üçün qədəri dəlil gətirmişlər.Onlar demişlər: İnsan etdiyi əməlləri etməyə məcburdur.Onlar bu məsələdə cahiliyyat əhlinin varisləridir.

Ayələr iki mənadan birinə dəlalət edir: Qədəri inkar etmək yaxud qədəri isbat etmək və bunu Uca Allaha dəlil gətirmək.Uca Allah onların sözlərini rədd edərək buyurur: *“De: Bizim qarşımıza çıxara biləcək bir elminiz varmı?”.*[283] Sizin bu sözə, yəni Allahın bu küfrü və bu əməlləri istəmədiyinə dair dəliliniz nədir?

İkinci təfsirə əsasən: Allahın bu əməllərdən, bu küfrdən, bu şirkdən və bu fahiş işlərdən razı qaldığına dair sizin dəliliniz nədir? Allahın bundan razı qaldığına dair dəliliniz nədir? Haradadır dəlil? *“De: Bizim qarşımıza çıxara biləcək bir elminiz varmı? Siz yalnız zənnə qapılır və yalan uydurursunuz!.De: Tutarlı dəlil yalnız Allaha məxsusdur. Əgər O istəsəydi, sizin hamınızı doğru yola yönəldərdi”.*[284] Uca Allah, Öz hikməti və müdrüklüyü ilə istədiyinə hidayət verir, istədiyini isə azdırır.Uca Allah hidayətə layiq olanı və hidayətə layiq olmayanı bilir.O, hidayəti ona yaraşan doğru yerdə yerləşdirir.Uca Allah onların sözlərini rədd edərək bəyan etmişdir ki, əgər O, onların etdikləri əməllərdən razı

[283] əl-Ənam:148.
[284] əl-Ənam:148-149.

qalsaydı şirki inkar edən və tövhidi əmr edən peyğəmbərlər göndərməzdi. *"Biz hər ümmətə: Allaha ibadət edin, Tağutdan çəkinin! -deyə peyğəmbər göndərmişdik."*[285] Əgər Allah, iddia etdiyiniz kimi tağuta ibadətdən, küfr və şirkdən razı qalsaydı bunu qadağan edən elçilər göndərməzdi.Bununla da, Allahın küfr, şirk, günahlar və müxalif işlərdən razı qalmadığı, üstəlik bunu sevmədiyi və bunu pislədiyi bəlli olmuşdur.

Habelə "əz-Zuxruf" surəsində Uca Allah onların sözlərini rədd edərək buyurur: *"Onların heç bir biliyi yoxdur.Onlar ancaq yalan danışarlar."*[286] Habelə buyurur: *"De: Bizim qarşımıza çıxara biləcək bir elminiz varmı?"*.Onlar Allahın adından bilmədikləri şeyi danışırlar.Bu kimi məsələlərə dair yalnız şəriət sahibindən gələn dəlil əsasında danışmaq olar.Allahın kitabı və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsində gələn dəlil əsasında danışmaq olar.Bu işlərdə ağıl, düşüncə və görüşlərə etimad göstərilməz.

[285] ən-Nəhl:36.
[286] əz-Zuxruf:20.

# Qırx dördüncü məsələ

## Allahın onlara küfrü təqdir etdiyinə görə üzrlü olduqlarını hesab etmişlər

**"Bunu Allaha dəlil gətirmək."**

**Şərh:**

Mənası: Onlar Allaha qədəri dəlil gətirir və Allahın onlara küfrü və günahları təqdir etdiyi səbəbilə bu işdə üzürlü olduqlarını hesab edirlər.

Uca Allah onlara heç bir hüccət buraxmamışdır.Uca Allah onlara seçim qabiliyyəti, qüdrət və istək vermiş və onlara xeyir və şər yollarını bəyan etmişdir.Uca Allah onlara etmək və buraxmaq imkanlarını vermişdir.Onlar etdikləri şeylərə məcbur deyillər.Habelə Uca Allah qulları üçün küfrü bəyənmədiyini bəyan etmişdir.Uca Allah buyurur: *"Qullarının küfr etməsi Ona xoş getməz."*[287] Uca Allahın bunu təqdir edib bunu istəməsi Onun bundan razı qaldığını gərəkli etmir.Uca Allah küfrü təqdir edir lakin bunu bəyənmir. Bunu etməyə səbəb isə insanlar arasında fərqləndirmə aparması və sadiq insanı və yalançını, habelə mömini və kafiri ayırd etməsidirdir.Belə olan halda kimisinin mömin

[287] əz-Zumər:7.

kimisinin kafir, habelə kimisinin münafiq kimisinin də doğru imanlı mömin olacağı bəlli olur.Uca Allahın xoşagəlməz işləri təqdir etməsi Onun uca hikmətindən irəli gəlir. Uca Allah bunu əbəs yerə təqdir etməmişdir.Uca Allah insanlara verəcək qarşılığı onların öz ixtiyarı ilə etdikləri əməllərin nəticəsi olaraq etmişdir.

Bu səbəbdən dəli, ağılsız, məcbur edilən və yatan insan etdikləri şeylərə görə məsuliyyət daşımırlar.Çünki onlar ixtiyar sahibi olmur və düşünmək imkanına malik olmurlar.

Allahın ağıl və düşüncə verdiyi və etdiyinə məcbur edilməyən şəxs edəcəyi şeylərdən ötrü məsuliyyət daşıyır. Çünki həmin şəxs öz ixtiyarı ilə şər işlərə əl atır.Zinakar öz ixtiyarı ilə zina edir.Namazı tərk edən öz ixtiyarı ilə namazı tərk edir.Həmin şəxs qalxıb namaz qılmaq gücündədir. Habelə zina edən şəxsə zinanın haram olması və bunun acınacaqlı sonucu bəyan edilir.Uca Allah zina üçün cəza hazırlamışdır.Habelə küfr və şirki qadağan edən elçilər göndərmişdir.Belə olan halda onların etdikləri günahlardan, habelə küfr, şirk və zəlalətdən ötrü qədəri dəlil gətirmələri nə dərəcədə doğrudur? Onların buna dair heç bir hüccəti yoxdur.Burada yalnız Allahın onların əleyhinə dəlili vardır: "*De: Tutarlı dəlil yalnız Allaha məxsusdur.*"[288]

Qədəri yalnız üz verən müsibətlər üçün dəlil gətirmək olar.Sənin başına bir bəla gəldiyi zaman ümidsizliyə qapanma və de: Bu, Allahın qədəridir və O, istədiyini etmişdir.Bu

[288] əl-Ənam:149.

zaman səbr edib buna görə savabı Allahdan umursan.Lakin günahdan ötrü qədəri dəlil gətirmək doğru deyil.Əksinə günah edənin Allaha tövbə etməsi və günah və şərli işlərdən yan durması gərəkdir.Günah işlərdən ötrü qədəri dəlil gətirmək cahiliyyat əhlinin əməlidir.

# Qırx beşinci məsələ

## Allahın şəriəti ilə qədəri arasında ziddiyətin olduğunu iddia etmək

“Allahın şəriəti ilə Onun qədəri arasında ziddiyət görmək”.

**Şərh:**

Bu məsələ həmçinin qədərlə əlaqəlidir.Çünki bəzi insanlar Allahın şəriətinin qədəri ilə ziddiyət təşkil etdiyini iddia edib deyirlər: Necə olur ki, Allah küfr və imanı təqdir edir daha sonra qullarına buyuruqlar, əmrlər və qadağalar çıxarır.Bütün işlər təqdir olunub yazıldığı təqdirdə bunun nə faydası var ki? İnsanlar qədərə etimad göstərirlər.

Bu, ən təhlükəli cahiliyyat məsələlərindən biridir.Habelə qiyamət gününəcən şəriətlə qədər arasında ziddiyət olduğunu iddia edib bu yolu tutacaq insanlar bu məsələyə daxildirlər.Bu, batil məzhəbdir.Qətiyyən şəriətlə qədər arasında heç bir ziddiyət ola bilməz.Uca Allah şirki, günahları və küfrü təqdir etmiş və bu şeyləri yasaq etmişdir. Habelə imanı, doğru səmtdə olmağı və saleh işlər görməyi buyurmuşdur.Bu ikisi arasında heç bir ziddiyət yoxdur.Çünki bu işləri öz ixtiyarı, iradəsi və istəyi ilə edənlər insanların

özləridir.Fel onlara nisbət olunur.Bütün şeyləri təqdir edən Uca Allah olsa belə onlar günah işlərə görə cəzalanır, itaətlərə görə isə savab alırlar.Onlar qədərə görə deyil yalnız etdiklərinə görə qarşılıqlarını alırlar.

Peyğəmbər (salləllahu aleyhi və səlləm) səhabələrinə demişdir: "Sizdən elə birisi yoxdur ki, onun cənnətdə yaxud cəhənnəmdə yeri bilinməsin.Onlar dedilər: "Ey Allahın elçisi! Elə isə alın yazısına təslim olub əməli tərk edəkmi? Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Xeyir, əməl edin! Çünki hər bir şəxs yaradıldığı iş üçün müyəssərdir."[289] Ardından Uca Allah növbəti ayələri nazil etmişdir: *"Kim (malını Allah yolunda) versə, (Allahdan) qorxsa, Və ən gözəl sözü təsdiq etsə, Biz ona ən asan olanı müyəssər edəcəyik! Amma kim xəsislik etsə, möhtac olmadığını sansa, Və ən gözəl sözü yalan saysa, Biz ona ən çətin olanı müyəssər edəcəyik."*[290]

İnsan öz tərəfindən xeyir işlər görür və şərdən kənar durur.Qədər isə Uca Allahın sirridir.Sən onu araşdırmağa qalxma çünki bu işlərin sənə aidiyyatı yoxdur.Üstəlik sən heç bir nəticəyə yetişməyəcəksən.

Bu məsələlərdən çıxan nəticə: İnsanlar qədər və şəriət məsələsində dörd qismə bölünmüşlər:

<u>Birinci qism</u>: Qədəri isbat edib şəriəti inkar edənlər. Bunlar cəbriyyə firqəsidir.

<u>İkinci qism</u>: Şəriəti isbat edib qədəri inkar edənlər. Bunlar qədəriyyə firqəsidir.

---

[289] Buxari:4666.Muslim:2647.Tirmizi:2136.Əbu Davud:4694.İbn Macı:78.Əhməd:1/157.
[290] əl-Leyl:5-10.

**Üçüncü qism: Həm şəriəti həm də qədəri isbat edib onların arasında ziddiyətin olduğunu iddia edənlər.Bunlar müşriklərdir.**

**Dördüncü qism: Həm şəriəti həm də qədəri isbat edib bu ikisi arasında ziddiyətin olduğunu rədd edənlər.Bunlar Əhli sunnə vəl cəmaatdır.**

# Qırx altıncı məsələ

## Hadisələri zamana nisbət etmək və onu söymək

“Zamanı söymək.Onlar demişlər: *“Bizi öldürən ancaq zamandır.”*[291]

## Şərh:

Hadisələri zamana aid edənlər ateistlərdir.Onların başına bir bəla gəldiyi zaman onlar bunu zamana nisbət edir və bundan ötrü zamanı pisləyirlər.Əslində isə bütün şeyləri Uca Yaradana nisbət etmək gərəkdir.Zaman isə Allahın yaratdığı bir məxluqdur.Zaman hər hansı bir işi icra edə bilməz.Uca Allah hadisələri zamana nisbət edənlərin sözünü rədd edib buyurur: *“Onlar dedilər: Dünya həyatımızdan başqa heç bir həyat yoxdur; ölürük və dirilirik; bizi öldürən ancaq zamandır.”*[292] Çünki bu, axirəti və qiyamət günü dirilişi inkar etməkdir. ”*Ölürük və dirilirik*”. İnsanlar ölür və dirilir.Habelə onlar deyirlər: Ana bətni çıxarır torpaq isə udur.Habelə deyirlər: Bu həyatın nəbzidir. ”*Bizi öldürən ancaq zamandır.*”.Onlar ölümü zamana aid edirlər. Onlara görə ölümün səbəbi gecələr və günlərin biri-birini sıralama-

---

[291] əl-Cəsiyə:24.

[292] əl-Cəsiyə:24.

sıdır.Onlara görə təqdir edilmiş əcəllər yoxdur.Habelə onlara görə əcəl gəldiyi zaman ruhları alan mələklər yoxdur.

Peyğəmbər (salləllahu aleyhi və səlləm) zamanı söyməyi qadağan edib demişdir: "Zamanı söyməyin! Çünki Allah zamanın özüdür."[293] Hədisin mənası: Zamanı yaradan Allahdır və müəyyən vaxt kəsiyində baş verənlər Allahın təqdir etdiyidir. Uca Allah qüdsi hədisdə buyurur: "Adəm oğlu zamanı söyməklə Mənə əziyyət verir.Zaman Mənəm.Bütün işlər Mənim əlimdədir.Gecəni və gündüzü çevirirəm."[294] Bu səbəbdən, zamanı söyəcəyin zaman həmin zamanı yaradan Uca Allahı söymüş olacaqsan.Bu, Uca Rəbbə əziyyət verən amillərdən biridir.Çünki yamanlama Allaha qayıdır.Çünki işləri idarə edən, əcəlləri, müsibətləri və hər bir şeyi təqdir edən Odur.Zaman isə Uca Allahın yaratdığı bir məxluqdur.

Müsəlmanların bundan uzaq durmaları vacibdir.Onların başına bir iş gəldiyi zaman onlar özlərini hesaba çəkməli və günahlarını etiraf etməlidirlər. *"Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların ucbatındandır!"*.[295] İnsanın zamanı deyil özünü qınaması və danlaması gərəkdir.

---

[293] Muslim:2246.Əhməd:2/491.

[294] Buxari:4549.Muslim:2246.Əbu Davud:5274.Əhməd:2/238.

[295] əş-Şura:30.

# Qırx yeddinci məsələ

## Onlar Allahın nemətlərinə nankorluq edirlər

"Allahın nemətlərini başqalarına aid etmək.Uca Allah buyurur: *"Onlar Allahın nemətini bilir, lakin sonra onu inkar edirlər."*[296]

**Şərh:**

Nemətləri Allahdan qeyrisinə aid etmək Allaha qoşulan şirk və Ona edilən küfrdür.Bu, cahiliyyat əhlinin əməlidir. Uca Allah onlar haqqında buyurur: *"Onlar Allahın nemətini bilir, lakin sonra onu inkar edirlər.Onların çoxu kafirdir."*[297] Bu ayə haqqında deyilmişdir: Onlar Peyğəmbəri (salləllahu aleyhi və səlləm) və onun risalətini bilir daha sonra inadkarlıq və təkəbbürlük üzündən bunu inkar edirlər.Onlar daxilən onun Allahın elçisi olduğunu bilirlər.Uca Allah buyurur: *"Bilirik ki, onların dedikləri söz səni çox kədərləndirir. Həqiqətdə isə onlar səni yalançı hesab etmirlər. Ancaq o zalımlar Allahın ayələrini inadla danırlar."*[298] Onlar Peyğəmbərin gəlişində öz əksini tapan Allahın nemətini bilirlər. Peyğəmbər (salləllahu aleyhi və səlləm) bəşəriyyət üçün ən böyük nemətdir.Ancaq onlar həmin Peyğəmbərə küfr edib ona qarşı inadkarlıq edirlər.Bu, həmin ayənin təfsirinə dair birinci görüşdür.

---

[296] ən-Nəhl:83.

[297] ən-Nəhl:83.

[298] əl-Ənam:33.

İkinci qörüş: Onlar Uca Allahın "ən-Nəhl" surəsində qeyd etdiyi nemətləri bilir daha sonra onu danırlar.Onlar həmin nemətləri Allahdan qeyrisinə nisbət edirlər.Onlar həmin nemətlərin onların öz əməyi və sahib olduqları güc-qüvvəti sayəsində hasil olduğunu iddia edirlər.Qarun demişdir: *"Bu (var-dövlət) mənə yalnız məndə olan elm sayəsində verilmişdir".*[299] Yəni, bunu mən öz təcrübəm, məharətim və əməyim nəticəsində əldə etmişəm.Bunu deməklə o, Allahın ona əta etdiyi neməti danır.Habelə Qarundan savayı şəxslər.Uca Allah xəbər vermişdir ki, Allah insana bir nemət verdiyi zaman o: Bunu mən əldə etmişəm,-deyir.Yəni mən buna layiqəm və bunu almağa haqlıyam.Bu, Allahdan deyil.İnsan əldə etdiyi xeyiri özünə aid edib: Bu, Allahın lütfü və mərhəmətidir,-demir.

[299] əl-Qasas:78.

# Qırx səkkizinci məsələ

## Onlar Allahın bütün ayələrinə küfr edirlər

"Allahın ayələrinə küfr etmək."

## Şərh:

Cahiliyyat əhlinin məsələlərindən: Onlar Allahın öz peyğəmbərlərinə Tövrat, İncil, Zəbur, Quran və digər kitablarda nazil etdiyi ayələrə küfr edirlər.Uca Allah belələrini təhdid edib buyurur: *"Ayələrimizi yalan hesab edənlərə və onlara təkəbbürlə yanaşanlara göyün qapıları açılmaz".*[300] *"Allahın ayələrini və Onunla qarşılaşacaqlarını inkar edənlər Mənim mərhəmətimdən ümidlərini üzənlərdir."*[301] Habelə kafirlərin Uca Allahın ayələrinə küfr etdiklərini, həmçinin öz pozğun ağılları və batil şübhələri ilə ona etiraz etdiklərini ifadə edən digər ayələr.Bu, Allahın hər hansı bir ayəsini yaxud Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) gələn səhih hədisi təkzib edən hər bir şəxsə aiddir.Çünki Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) gələn səhih hədis Allahın ayələrindəndir.Çünki o, Allahdan gələn vəhy vasitəsilədir.İnsan fitnəyə düşmüş müəyyən insanlar və müfəkkirlər kimi bəzi hədisləri, onun düşüncəsinə və təfəkkürünə uyğun gəlməyəcəyi zaman təkzib edərsə bu, Uca Allahın ayələrini

[300] əl-Əraf:40.
[301] əl-Ənkəbut:23.

təkzib etmək anlamına gələcək.Möminin Allahın ayələrinə iman etməsi, onu təsdiq etməsi və ona əməl etməsi vacibdir. Çünki o, batilə qarışmayan haqqdır. *“Nə öncə, nə də sonra batil ona yol tapa bilməz. O, müdrik, tərifə layiq olan tərəfindən nazil edilmişdir.”*[302] Ona şəkk-şübhə daxil olmur.

[302] Fussılət:42.

## Qırx doqquzuncu məsələ

## Onlar Allahın bəzi ayələrinə küfr edirlər

**“Onun bir qismini danmaq.”**

**Şərh:**

Cahiliyyat əhli Allahın ayələrini təkzib etmək məsələsində bir-birindən fərqlənirlər.Onlardan bir qismi Allahın bütün ayələrini təkzib edir və Allahın heç bir kitabına iman etmirlər.Bu, ümumiyyətlə peyğəmbərlərə iman etməyən müşriklərin durumudur.Təbii ki, onlar Uca Allahın nazil etdiyi kitablara da, iman etmirlər.Yəhudi və nəsranilər kimi cahiliyyat əhlindən bir qismi isə onun bəzisinə iman edir bəzisinə isə küfr edirlər.Kitabın bəzisinə iman edib bəzisinə küfr edən şəxs onu bütövlüklə təkzib edən mislindədir. Uca Allah buyurur: *“Siz kitabın bir hissəsinə iman edib, digər qisminə küfrmü edirsiniz?”*.[303] Onlar yalnız nəfsi istəklərinə uyğun gələnə iman edir nəfsi istəklərinə zidd gələni isə təkzib edirlər.Onlar kitabın bir hissəsinə küfr etdikləri zaman onların kitabın digər qisminə iman etmələri onlara fayda verməyəcək.Onlar Qurandan bir ayəyə, bir kəlməyə küfr edəcəkləri zaman kitaba iman etmələri onlara fayda verməyəcək.

---

[303] əl-Bəqərə:85.

Onlardan bəzisi deyir: Quran məxluqdur.Bu sözlərin mənası: Əşarilərin dediyi kimi Quranın mənası deyil onun ləfzləri məxluqdur.Bu, Quranı təkzib etməkdir.Əgər biri cəhmilərin dediyi kimi Quranın məxluq olduğunu, onun ləfzləri və mənasının məxluq olduğunu deyər yaxud Quranın ləfzinin məxluq mənasının isə Allahdan olduğunu deyərsə bu həmçinin küfr olacaq.Ancaq insan təqlidçi olarsa yaxud məsələni yozarsa onun etdiyi zəlalət hesab olunacaq. Çünki Quran Uca Allahın kəlamıdır.Onun ləfzi və mənası, hərfləri və mənası Allahdandır.O, bütövlüklə Allahın kəlamıdır.Allahın kəlamı mənasız hərflər yaxud hərfsiz mənalar deyil.

# Əllinci məsələ

## Onlar, Allahın peyğəmbərlərə kitablar nazil etdiyini danırlar

“Onlar demişlər: *“Allah heç bir bəşərə bir şey nazil etməmişdir”.*[304]

## Şərh:

Yəhudilər demişlər: *“Allah heç bir bəşərə bir şey nazil etməmişdir”.*[305] Ayənin mənası: Bütün risalətləri, habelə vəhyi bütövlüklə inkar etmək. Onları bu sözləri deməyə sövq edən amil Muhammədə (salləllahu aleyhi və səlləm) həsəd aparmaları olmuşdur. Uca Allah onların sözlərini rədd edərək demişdir: *“De: Musanın insanlara bir nur və hidayət olaraq gətirdiyi kitabı (Tövratı) kim nazil etmişdir?”.*[306] Yəni, madam ki, siz Musanın kitabının Allah qatından olduğunu deyirsiniz, Musa isə bəşər övladıdır, elə isə nə üçün belə deyirsiniz: *“Allah heç bir bəşərə bir şey nazil etməmişdir”*?! Bu, yəhudilərin ziddiyətidir. Allah onlara lənət eləsin! Onları bu sözləri deməyə həsəd vadar etmişdir. Nəticədə onlar Muham-

---

[304] əl-Ənam:91.
[305] əl-Ənam:91.
[306] əl-Ənam:91.

məddən (salləllahu aleyhi və səlləm) və Qurandan ötrü bütün peyğəmbərləri və kitabları təkzib etmiş oldular.

Həsədin insanı nə kimi bəlalara sürüklədiyinə diqqət et! Cəhmiyyə firqəsinin sözü onların sözü mislindədir.Onlar deyirlər: Quran Allah qatından nazil olmayıb.Habelə növbəti sözləri deyənlər: Sunnə Allahdan gələn vəhy deyil və sadəcə Peyğəmbərin ictihadıdır.

# Əlli birinci məsələ

## Onlar Quranı insanın kəlamı olaraq vəsf etmişlər

“Qurani Kərimdə gələn ayədə onlar demişlər: *“Bu yalnız bəşər sözüdür.”*[307]

## Şərh:

Cahiliyyat əhlinin məsələlərindən: Onlar Valid bin Muğiranın dediyi kimi Quranın bəşər sözü olduğunu deyirlər.

Quran Uca Allahın kəlamıdır.Uca Allah onu həqiqi surətdə danışmış və Peyğəmbəri Muhamməda (salləllahu aleyhi və səlləm) Cəbrayıl vasitəsilə vəhy etmişdir.Quran Onun həqiqi kəlamıdır.Uca Allah onu bir çox ayədə Öz kəlamı adlandırmışdır.Uca Allah demişdir: *“Allahın kəlamını dinləsin.”*[308] *“Onlar Allahın sözünü dəyişdirmək istəyirlər.”*[309] Bu, Əhli sunnə vəl cəmaatın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) davamçılarının etiqadıdır.

Müşriklər onun Peyğəmbərin kəlamı deyil Allahın kəlamı olduğunu bilirlər.Çünki əgər o, Muhammədin kəlamı

[307] əl-Muddəssir:25.
[308] ət-Təubə:6.
[309] əl-Fəth:15.

olsaydı onlar ona bənzər söz demək iqtidarında olardılar. Çünki Muhamməd (salləllahu aleyhi və səlləm) onlar kimi bir bəşər övladıdır.Əgər Quran onun sözləri olsaydı onlar ona bənzər sözlər demək iqtidarında olardılar.Uca Allah onlara meydan oxuyaraq onun mislində bir şey yaxud onun mislində on surə yaxud bir surə gətirməyi tələb etmişdir.Onlar isə sahib olduqları küfr və inadkarlıq üzərə, habelə Allaha və Peyğəmbərə zidd gəlmək istəyində olmalarına rəğmən heç bir şey ortaya gətirməmişlər.Əgər onlar onun mislində bir surə gətirmək imkanına malik olsaydılar qətiyyən gec qalmazdılar.Lakin onlar bunu etməyə acız qaldılar.Bu da, öz növbəsində onun bəşər sözü deyil Allahın kəlamı olduğuna dəlalət edir.Quran Muhammədin (salləllahu aleyhi və səlləm) yaxud Cəbrayılın deyil Allahın kəlamıdır.Cəbrayıl və Muhamməd yalnız Allahın kəlamını əmanət olaraq çatdırırlar.Kəlam, onu çatdırdığı zaman deyən şəxsə deyil onu əvvəldən deyənə aid edilir.

Kafirlər inadkardırlar.Onlar bəzən Quranın sehr olduğunu bəzən isə Muhammədin (salləllahu aleyhi və səlləm) onu kitab əhlinin alimlərindən öyrəndiyini deyirlər.Onların buna dair müxtəlif sözlər deməldəri, onların yalan sözlər və cəfəngiyyat danışdıqlarına dəlalət edir.

Quranın Muhammədin (salləllahu aleyhi və səlləm) kəlamı, bəşər övladının sözü olduğunu etiqad edən, cahiliyyat əhlinin sözünə müvafiq olur.Cəhmiyyə, mötəzilə və onlara bənzəyənlərin halı məhz belədir.Onlar deyirlər: Quran Allahın kəlamı deyil.Uca Allah onu Cəbrayılda yaxud

**Muhamməddə yaxud Lövhi məhfuzda yaratmışdır, habelə cahiliyyat əhlinin dediyi söz növündən olan digər batil sözlər.**

# Əlli ikinci məsələ

## Onlar Allahın fellərində olan hikmətini rədd edirlər

"Uca Allahın hikmətinə tənə etmək."

Şərh:

Uca Allah Özünü hikmətlə vəsf etmiş və Özünün Müdrik olduğunu söyləmişdir.Hikmət: Bir şeyin yerinə qoyulmasıdır.Müdrik: Hər bir şeyi münasib yerinə qoyandır.

Uca Allah Özünü hikmətlə vəsf etmiş və Müdrik olduğunu bildirmişdir.Müdrik: Uca hikmət sahibidir.

Bütün məxluqat hikmət nəticəsində varlığını tapmışdır. Uca Allah hər bir şeyi yalnız bir hikmət səbəbilə yaratmışdır.Onları əbəs yerə yaratmamışdır.O, göyləri, yeri, ağacları, dənizləri, həyatı, dağları, cinnlər və insanlar aləmini, heyvanlar və həşəratlar aləmini və hər bir şeyi hikmət səbəbilə yaratmışdır.İnsan məxluqatın mükəmməl yaradılışı və bunun nəticələri haqqında düşünəcəyi zaman Uca Allahın hikmətini və bütün bu şeyləri yaradanın uca hikmət sahibi olduğunu biləcək. *"Hər şeyə öz xilqətini verən, sonra da ona doğru yolu göstərəndir!"*.[310] Habelə buyurur: *"Biz göyü, yeri və onların arasında olanları boş-boşuna yaratmadıq. Bu,*

---

[310] Tahə:50.

*kafirlərin zənnidir. Vay cəhənnəm odunda yanacaq kafirlərin halına!".*[311]

Uca Allah yaratmaq vəsfində müdrikdir.Uca Allah əmri, qadağası və buyuruğunda müdrikdir.O, bir şeyi qadağan etdiyi zaman yalnız bütövlüklə zərərli olan yaxud zərəri xeyirindən daha çox olan şeyləri qadağan edir.Habelə O, bir şeyi əmr etdiyi zaman yalnız bütövlüklə faydalı olan yaxud faydası zərərdən daha çox olan şeyləri əmr edir.Uca Allahın məxluqatı hesaba çəkməsi, habelə yaxşı işlər görənlərin müvafiq qarşılığını verməsi, pis işlər görənlərin həmçinin müvafiq qarşılığını verməsi Onun müdriklik nişanəsidir.Bu səbəbdən, Uca Allah buyurur: *"Biz göyü, yeri və onların arasında olanları oyun-oyuncaq yaratmadıq."*[312] Habelə Uca Allah buyurur: *"Biz göyü, yeri və onların arasında olanları boş-boşuna yaratmadıq. Bu, kafirlərin zənnidir. Vay cəhənnəm odunda yanacaq kafirlərin halına!".*[313] Habelə Uca Allah qiyamət gününü inkar edənlərin sözlərini rədd edərək buyurur: *"Yoxsa sizi əbəs yerə yaratdığımızı və hüzurumuza qaytarılmayacağınızı güman edirdiniz?".*[314] *"Məgər insan elə güman edir ki, o, başlı-başına buraxılacaq?!".*[315] Yəni, əmr və qadağan olunmayacağını və etdiklərinin qarşılığını almayacağını güman edir?!

---

[311] Sad:27.
[312] əl-Ənbiyə:16.
[313] Sad:27.
[314] əl-Muminun:115.
[315] əl-Qiyamə:36.

Cahiliyyat əhli Uca Allahın yaratmaqda və etdiyi işlərdə hikmətini inkar edirlər.Mötəzililər və əşarilər Uca Allahın fellərində olan hikmətini qəbul etmirlər.Əşarilər deyirlər: Uca Allah hikmət səbəbilə etmir.O, hikmət səbəbilə deyil yalnız adi istək və məşiət səbəbilə edir.Çünki hikmətin mənası: Bir şəxsin hər hansı bir məqsəd üçün etməsidir.Uca Allah isə məqsədlərdən münəzzəhdir.Çünki hikmətin olması Ona öz təsirini göstərir və nəticədə onların yaradılışı bu illət səbəbilə olur.Uca Allah hikmət səbəbilə deyil adi məşiəti və iradəsi ilə istədiyini edir.Onlar Allahın fellərində və təqdir etdiyində olan hikmətini iddia etdikləri kimi məqsədlərdən uca tutmaq üçün inkar edirlər.Bu səbəbdən deyirlər: Uca Allahın küfrü, fasiqliyi və günahları əmr etməsi, habelə itaətdən, namaz qılmaqdan, qohumluq əlaqələrini qorumaqdan və xeyir işlər etməkdən qadağan etməsi icazəlidir.Çünki bu, Onun istəyinə qayıdır.Onun şəri əmr etməsi və xeyiri yasaq etməsi icazəlidir.Çünki O, istədiyini edir.

Biz onlara deyirik: Bəli! Uca Allah istədiyini edir.Lakin O, hər bir şeyi yalnız hikmət səbəbilə edir.

Onlar deyirlər: Allahın kafiri cənnətə salması icazəlidir. Habelə Onun təqvalı mömini cəhənnəmə salması icazəlidir. Çünki bu, Onun istəyinə qayıdır.Səbəblər Ona hakim ola bilməz.

Biz deyirik: Bu, Uca Allahın hikmətinə yaraşmayan batil sözdür.Uca Allah buyurur: *“Yoxsa Biz iman gətirib yaxşı işlər*

görənləri yer üzündə fitnə-fəsad törədənlərlə eyni tutacağıq?! Yaxud Allahdan qorxub pis əməllərdən çəkinənləri günahkarlara tay edəcəyik?!".[316] Habelə buyurur: "Yoxsa dünyada pis əməllər edənlər onları iman gətirib yaxşı işlər görənlərlə bir tutacağımızı, onların həyatlarının və ölümlərinin eyni olacağını güman edirlər?! Onlar nə pis mühakimə yürüdürlər!".[317] Bu sözü deyənlər Allahı pislik və zalımlıqla vəsf etmişlər.Uca Allah bu şeylərdən pak və ucadır.

Bir sözlə bu, cahiliyyat əhlinin, habelə əşarilər və digərləri kimi hikməti inkar edənlərin məsləkidir.Allah bizi ondan qorusun!

[316] Sad:28.
[317] əl-Cəsiyə:21.

# Əlli üçüncü məsələ

## Allahın şəriətini puça çıxarmaq üçün müxtəlif hiylələr qurmaq

“Peyğəmbərlərin gətirdikləri dini dəf etmək üçün aşkar və gizli hiylələr qurmaq.Uca Allah onlar haqqında buyurur: *“Onlar hiylə qurdular, Allah da hiylə qurdu.”*[318] Habelə buyurur: *“Kitab əhlindən bir zümrə dedi: “Möminlərə nazil edilənə günün əvvəlində iman gətirin və (günün) sonunda küfr edin “.*[319]

---

**Şərh:**

Kitab əhli və oxuyub yazmağı bilməyən cahiliyyat əhlinin əməllərindən: Onlar Uca Allahın şəriətindən azad olmaq və öz küfrləri və zəlalətləri üçün şərait yaratmaq üçün Allahın dinini dəyişmək yolunda hiylələr qururlar.Çünki onlar bunu açıq dilə gətirə bilmirlər.Bu səbəbdən, gizli və məkirli hiylələrə əl atmağa girişirlər.Uca Allah buna dair buyurur: *“Onlar hiylə qurdular, Allah da hiylə qurdu.Allah hiylə quranların ən yaxşısıdır.”*[320] Hiylə: Gizli yolla zərər yetirməyə deyilir.Yəhudilər Məryəm oğlu İsa Məsihi öldürmək

---

[318] Ali İmran:54.
[319] Ali İmran:72.
[320] Ali İmran:54.

istədikləri zaman kafir və bütpərəst hökmdarın hüzuruna gəlib ona demişlər: Əgər sən bu adamı başlı-başına buraxsan sənin hökmünü dəyişəcək.Bunun ardından həmin hökmdar Məsihi öldürmək üçün bir dəstə insan göndərdi.Onlar Məsihi öldürmək üçün onun qaldığı yerə girdilər.Lakin Uca Allah Öz peyğəmbəri üçün tədbir qurmuşdu.Uca Allah, Allahdan əcr diləyərək özünü irəli verən İsanın davamçılarından bir kişiyə Məsihin surətini vermiş və həmin şəxs zahiri görünüşü ilə Məsihə çevrilmişdir.Onlar həmin adamın Məsih olduğunu düşünərək onu yaxalayıb çarmıxa çəkmiş və öldürmüşlər.Uca Allah isə Məsihi onların hiss etmədiklər halda aralarından Özünə tərəf qaldırmışdır.Uca Allah bu xüsusda buyurur: *"Onlar İsanı nə öldürdülər, nə də çarmıxa çəkdilər.Onlarda yalnız belə bir təsəvvür yarandı."*[321]

Bu ayənin mənası məhz budur: ***"Onlar hiylə qurdular, Allah da hiylə qurdu."***[322] Bu, qarşılıq və əvəz vermə növündən olan bir haldır.Uca Allah məxluqatın hiyləsindən fərqli olaraq bunu ədalət olaraq edir.Məxluqatın hiyləsi isə zülmdür.Çünki o, haqsız yerə edilir.

Uca Allah buyurur: ***"Kitab əhlindən bir zümrə dedi: "Möminlərə nazil edilənə günün əvvəlində iman gətirin və (günün) sonunda küfr edin "***.[323] Bu, həmçinin yəhudilərin hiyləsidir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) Mədinəyə hicrət etdiyi, habelə Uca Allahın dini aşkar olduğu və müsəlmanlar

---

[321] ən-Nisə:157.
[322] Ali İmran:54.
[323] Ali İmran:72.

müşriklərə Bədr döyüşündə qalib gəldikləri zaman yəhudilər insanları Muhamməsdin (salləllahu aleyhi və salləm) dinindən döndərməyə aciz qaldılar.Bu zaman onlar müxtəlif hiylələrə əl atdılar.Onlardan bir qism insanlar demişlər: Günün ilk hissəsində İslamı qəbul edin.Günün axırı gəldiyi zaman isə İslamdan çıxın.Habelə deyin: Biz Muhammədin dinində yaxşı bir şey görmədik.İnsanlar sizə tabe olacaqlar.Çünki siz kitab əhlisiniz.Habelə deyirlər: Əgər onlar Muhammədin dinində bir xeyir tapsaydılar ondan çıxmazdılar.İnsanlar da, sizə təqlid edəcəklər.Uca Allah onların hiyləsini ifşa edərək buyurur: *“Kitab əhlindən bir zümrə dedi: “Möminlərə nazil edilənə günün əvvəlində iman gətirin və (günün) sonunda küfr edin* “.[324]

Allahın şəriətini dəyişmək və Onun dostlarına zərər vermək üçün hiylələrə əl atan hər bir şəxs cahiliyyat əhlinin yolundadır.Habelə öz alçaq məqsədlərinə çatmaq üçün özünü Əhli sunnə və tövhid əhli kimi göstərən hər bir şəxs cahiliyyat əhlinin yolundadır.

[324] Ali İmran:72.

## Əlli dördüncü məsələ

## Haqqı dəf etməyə yetişmək üçün onu iqrar etmək

"Uca Allahın ayədə qeyd etdiyi kimi haqqı dəf etməyə yetişmək üçün onu iqrar etmək."

**Şərh:**

Cahiliyyat əhlinin məsələlərindən: Haqqı qəbul etdiyi səbəbilə deyil onu dəf etməyə yetişmək üçün onu iqrar etmək.Buna misal, yəhudilərin qurduğu hiylədir.Uca Allah buyurur: "*Günün əvvəlində iman gətirin və (günün) sonunda küfr edin* ".[325]Buna dair yuxarıda açıqlama gəlmişdir.

Müsəlmanların birliyini pozan düşmənlər hələ də, bu hiyləni qurmaqda davam edirlər.Onlar haqqı qəbul etdiklərini göstərir, əslində isə İslamı dəyişib fəsada uğratmaq istəyirlər.Bu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində baş vermiş və zamanımıza qədər davam etməkdədir.İslamın düşmənlərindən olan insanlar fitnə-fəsad törədir və İslamı fəsada uğratmaq üçün özlərini müsəlman kimi göstərirlər. Onlar müsəlmanlar arasında şübhələr yaymaq, onların birliyini pozmaq və müsəlmanlar arasında ədavət toxumunu

[325] Ali İmran:72.

səpmək və onları dəstələrə və camaatlara bölmək üçün bu işlərə əl atırlar.Heç şübhəsiz ki, bu, düşmənlərin qurduqları hiylələrdir.

Müsəlmanın bu çirkin hiyləyə diqqət yetirməsi və hər yerindən durana etibar etməməsi gərəkdir.Müsəlman insanların sədaqətini təcrübədən keçirtməli və onları sınaqdan keçirtməlidir.Onların doğru və sadiq olduğu sabit olacağı zaman artıq onlara etibar edə bilər.

# Əlli beşinci məsələ

## Onlar sahib olduqları batilə təəssübkeşlik edirlər

“Məzhəbə təəssübkeşlik etmək.Uca Allah buyurur: *“Sizin dininizə tabe olanlardan başqa heç kəsə inanmayın!”*.[326]

## Şərh:

Bir şeyə azğın şəkildə təəssübkeşlik etmək, onun batil olduğu bilindiyi halda ondan yapışmaqdır.

Cahiliyyat əhlinin məsələlərindən: Məzhəbə batil surətdə təəssübkeşlik olmuşdur.Bu səbəbdən, yəhudilər demişlər: *“Sizin dininizə tabe olanlardan başqa heç kəsə inanmayın!”*.[327] Digər ayədə: *“Yalnız bizə nazil edilənə iman edirik.”*[328] Yəni, ancaq bizim peyğəmbərlərə nazil olana iman edirik.Əslində isə onların, Allahın bütün peyğəmbərlərə nazil etdiyinə iman etməsi vacibdir.Lakin onlar heç öz peyğəmbərlərinə nazil olana belə iman etmirlər.Bu səbəb-dən, Uca Allah demişdir: *“Elə isə, nə üçün Allahın*

---

[326] Ali İmran:73.
[327] Ali İmran:73.
[328] əl-Bəqərə:91.

peyğəmbərlərini öldürürsünüz?!”.[329] Yəni, Allahın sizə nazil etdiyində peyğəmbərlərin qətlə yetirilməsi varmı?

Habelə məzhəb davamçılarının dəlilsiz öz məzhəblərinə tabe olmaları bu növdəndir.Bu səbəbdən, ümumən müsəlmanlara və xüsusi olaraq elm tələb edənlərə istər öz məzhəbi olsun istərsə də, qeyrisinin məzhəbi haqqa tabe olmaq vacibdir.Biz məzhəbdə olan hər bir şeyi, doğru və yanlış görüşləri götürmürük.Biz doğru olanı götürür yanlış olanı isə tərk edirik.Belə ki, sən hənbəli olub malikilərdə yaxud hənəfilərdə yaxud şafiilərdə olan məsələnin doğru olacağını gördüyün zaman məzhəbinə müxalif olsa belə maliki yaxud şafii yaxud hənəfinin sözünü götür! Çünki sənin hədəfin haqqa çatmaqdır.Önəmlisi dəlilə dayanan görüşdür.Vacib olan məhz budur.Bu, elm əhlindən olacağın zaman sənə vacib olacaq.Lakin əgər sən elm əhlindən olmasan sənin etibarlı elm əhlindən soruşmağın gərəkli olacaq.Onların verəcəyi fətvanı götürəcəksən.Doğru üslub məhz budur.Məzhəbin haqq yaxud batil olması fərqinə varmadan həmin məzhəbə təəssübkeşlik etmək, Allahın yəhudilər haqqında xəbər verdiyi kimi cahiliyyat işlərindəndir.

---

[329] əl-Bəqərə:91.

# Əlli altıncı məsələ

## Onlar tövhidi şirk adlandırırlar

"İslama tabe olmağı şirk adlandırmaq.Uca Allah Qurani Kərimdə buyurur: *"Heç bir kəsə yaraşmaz ki, Allah ona kitab, hikmət və peyğəmbərlik bəxş etdikdən sonra o, insanlara: "Allahı buraxıb mənə qul olun!-desin".*[330]

**Şərh:**

Cahiliyyat məsələlərindən: Tövhidi və haqqa tabeçiliyi şirk adlandırmaq.Bu, gerçəyi tam çevirməkdir.Heç şübhəsiz ki, bu, fitrətlərin fəsada uğramasının nəticəsidir.Bu ayə nəsranilərdən olan Nəcran nümayəndə heyəti barəsində nazil olmuşdur.Onlar Peyğəmbərin (salləllahu aleyhi və səlləm) hüzuruna danışıqlar aparmaq üçün gəlmişlər.Onun hüzuruna məscidə daxil olub onunla danışıq aparmağa başlamışlar.Peyğəmbər (salləllahu aleyhi və səlləm) onlara İslama girməyi təklif edib bütün peyğəmbərlərdən, Muhamməd göndərildiyi zaman onlardan biri sağ olacağı təqdirdə ona tabe olacağına dair əhdin alındığını bəyan etmişdir.Onlardan biri dedi: Ey Muhamməd! Bizim sənə ibadət etməyimizimi istəyirsən? Həmin adam haqqa tabeçiliyi şirk və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) ibadət adlandırmışdır.Bunun

[330] Ali İmran:79.

ardından Uca Allah növbəti ayəni nazil etmişdir: *"Heç bir kəsə yaraşmaz ki, Allah ona kitab, hikmət və peyğəmbərlik bəxş etdikdən sonra o, insanlara: "Allahı buraxıb mənə qul olun!-desin".*[331] Çünki peyğəmbərlər şirk deyil yalnız tövhid ilə gəlmişlər.Onlar insanları özlərinə ibadət etməyə çağırmamışlar.Əksinə onlar bunu rədd etmək üçün gəlmişlər.Lakin bu insanlar təəssübkeşlikləri səbəbilə bu sözü demişlər.Uca Allah onların sözlərini rədd edib qeyd olunan ayəni nazil etmişdir.

Tarix necə də təkrarlanır! Hal-hazırda xalis olaraq Allaha edilən ibadəti dindən çıxma və şirk adlandırırlar.Onlar deyirlər: Tövhid və İslam, qəbirlərə ibadət etməkdir.Çünki bu, saleh insanlarla təvəssül etmək və onları sevmək anlamına gəlir. Həmin adamlara görə Peyğəmbərə (salləllahu aleyhi və səlləm) ibadət etməyən və ondan yardım diləməyən Peyğəmbərə (salləllahu aleyhi və səlləm) nifrət bəsləyir və Peyğəmbərin qədir-qiymətini bilmir.Bu, tamamilə Nəcran qəbiləsindən olan nəsranilərin sözünə bənzəyir.Onlar Peyğəmbərə tabeçiliyi ona ibadət etmək kimi anlamışlar.Bu, cahiliyyat əhlinin məsləkinin davamıdır.Hər biri haqqı batil, batili isə haqq adlandırır.

Habelə cəhmilər və mötəzililər Uca Allahın sifətlərini isbat etməyi şirk adlandırmışlar.Çünki bu, onların iddiasına görə həmin sifətlərlə vəsf olunanın bir deyil çoxsaylı olduğunu tələb edir.

---

[331] Ali İmran:79.

# Əlli yeddinci və səkkizinci məsələlər

## Allahın kitabını təhrif etmək və dili əyərək onu oxumaq

**“Sözlərin yerlərini dəyişmək və kitabı dili əyib bükərək oxumaq.”**

## Şərh:

Sözlərin yerini dəyişmək: Hərfləri dəyişmək yaxud sözlərin mənasını dəyişməkdir.Kitab əhlinin çirkin peşəsi: Onlar sözlərin yerlərini, ləfz yaxud məna olaraq dəyişir və onu yanlış şəkildə açıqlamaqla təhrif edirlər.Allahın kəlamını təhrif edən hər bir şəxs cahiliyyat əhlinin yolundadır. İslama mənsub olan zəlalət firqələrindən olan bütün İslama müxalif olan batil əhli məqsədlərinə və məzhəblərinə uyğun gəlsin deyə ləfzləri yaxud mənaları təhrif etməklə və ona yanlış açıqlama verməklə nassları təhrif edirlər.Bu, cahiliyyat əhlinin mirasıdır.

Uca Allahın nazil etdiyinə, dəyişikliyə və təhrif etməyə yol vermədən ləfzləri və mənaları daxil olmaqla və onun tələb etdiyinə əməl etməklə iman etmək vacibdir.Vacib olan budur.İstər bu sənin nəfsi istəklərinə və xoşuna müvafiq gəlsin istərsə də müxalif gəlsin.

Hal-hazırda çirkin təməllər və batil məzhəblər sahibləri Peyğəmbərdən (salləllahu aleyhi və sælləm) varid olan səhih dəlilləri rədd edib təkzib etməyə acız qaldıqları zaman onun mənalarını dəyişir və onu yanlış surətdə açıqlayırlar.Bu, cahiliyyat əhlinin, habelə yəhudilərin yollarından biridir. Mömin qul Allahın kitabı və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsinə ehtiramla yanaşmalı və onun həm ləfzlərinə həm də, mənalarına Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) istədiyi tərzdə iman etməlidir.Mömin nassların mənalarını təhrif etməməli, varid olan ləfzləri əlavə yaxud əksiltmə yolu ilə dəyişməməli və batilə rəvac verməməlidir.

# Əlli doqquzuncu məsələ

## Onlar haqq əhlinə xoşagəlməz ləqəblər qoyurlar

"Onlar doğru yolda olan insanları dindən çıxmışlar və məhrum olmuşlar deyə ləqəbləndirirlər."

---

## Şərh:

Cahiliyyat əhlinin yollarından: Onlar doğru yolda olan insanları kiçildir və onlara çirkin və xoşagəlməz ləqəblər verirlər.Onlar deyilər: Dindən çıxmışlar.Onlar haqq əhlini dindən xaric olanlar deyə adlandırırlar.Çünki onların anlayışına görə haqq, onların küfr və zəlalət olan yoludur.Onlara görə Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tabe olan dindən çıxmışdır.Yəni, onların adətləri, ən-ənələri, məsləki və qayda-qanunları və ata-babalarının yollarından çıxmışdır. Həmçinin onlara pis ləqəblər verirlər.

Habelə onları dar düşüncəli, geridə qalmış, avam və digər adlarla çağırırlar.

Lakin bu, haqq əhlinə zərər verə bilməz.Nuhun tayfası ona demişlər: *"Sənə yalnız içimizdəki səfillərin düşüncəsiz olaraq uyduğunu görürük."*[332] Yəni, dar düşüncəli adamlar. Onlar düşüncə sahibləri deyillər.Onlar sənə düşüncəsiz

[332] Hud:27.

**olaraq tabe olmuşlar.Tədbirli olan ağıllı insanlar isə sənə tabe olmamışlar.**

# Altmış və altmış birinci məsələlər

## Allaha iftira yaxmaq və haqqı təkzib etmək

**"Allaha iftira yaxmaq və haqqı təkzib etmək".**

## Şərh:

Uca Allaha və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) iftira yaxmaq və haqqı təkzib etmək cahiliyyat əhlinin yollarındandır.Belə ki, onlar Kəbəni çılpaq təvaf etdikləri zaman bu rüsvayçılıq barısində deyirdilər: *"Atalarımızı belə gördük. Bunu bizə Allah əmr etmişdir".*[333] Bu, Allahın adından deyilən yalandır. *"Allaha iftira yaxan və Onun ayələrini yalan hesab edən kəsdən daha zalım kim ola bilər?!".*[334] *"Onlar bilə-bilə Allaha qarşı yalan söyləyirlər."*[335] *"Yalanı ancaq Allahın ayələrinə inanmayanlar uydururlar. Onlar əsl yalançıdırlar!".*[336] *"Diliniz yalana vərdiş etdiyi üçün: "Bu halaldır, o haramdır!"- deməyin, çünki (bununla) Allaha iftira yaxmış olursunuz. Allaha iftira yaxanlar nicat tapmazlar!"*[337]

Habelə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) adından yalan danışıb onun demədiyi hədisləri onun adından uydurmaq.Bu hədisləri araşdırmadan və dəqiqləşdirmədən danışan şəxs yalançılardan biridir.Səhih hədisdə Peyğəmbər

[333] əl-Əraf:28.
[334] əl-Ənam:21.
[335] Ali İmran:78.
[336] ən-Nəhl:105.
[337] əm-Nəhl:116.

(salləllahu aleyhi və salləm) demişdir: “Əgər biri yalan olduğunu gördüyü halda məndən bir hədis danışarsa o, yalançılardan biri olar.”[338]

Bu, cahiliyyat əhlinin peşəsidir.Onlar Allaha iftira yaxıb Allahın onlara təvafda övrətləri açmağı əmr etdiyini iddia etmişlər.Onlar Allahın halal etdiyini haram edib Allahın bunu onlara buyurduğunu iddia etmişlər. *“Əgər Allah istəsəydi, nə biz, nə də atalarımız Ondan başqa heç bir şeyə tapınmazdıq”.*[339] *“Əgər Allah istəsəydi, nə biz, nə də atalarımız müşrik olardıq.”*[340] *“Əgər Rəhman istəsəydi, biz onlara ibadət etməzdik.”*[341] Bütün bu sözlər Uca Allaha qarşı deyilən yalandır.Çünki Uca Allah peyğəmbərləri məhz onların etdiklərini inkar etmək üçün göndərmişdir.

Bir sözlə, Allaha və Peyğəmbərə (salləllahu aleyhi və salləm) yalanı nisbət etmək cahiliyyat əhlinin işlərindəndir. Müsəlmanın bu çirkin əməldən həzər etməsi gərəkdir.Bəzən insan Allahın adından yalan danışmağı qəsd etmir lakin Allahdan və Peyğəmbərdən məsələləri nəql etməkdə səhlənkarlıq edir.Habelə fətvaları araşdırmır.İnsan yanlış məlumatı ona dair qəti bilgi olmadığı halda insanlar arasında yayacağı zaman o, yalançılardan birinə çevriləcək və onlara nəql etdiyi və onlar arasında yaydığı sözlərlə onlara zərər vermiş olacaq.

---

338 Muslim:1.Tirmizi:2662.İbn Macə:41.Əhməd:4/255.

339 ən-Nəhl:35.

340 əl-Ənam:148.

341 Zuxruf:20.

Yalan və qondarma hədisləri yaymamaq və onu ravəyat etməmək vacibdir.Əksinə həmin hədisləri mümkün qədər çərçivəyə salmaq və sıx dairəyə daxil etmək gərəkdir. Habelə moizəçilər və dəvətçilər Allahdan və Peyğəmbərdən xəbər verdiklərini araşdırmalıdırlar.Həmçinin halal və haram, habelə fətva işlərində əmin olmaları və tələskənliyə yol verməmələri gərəkdir.Çünki bu məsələdə yanlışlıq etmək Allahın adından elmsiz danışmaqdır.Habelə Allahdan və Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) sabit olan haqqı təkzib etmək Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) adından yalan danışmaqdan heç də kiçik cinayət deyil.Uca Allah buyurur: *"Allaha qarşı yalan uydurub söyləyən və özünə gələn həqiqəti təkzib edən kimsədən daha zalım kim ola bilər?".*[342] Belə ki, haqq insanın nəfsi istəklərinə uyğun gəlmədiyi zaman o, onu təkzib etməyə və şübhə altına salmağa çalışır.

---

[342] əz-Zumər:32.

# Altmış ikinci məsələ

## Hökmdarları haqq əhlinə qarşı qaldırmaq

"Onlar dəlil önündə aciz qaldıqları zaman hökmdarlara şikayət etməyə əl atmışlar.Onlar demişlər: *"Musanı və tayfasını fitnə-fəsad törətmək, həm səni, həm də sənin ilahlarını atıb getmək üçünmü rahat buraxacaqsan?"*.[343]

---

Şərh:

Cahiliyyat əhlinin məsələlərindən: Onlar dəlil önündə acız qaldıqları zaman hökmdara şikayət etməyə əl atmışlar. Dəlil önundə acız qaldıqları zaman, yəni onlara sahib olduqları yolun batil olduğu sübut olunduğu zaman.Onların müqavimət göstərəcək heç bir hüccəti olmadığı zaman onlar üstün gələn haqqın qarşısını almaqdan ötrü gücə əl atırlar. Firon Musaya (aleyhi-s-sələm) demişdir: *"Əgər məndən başqa ilah qəbul etsən, səni mütləq dustaq edəcəyəm!"*.[344] Fironun Allahın elçisini rədd edəcək hüccəti olmadığı zaman sahib olduğu güc-qüvvətə əl atmışdır; *"səni mütləq dustaq edəcəyəm"*.Bu, məğlubların üslubudur.Habelə Musa firon və onun davamçılarına, onların təşkil etdikləri böyük yığıncaqda qalib gəlmişdir.Firon Musanın gətirdiyi ayələri puça

---

[343] əl-Əraf:127.
[344] əş-Şuara:29.

çıxartmaq üçün dünyanın hər tərəfindən sehrbazları toplamışdır.Çünki firon Musanın sehrbaz olduğunu iddia edirdi.O, sehrbazları yığıb, sehrbazların Musa üçün hazırladıqlarını nümayiş etdirmək və özünün Musanın möcüzəsinə müqavimət göstərəcək şeyə sahib olduğuna insanları inandırmaq üçün Musadan görüş vaxtını təyin etməyi tələb etmişdir.

Vaxt gəlib çatdığı və insanlar baş verəcək hadisələri izləmək üçün toplaşdıqları zaman sehrbazlar əllərində olan sehri atdılar və ani olaraq onların sehri, habelə civə və sanki diriymiş kimi əşyaları hərəkətə gətirən digər şeylərlə doldurduqları əsalar və iplər bütün vadini bürüdü.Onlar bununla Musanın möcüzəsinə, əsanın ilana çevrilməsinə oxşar sehr gətirmək istəmişlər.Beləliklə də, onlar böyük bir sehr ortaya qoymuşlar.Uca Allah hətta Musanın belə qorxduğunu xəbər verib buyurur: *“Musanın canına qorxu düşdü.”*[345] Musa Allahın ona verdiyi möcüzəyə və Allahın ona zəfər bəxş edəcəyinə əmin idi.O, sadəcə sehrbazların insanları çaşqınlığa salmalarından qorxmuşdur.Çünki Uca Allahın xəbər verdiyi kimi onlar: *“Böyük bir sehr göstərdilər.”*[346]

Uca Allah Musaya (aleyhi-s-salam) əsanı atmağı əmr etdi. Musa əsanı atdığı zaman əsa nəhəng bir ilana çevrildi və sehrbazların düzüb qoşduqları bütün şeyləri uddu. Sehrbazlar həmin ilanın onlara yetişəcəyindən qorxaraq

---

[345] Tahə:67.
[346] əl-Əraf:116.

Musaya buna son qoymaq üçün yalvarmağa başlamışlar. Çünki onlar həmin ilanın onları həmçinin udacağından qorxmuşlar.Məhz bu zaman Musanın zəfəri gəlmişdir.Uca Allah buyurur: *"Artıq haqq zahir, onların uydurub düzəltdikləri yalanlar isə batil oldu.(Firon və adamları) orada məğlub edildilər və xar olaraq geri döndülər.Sehrbazlar isə, səcdəyə qapanıb dedilər: Biz iman gətirdik aləmlərin Rəbbinə - Musanın və Harunun Rəbbinə!".*[347] Çünki onlar Musada olanın sehr olmadığını bilmişlər. Sehrbazlar iman gətirib Uca Allaha səcdəyə qapandıqları zaman firon onları qətl və çarmıxa çəkməklə hədələmişdir.Son olaraq firon Allaha iman gətirən və Allaha tövbə edən sehrbazları çarmıxa çəkib onları öldürmüşdür.Daha sonra fironun əyanı Musaya iman gətirən İsrail oğullarına üz tutub firona demişlər: *"Musanı və tayfasını fitnə-fəsad törətmək, həm səni, həm də sənin ilahlarını atıb getmək üçünmü rahat buraxacaqsan?" (Firon onlara) belə cavab verdi: "Biz onların oğullarını öldürəcək, qadınlarını isə diri saxlayacağıq.Biz onlara, mütləq, qələbə çalacağıq! Musa öz tayfasına: Allahdan kömək diləyin və səbir edin. Yer üzü Allahındır.Qullarından istədiyini onun varisi edər.Xoş sonluq müttəqilərindir!- dedi."*[348]

Aydın olur ki, həmin adamlar güc işlətmək istəmiş və bu haqqı və imanı əzmək üçün firona şikayət etmişlər.Bu, hər zaman və məkanda onlara bənzəyənlərin etdikləri hərəkət-dir.

---

[347] əl-Əraf:118-122.
[348] əl-Əraf:127-128.

# Altmış üçüncüdən altmış yeddinciyə qədər olan məsələlər:

# Haqq əhlinə qarşı əsassız ittihamlar irəli sürmək

**“Onlar haqq əhlini pis surətdə təqdim edirlər.Onlar haqq əhlini, ayədə gəldiyi kimi yer üzündə fitnə-fəsad törətməkdə, hökmdarın dinini və ilahlarını kiçiltməkdə və dini dəyişdirməkdə ittiham edirlər.”**

---

**Şərh:**

Həmçinin cahiliyyat əhlinin yollarından: Onlar güc-qüvvət sahiblərinə şikayət etməklə kifayətlənməyib üstəlik iman əhlini yer üzündə fitnə-fəsad törətməkdə ittiham edirlər.Belə ki, onlar firona demişlər: *“Musanı və tayfasını fitnə-fəsad törətmək, həm səni, həm də sənin ilahlarını atıb getmək üçünmü rahat buraxacaqsan?”.*[349] Onlar islahı fəsad adlandırırlar.Əslində isə tam fərqlidir.Çünki yer üzündə nizam-intizamın qurulması iman və tövhidlə olur.Küfr, günahlar, cinayətlər, zülm və tuğyan isə yer üzündə törədilən fitnə-fəsaddır.Musa və onun tayfası xeyir üzərə idilər, firon və onun ətrafı isə fitnə-fəsad törədirdilər.Lakin onlar gerçəyi

[349] əl-Əraf:127.

dəyişib islahı fəsad adlandırmışlar.Bu, hər zaman kafirlər, müşriklər və münafiqlərin adəti olmuşdur.Onlar elm və hikmətlə Allaha çağıran xeyir əhlini və Allahın tövhidinə və Allaha ibadətə çağıran möminləri yer üzündə fitnə-fəsad törədənlər deyə adlandırmışlar.

Bu, qiyamət gününəcən insanlarda olacaq bir xislətdir. Küfr, zülm və tüğyan əhli Allaha çağıran insanları fitnəkar deyə adlandırırlar.Bu, firon və onun tayfasının dönəmindən günümüzə çatan bir təzahürdür.Ancaq onların verdikləri bu ləqəblər iman və təqva əhlinə zərər verə bilməz.Əsrlər boyu bu cür şəxslər Allaha çağıran insanları ən çirkin adlarla çağırmışlar.Onlar Şeyxul-İslam ibn Teymiyyəni (rahmətullahi aleyhi) pis ləqəblərlə çağırmışlar.Habelə şeyx Muhamməd bin Abdul-Vahhəbi çirkin ləqəblərlə çağırmış və onun xarici (xəvariclərdən) olduğunu, habelə insanların əqidəsini dəyiş-mək istədiyini, insanları təkfir etmək istədiyini iddia etmişlər, habelə həmin adamların kitablarında mövcud olan digər ittiham, böhtan və şərli sözlər.Bu, onların Allaha çağıran insanlara qarşı olan mövqeyidir.

Habelə onlar Allaha çağıran insanları hökmdarın dinini kiçiltməkdə ittiham etmişlər.Uca Allah buyurur: "*Sənin ilahlarını atıb getmək.*" Habelə buyurur: *"Doğrusu, mən onun sizin dininizi dəyişdirəcəyindən və yer üzündə fitnə-fəsad törədəcəyindən qorxuram".*[350]

---

[350] Ğafir:26.

Cahiliyyat əhli və onlara bənzəyənlər nüfuz sahiblərini, Allaha elm və doğru üslubla çağıran möminlərə qarşı qızışdırır və onların nüfuz sahiblərinin dinini və siyasətini pozduqlarını deyirlər.Möminlər hökmdarlara, onlar və onların mal-mülkü üçün daha xeyirli olanı tövsiyə edib onlara nəsihət etdikləri zaman bunlar bu cür işlərə əl atırlar.Uca Allahın firon əhli haqqında xəbər verdiyi əhvalat buna bariz nümunədir.Belə ki, Musa fironu tək və şəriksiz Allaha ibadət etməyə çağırdığı və bunun onun, onun mülkü və rəiyyəti üçün daha xeyirli olacağını dediyi zaman onlar demişlər: “Bu adamlar insanları sənin əleyhinə qaldıracaq və nəticədə sənin insanlar üzərində olan rübubiyyətin və üluhiyyətin gedəcək.Onlar insanları sənə ibadət etməkdən Allaha ibadət etməyə döndərəcəklər.” Həmin adamlar fironu qızışdırıb onun Musanı və tayfasını rahat buraxacağı təqdirdə onların insanları firona ibadət etməkdən və onu rəbb bilməkdən döndərəcəklərini demişlər.Çünki firom insanlara belə deyirdi: *“Mən sizin uca rəbbinizəm!”*.[351] Digər ayədə demişdir: *“Mən sizin üçün özümdən başqa bir ilah olduğunu bilmirəm.”*[352] Onlar peyğəmbərlərin çağırışını fitnə-fəsad, küfrü isə yer üzündə islah kimi açıqlamışlar.Heç şübhəsiz ki, bu, gerçəyi dəyişmək və rəhbər və rəiyyəti aldatmaqdan başqa bir şey deyil.Günümüzdə həmçinin həmin şeytani vəzifəni icra edən, insanları uçuruma aparan və Allaha çağıranların qarşısını almaq üçün gerçəyi təhrif edib hakim qüvvələri qızışdıran insanlara rast gəlmək

---

[351] ən-Nəziat:24.
[352] əl-Qasas:38.

mümkündür.Onlar məsul şəxslərlə nəsihətin qəbul edilməsi arasında sədd çəkirlər.

Allahın əmr sahiblərini və onların ətrafını islah elə və onları hidayət üzərə olan hidayət imamlarından elə!

Hökmdarların ilahlarını kiçilitmək məsələsi.Bu məsələ ayədə qeyd edildiyi kimidir.Həmin məsələ, Uca Allahın ayədə firon ailəsi haqqında qeyd etdiyi kimi öncəki məsələyə bağlıdır.Onlar demişlər: *"Musanı və tayfasını fitnə-fəsad törətmək, həm səni, həm də sənin ilahlarını atıb getmək üçünmü rahat buraxacaqsan?".*[353] Onlar burada insanların fironu ilahiləşdirib ona ibadət etmələrini qəsd etmişlər.Onlar deyirlər: Sənin şənin və yer üzündə əzəmətin vardır.Əgər sən onları Allaha çağırmaqda rahat buraxsan onlar sənin şənini kiçildib insanlar önündə sənin dəyərini salacaqlar.Gəl sən heybətini və məqamını qorumaq üçün onlara son qoymağa tələs! Bu, fironu aldatmaq və onu həlaka sürükləməkdir.

Subhanəllah! Onlar göylərin və yerin Rəbbi olan Uca Allahın şənini kiçildir, özlərinə isə bunu sığışdırmırlar. Musa və onun tayfası firon və onun əyanına nəsihət edib onlara səadət və qurtuluş yolunu və mülkün xeyir üzərə qalmaq yolunu göstərtdikləri zaman onlar Musa və onun tayfasını yamanlamışlar.İnsanın ətrafında olan yaramazlar daimə bu kimi hərəkətlər edirlər.Bu səbəbdən, əmr sahib-lərinin saleh və xeyirxah insanları ətrafına yığması və yara-

353 əl-Əraf:127.

maz insanlardan, habelə dağıdıcı əsaslara və azğın fikirlərə sahib olanlardan uzaq durması gərəkdir.Çünki onlar insanı uçuruma aparırlar.Fironun ətrafı məhz bu cür olmuşdur. Onlar fironu həlaka sürükləyib onunla haqqın qəbul olunması arasında sədd çəkmişlər.

Habelə həmin adamlar haqq əhlinin onların dinini dəyişdirdiklərini iddia etmişlər.Uca Allah firon haqqında buyurur: *Doğrusu, mən onun sizin dininizi dəyişdirəcəyindən və yer üzündə fitnə-fəsad törədəcəyindən qorxuram".*[354] Onlar hökmdarın dinini kiçiltdiklərini iddia etmişlər. *"Həm səni, həm də sənin ilahlarını atıb getmək".*[355]

Bu iki məsələ, Musa ilə firon arasında baş vermişdir. Musa insanları Allaha çağırdığı zaman o, insanları həmin çağırışı qəbul etməkdən çəkindirmiş və öz rəiyyətinin qayğısına qaldığını nümayiş etdirmişdir.O, özünü səmimi bir insan, habelə dini və yer üzündə əmin-amanlığı qoruyan bir şəxs kimi göstərmişdir. *"Yer üzündə fitnə-fəsad törədəcəyindən qorxuram".*[356]Habelə fironun əyanı ona demişlər: *"Musanı və tayfasını fitnə-fəsad törətmək üçünmü rahat buraxacaqsan?".*[357] Saleh insanları fitnə-fəsad əhli adlandırmışlar.Onlara görə tövhid, Allahı ibadətdə təkləşdirmək və şirkdən xilas olmaq fitnə-fəsaddır.Çünki qəlblər fəsada uğrayacağı zaman haqqı batil, batili isə haqq olaraq görəcək.

---

354 Ğafir:26.
355 əl-Əraf:127.
356 Ğafir:26.
357 əl-Əraf:127.

**Dini dəyişən və yer üzündə fitnə-fəsad törədən kimdir? Tövhid dinini küfr və şirklə dəyişən firon!**

Musa peyğəmbər isə insanları doğru dinə çağırmışdır. Uca Allah insanları bu dindən ötrü yaratmışdır.Yer üzünün yalnız bunun sayəsində düzəlməsi mümkündür.Çünki dünya yalnız Allaha ibadət etməklə düzələ bilər.Şirk, küfr və günahlar isə yer üzündə fitnə-fəsadın mənbəyidir.

# Altmış səkkizinci məsələ

## Onlar sahib olmadıqları vəsflərlə özlərini tərifləmişlər

**“Onlar, tərk etdikləri bir halda sahib olduqları haqqa əməl etdiklərini iddia etmişlər.*”Bizə özümüzə nazil edilənə iman edirik.”*[358]**

---

## Şərh:

**Cahiliyyat əhlinin məsələlərindən: Yəhudilər tərk etdiklərinə rəğmən onlarda olan haqqa əməl etdiklərini iddia etmişlər.Uca Allah buyurur:** *“Onlara: Allahın nazil etdiklərinə inanın!- **deyildikdə, onlar: Biz özümüzə nazil edilənə iman edirik, -deyirlər.”**[359]* “***Biz özümüzə nazil edilənə iman edirik***”. **Onun** mənası haqqında deyilmişdir: İsrail oğullarından **göndərilən** peyğə**mbərlərə nazil edilənə iman edirik.Çünki bu ayə yəhudilər** haqqında nazil olmuşdur. **Halbuki Muhamm**ə**din (salləllahu aleyhi və səlləm) gətirdiyi din** onların peyğə**mbərlərinin gətirdiyinə müxalif deyil.*”Ondan*** *başqasına isə **küfr edirlər”.**[360]* **Yəni,** İsa və **Muhammədə nazil olana küfr edirlər.** *“Halbuki o onların əllərində olanı təsdiq*

[358] əl-Bəqərə:91.
[359] əl-Bəqərə:91.
[360] əl-Bəqərə:91.

*edən bir həqiqətdir.”*[361] İsa və Muhamməd peyğəmbərin gətirdikləri din onların peyğəmbərlərinin gətirdikləri haqqa müvafiqdir və həmin peyğəmbərlərin kitablarına daxil etdikləri təhrifləri, yalanları və zəlalətləri açıqlayandır.Bu, bir cəhətdəndir.

Digər cəhətdən: Onlar bu sözlərində doğru deyillər.Bunu növbəti ayədə onların qeyd edilmiş cinayətləri işlətmələri göstərir.Uca Allah onların dediklərini rədd edərək buyurur: *“Onlara söylə: Əgər siz iman edən kəslərsinizsə, bəs nə üçün əvvəllər Allahın peyğəmbərlərini öldürürdünüz?” Musa sizə açıq-aydın dəlillər gətirmişdi. Siz isə onun ardınca buzova sitayiş edərək (özünüzə) zülm etdiniz.”*[362]Uca Allah onların sözlərini iki yöndən rədd etmişdir:

Birinci: Muhammədin (salləllahu aleyhi və səlləm) gətirdiyi din Musanın gətirdiyi tövhid dininə, Allahı ibadətdə təkləşdirməyə və Ondan savayı məbudları tərk etməyə müxalif deyil. Əksinə onun gətirdiyi Musanın dinini təsdiq edir.

İkinci: Onlar hətta Musaya iman gətirmələri iddiasında belə sadiq deyillər.Çünki onlar buzova ibadət etmiş və peyğəmbərləri öldürmüşlər.Onlar demişlər: *“Eşitdik və asi olduq”*. Yəhudilər, onlardan alınmış əhdə vəfa etməmişlər. Bu isə hər bir yaramaz təəssübkeşliyi şamil edir.İnsanlar deyirlər: Mən yalnız məzhəbimdə olana yaxud imamımın məzhəbində olana əməl edəcəyəm.Əslində isə müsəlmanın istər öz məzhəbində istərsə də qeyrisinin məzhəbində olsun, habelə imamında yaxud qeyrisində olsun, haqqa tabe olması

---

[361] əl-Bəqərə:91.
[362] əl-Bəqərə:91-92.

gərəkdir.Müsəlman haqqı qəbul edib yaramaz təəssübkeşliyə düşməməlidir.

# Altmış doqquzuncu və yetmişinci məsələlər

## Allahın buyurduğu ibadətlərə əlavələr və əksiltmələr gətirmək

"İbadətdə, Aşura günündə edildiyi kimi əlavələr etmək, habelə Arafatda duruşu tərk etmək kimi əksiltmə etmək."

---

**Şərh:**

"İbadətdə əlavələr etmək: Buna misal, Aşura günündə edilən hərəkətlər.Aşura günü Məhərrəm ayının onuncu günüdür.Bu gündə böyük bir hadisə baş vermişdir.Uca Allah bu gündə firon və onun tayfasını dənizdə batırmış və Musa və onun tayfasını xilas etmişdir.Bu, haqqın batilə qalib gəldiyi gündür.Nəhayət Musa Allaha şükr olaraq bu gündə oruc tutmuş və onun orucu müsəlmanların şəriətində həmçinin öz təsdiqini tapmışdır.Çünki Peyğəmbər (salləllahu aleyhi və səlləm) Mədinəyə hicrət etdiyi zaman yəhudilərin bu gündə oruc tutduğunu gördü.Onlardan: Nə üçün oruc tutursunuz?-deyə soruşduğu zaman demişlər: Uca Allah bu gündə Musa və onun tayfasını xilas etmiş və firon və onun tayfasını məhv etmişdir.Musa bu gündə oruc tutmuş, bizə də onun kimi oruc tuturuq.Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: "Biz Musaya sizdən daha yaxınıq".[363] Bununla da,

---

[363] Buxari:3727.Muslim:1130.İbn Macə:1734.Əhməd:1/310.Dərimi:1759.

Peyğəmbər (salləllahu aleyhi və sələm) oruc tutdu və digərlərinə onu əmr etdi.Habelə o, yəhudilərə müxalif olmaq üçün bir gün öncə yaxud bir gün sonra da, oruc tutmağı əmr etdi.

Aşura gününə dair şəriətdə öz təsdiqini tapan əməl budur.Bu gündə oruc tutmaqdır.Lakin cahiliyyat əhli həmin gündə tutulan oruca digər əməllər əlavə edirlər.Yəhudilər bu günü bayram edir və həmin gündə evlərini, habelə uşaqlarını və qadınlarını bəzəyirlər.Onlar bu günü bayram günü hesab edirlər.Onlar varid olana əlavə gətirmişlər.Aşura gündə tutulan oruca əlavələr gətirmək cahiliyyat əhlinin dinindəndir.

Həmçinin rafizilər bu günə əlavələr gətirib həmin günün hüzn və kədər, ağlaşma və matəm günü olduğunu hesab etmişlər.Çünki bu gündə Hüseyn (r.a) qətlə yetirilmişdir.

İbadətdə əksiltmə etmək: Buna misal, onların həcc mərasimində etdikləridir.Onlar cahiliyyat dönəmində həcc edərdilər.Çünki həcc İbrahimin dinindən qalan bir ibadət olmuşdur.Lakin onlar həccə müxtəlif dəyişikliklər və şirk əməllər daxil etmişdilər.Uca Allaha həcc mərasimində Arafatda duruşu buyurduğu halda onlar Arafatda deyil Müzdəlifədə durardılar.Bu isə, ibadətdə əkslitmədir.Peyğəmbər (salləllahu aleyhi və sələm) həcc etdiyi zaman onlar Peyğəmbərin onlarla birgə Müzdəlifədə duracağını düşündülər.O, isə həmin yeri adlayıb Arafatda durdu və İbrahimin həccini bərpa etdi.Uca Allah buyurur: *"Sonra camaatın döndüyü*

***yerdən siz də dönün!”.***[364] Yəni, Arafatdan.Bu, müşriklərin Müzdəlifədə duruşuna bir cavab olmuşdur.Habelə onlar “təlbiyə” zikrinə əlavə edib demişlər: **“illə şərikən huvə ləkə təmlikuhu və mə mələk”.**

İbadətdə hər hansı bir şeyi əksildən yaxud ona əlavə edən insan cahiliyyat əhlinin dini üzərindədir.Bidət və xurafatlar həmçinin bütövlüklə cahiliyyat dinindəndir.

364 əl-Bəqərə:199.

# Yetmiş birinci məsələ

## Onlar zahidlik üzündən Allahın onlara vacib buyurduğunu tərk etmişlər

**"Zahidlik səbəbilə vacibi tərk etmək".**

Şərh:

Bunun mənası: Onlar vacibi tərk etməklə Allaha yaxınlaşırlar.Buna misal həcc mərasimində Arafat əvəzinə Müzdəlifədə durmalarıdır.Onlar bunun zahidlik olduğunu iddia edirlər.Onlar Həram əhli olduqları üçün Arafata çıxmadıqlarını deyirdilər.Çünki bu, ehramdan çıxmaqdır.Onlar zahidlik adı ilə haqqı tərk edirlər.Bu isə, cahiliyyat əməlidir.

Həmçinin onların zahidlik adı altında haqqı tərk etmələrinə digər misal olaraq Kəbəni çılpaq təvaf etmələrini göstərmək olar.Onlar haqq olan övrətin örtülməsini zahidlik səbəbilə tərk edib deyirdilər: Biz Allaha asi olduğumuz paltarda Kəbəni təvaf edə bilmərik.

Həmçinin zahidlik adı altında ibadətlərdən hər hansı birini tərk edən şəxs bura daxildir.Buna misal, riyakarlıqdan qorxaraq sədəqə verməyən və camaatla məsciddə namaz qılmayan şəxsdir.Habelə riyakarlıqdan qorxaraq elm tələb etməyən yaxud digər ibadətləri tərk edən şəxslərdir.

# Yetmiş ikinci və üçüncü məsələlər

## Onlar pak ruzini və zinətləri tərk etməklə Allaha yaxınlaşırlar

**“Onlar pak ruzini və gözəl libasları tərk etməklə Allaha yaxınlaşırlar.”**

## Şərh:

Bunun mənası: Onlar pak ruziləri və gözəl libasları tərk etməklə Allaha yaxınlaşırlar.Bu, nəsranilərin və İslama mənsub olub özlərini onlara oxşadan sufilərin yoludur.Onlar halal nemətləri Allaha yaxınlaşmaq üçün tərk edirlər. Onlar qadınlarla evlənmir, pak ruzilər yemir və yemək, içmək və libaslarda zahidlik göstərir və bunun Allaha ibadət olduğunu iddia edirlər.Bu səbəbdən Uca Allah buyurur: *“De: Allahın Öz qulları üçün yaratdığı zinəti və təmiz ruziləri kim haram etmişdir?”.*[365] Habelə buyurur: *“Allahın sizə halal buyurduğu pak nemətləri (özünüzə) haram etməyin.”*[366] Habelə onlar bəzi davar heyvanlarını haram etmişlər.Uca Allah isə davar heyvanını halal etmişdir.Uca Allah buyurur: *“Davar heyvanları sizə halal edildi.”*[367] Onlar bütlərindən ötrü bəzi davar heyvanlarını haram etmişlər.Uca Allah buyurur: *“Ey iman gətirənlər! Allahın sizə halal buyurduğu pak nemətləri*

---

[365] əl-Əraf:32.

[366] əl-Maidə:87.

[367] əl-Maidə:1.

*(özünüzə) haram etməyin və həddi aşmayın. Doğrudan da, Allah həddi aşanları sevməz!"*[368]

Pak ruziləri haram etmək rahib nəsranilərin və cahiliyyat əhlinin dinindəndir.Əgər biri icma ilə halal olan ruzini haram edərsə İslam dinindən çıxmış olar.İnsan bu əmələ Allaha yaxınlaşmaq iddiasını əlavə edəcəyi zaman isə bu, Allaha qarşı deyilən iftira sayılacaq.Çünki Uca Allah qullarına pak ruziləri tərk etməyi buyurmamışdır.Əksinə Uca Allah həmin ruzilərdən yararlanmaq əmrini vermişdir. *"Ey peyğəmbərlər! Təmiz nemətlərdən yeyin və yaxşı işlər görün!".*[369] *"Ey iman gətirənlər! Sizə verdiyimiz ruzilərin halalından yeyin!".*[370] Peyğəmbərin (salləllahu aleyhi və sələm) dönəmində bəzi insanlar bu kimi işlər etmək istədikləri zaman Peyğəmbər (salləllahu aleyhi və səlləm) onlara öz narazılığını bildirmişdir.

Habelə onlar Allaha yaxınlaşmaq məqsədilə gözəl libasları tərk edib Kəbəni çılpaq şəkildə təvaf etmişlər.Uca Allah onların etdiklərini rədd edib buyurur: "*Zinəti və təmiz ruziləri kim haram etmişdir?*" Yəni, sizin gözəl libası, bəzənməyi və pak ruziləri tərk etməyə dəliliniz nədir? Çünki haram etmək üçün dəlil gərəkdir.Libasın, yemək və içməyin əsli halaldır.Çünki Uca Allah bu ruziləri qulları üçün yaratmışdır.Səhih hədisdə gəlmişdir: "Allah gözəldir və gözəl olanı sevir."[371] Zahidlik məqsədilə gözəl geyinməyi

---

[368] əl-Maidə:87.

[369] əl-Muminun:51.

[370] əl-Bəqərə:172.

[371] Muslim:91.Tirmizi:1999.Əhməd:1/399.

tərk etmək İslam dinindən deyil.İnsanın gözəl libaslar geyinməsi, pak ruzilər yeməsi və Allaha şükr etməsi gözəl işdir.Hədisdə gəlmişdir: “Uca Allah quluna Öz nemətini əta etdiyi zaman nemətinin izlərini onun üzərində görməyi sevir.”[372] Lakin bunun israf və lovğalıq dərəcəsinə çatmaması gərəkdir.Belə ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) bədəni və libasını gözəlləşdirər və xüsusi olaraq nümayəndə heyət-lərini qarşıladığı zaman daha çox bəzənərdi.

[372] Tirmizi:2819.

# Yetmiş dördüncü məsələ

## Onlar insanları zəlalətə çağırırlar

**"Onlar elmsiz şəkildə insanları zəlalətə çağırırlar."**

**Şərh:**

Elmsiz şəkildə Allaha çağırmaq cahiliyyat əhlinin əməlidir.Çünki Uca Allah Onun yoluna elm, hikmət, gözəl moizə və gözəl şəkildə olan mübahisə ilə çağırmağı əmr edir.

Onların insanları zəlalətə çağırmaları, insanları haqqa müxalif olmağa təşviq etmələridir.Uca Allah buyurur: *"Kafir olanlar iman gətirənlərə dedilər: Bizim yolumuza tabe olun. Günahlarınızı öz boynumuza götürərik".*[373] İnsanları şirkə və heç bir dəlil olmadan halalı haram etməyə, haramı isə halal etməyə çağırırlar.Onlar insanları, Allahın heç bir dəlil nazil etmədiyi işlərə çağırırlar.Bunlar zəlalət dəvətçiləridir.Haqqa dəvət edənlər Allahın nazil etdiyinə və Onun buyurduğuna çağıranlardır.

Günümüzdə olan zəlalət çağırışçıları insanları şirkə, qəbirlər və məzarlara tapınmağa, habelə Allahın heç bir dəlil nazil etmədiyi dində bidət və yeniliklərə çağıranlardır. Onlar bidət və yenilikləri dirçəltmək üçün kitablar yazır və bu

[373] əl-Ənkəbut:12.

haqda geniş danışırlar.Habelə insanları pozğunluq, fasiqlik və günahlara çağıranlar.Bütün bunlar zəlalət çağırış-çılarıdır.Uca Allah bizi onlardan və onların yolundan çəkindirib buyurur: *“Ey iman gətirənlər! Əgər kafirlərə itaət edəcək olsanız, onlar sizi geri döndərər və siz də zərər çəkmiş halda geri dönərsiniz”.*[374] Habelə buyurur:*“Ey iman gətirənlər! Əgər siz kitab əhli olanlardan bir dəstəyə uyarsınızsa, onlar sizi iman gətirəndən sonra döndərib kafir edərlər.”*[375] Habelə buyurur: *“Onlar sizi cəhənnəmə çağırdıqları halda, Allah sizi Öz izni ilə cənnətə, və məğfirətə çağırır”.*[376] Habelə buyurur: *“Əgər yer üzündə olanların çoxuna itaət etsən, onlar səni Allahın yolundan azdırarlar. Onlar ancaq zənnə uyar və ancaq yalan danışarlar!”.*[377] Uca Allah, kafirlərin qədim və son zamanlarda müxtəlif dinlərə mənsub olmalarına rəğmən hər zaman və hər yerdə zəlalətə çağırış yolunda səy göstərdik-lərini xəbər vermişdir.Uca Allah onlar haqqında buyurur: *“Onlar özləri kafir olduqları kimi, sizin də kafir olub özlərilə bərabər olmanızı istərlər.”*[378]

---

[374] Ali İmran:149.
[375] Ali İmran:100.
[376] əl-Bəqərə:221.
[377] əl-Ənam:116.
[378] ən-Nisə:89.

# Yetmiş beşinci məsələ

## Onlar bilə-bilə insanları küfrə çağırırlar

"Onlar bilə-bilə insanları küfrə çağırırlar."

---

**Şərh:**

Bu, zəlalət dəvətçilərinin digər bir növüdür.Onlar bilə-bilə həddi aşaraq və inadkarlıq edərək insanları haqqdan döndərməyə çağırırlar.Birinci növ insanlar haqqı bilmədikləri halda insanları batilə çağırırlar.Hər iki növ insanlar təhlükəlidir.Onlar: Kafir olun!-demirlər.Onlar yalnız zahiri gözəl daxili isə küfr olan bər-bəzəkli bir üslubla insanlara yol tapırlar.Zəlalət çağırışçıları məhz bu cür olurlar.Habelə iblis Nuhun tayfasına gəlib onların ölmüş saleh insanlardan ötrü kədər içində olduqlarını gördüyü zaman onlara din adı ilə yol tapmış və demişdir: Onların surətlərini düzəldin ki, onlara tamaşa etdiyiniz zaman ibadətə istəyiniz artsın.Siz onların əməllərini, xeyirxahlıqlarını və dindarlaqlarını xatırladığınız zaman bu sizi ibadət etməyə sövq edəcək.İblis onlara nəsihətçi olaraq, din yolu ilə gəlmişdir. Əslində isə o, əvvəldən həmin surətlərin sonda bütlərə çevrilməsini istəyirdi.Nəhayət elm əhli və həmin nəsil ölüb getdiyi zaman onların surətləri həqiqətən də, bütlərə çevrilir.Onlardan sonraki cahil nəsil gəldikdə şeytan onlara deyir: Sizin ata-babalarınız həmin surətləri yalnız onlara ibadət etmək üçün

dikəltmişlər.Nəticədə onlar həmin surətlərdən yağış istəmiş və Uca Allahı buraxıb onlara ibadət etmişlər.

Zəlalət çağırışçıları həmçinin insanları açıq-aşkar bir şərə çağıraraq gəlməmişlər.Onlar yalnız insanlar üçün gözəlləşdirdikləri bəzəkli bir üslubla gəlirlər.Nəticədə onlar öz məqsədlərinə çatırlar.Zəlalət çağırışçıları insanları şirkə və qəbirlərə ibadət etməyə çağırdıqları zaman onlara: Qəbirlərə ibadət edin!-deməmişlər.Onlar demişlər: Bunlar övliyalar və saleh insanlardır.Onların Allah qatında yüksək dərəcələri vardır.Onların sizi Allaha yaxınlaşdırmaları, sizə vasitəcilər olmaları və Allah qatında sizə vəsilə olmaları üçün sizdə onlara yaxınlaşın.Onlara bu üslubla yol tapmışlar.Saleh insanları sevmək və onları Allah qatında vəsilə və vasitə tutmaq.Sonucda həmin insanlar bu şeytani hiylə nəticəsində qəbir və məzarlara ibadət edib Uca Allaha şərik qoşmuşlar.

Küfr çağırışçıları insanları müxtəlif üslublarla dəvət edirlər.Adi insanlar onların çağırışında heç bir mənfi amil görmürlər.Bunu yalnız bəsirət əhli bilir.Bu iki məsələdən aydın olur ki, zəlalət çağırışçıları iki qismdir: İnsanları elmsiz olaraq çağıran qism.Habelə insanları bilə-bilə haqqa müxalif olmağa çağıran qism.Birincisi azmış, ikincisi isə fasiqdir.

# Yetmiş altıncı məsələ

## Şirki bərqərar edib haqqı dəf etmək üçün dərin hiylə işlətmək

"Nuhun tayfasının etdiyi kimi böyük bir hiylə işlətmək."

---

**Şərh:**

Hiylə: Gizli yolla zərər yetirməkdir.Hiylə iki növdür: Yaxşı hiylə və yaramaz hiylə.

Yaramaz hiylə: Pisliyə layiq olmayan şəxslərə zərər yetirmək üçün gizli hiylələr işlətmək.Uca Allah Nuh tayfası haqqında buyurur: *"Onlar çox böyük bir hiylə qurdular.Və dedilər: Öz ilahlarınızı tərk etməyin, (xüsusilə) Vəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri atmayın! Onlar çoxlarını yoldan çıxartdılar."*[379] Onlar bu hiylələr vasitəsilə insanlara böyük hiylə qururlar.Bu, onların şirkə çağırmaq üçün istifadə etdikləri çirkin yollardır.Tövhid dəvəti gəldiyi zaman isə onlar ondan çəkindirirlər.Habelə onlar deyilər: Bunlar sizin üzərinizdə ağalıq etmək və sizdən üstün olmaq istəyirlər.

İnsanlara çirkinliyi gözəl göstərmək, gözəlliyi isə çirkin göstərmək insanları haqqdan batilə döndərmək və nurdan

---

[379] Nuh:22-24.

zülmətlərə çıxartmaq üçün qədim və müasir zamanlarda zəlalət dəvətçilərinin qurmaqda olduqları böyük hiylədir. Uca Allah buyurur: *“Allah (Ona) iman gətirənlərin dostudur, onları zülmətdən çıxarıb nura tərəf yönəldər. Kafirlərin dostu isə tağutdur. Onları nurdan ayırıb zülmətə salarlar.Onlar cəhənnəmlikdirlər və orada əbədi qalacaqlar!”.*[380] Habelə buyurur: *“Beləcə, Biz hər peyğəmbər üçün insan və cin şeytanlarından düşmənlər yaratdıq.Onlar aldatmaq məqsədilə bir-birinə təmtəraqlı sözlər təlqin edərlər.Əgər Rəbbin istəsəydi, onlar bunu etməzdilər.Onları uydurduqları yalanlarla birlikdə boşla getsinlər!”.*[381] Onları və yalanlarını tərk elə və onlara fikir vermə! Yuxarıda qeyd olunandan, batili bilib onu rədd etmək halı müstəsna zəlalət çağırışçılarına qulaq asmağın yasaq olduğu bəlli olur.

Yaxşı hiylə: Cəza almağa layiq olan şəxsə gizli yolla zərər yetirməkdir.Uca Allah buyurur: *“Onlar hiylə qurur Allah da hiylə qurur.”*[382] *“Onlar hiylə qurdular Allah da hiylə qurdu.Allah hiylə quranların ən yaxşısıdır.”*[383]

[380] əl-Bəqərə:257.
[381] əl-Ənam:112.
[382] əl-Ənfəl:30.
[383] Ali İmran:54.

# Yetmiş yeddinci məsələ

## Örnək tutulmağa layiq olmayan şəxsləri örnək tutmaq

"Onların imamları yaramaz alimlər yaxud da ki, cahil abidlərdir.Uca Allah buyurur: *"Onların içərisində elələri vardır ki, Allahın kəlamını dinləyib anladıqdan sonra, onu bilə-bilə təhrif edirlər.Onlar iman gətirənlərlə görüşdükləri zaman: "İman gətirdik", -deyirlər. Xəlvətdə olduqları vaxtda isə biri digərinə: "Allahın sizə bildirdiyi şeyi xəbər verirsiniz ki, Rəbbinizin yanında onları sizə qarşı dəlil gətirsinlər? (Bunu) dərk etmirsinizmi?" -söyləyirlər. Məgər onlar bilmirlərmi ki, Allah onların gizlində də, aşkarda da nə etdiklərini bilir?! Onların bəziləri də avamdırlar (bisavad-dırlar), kitabı bilməzlər. Uyduqları yalnız boş arzulardır. Onlar ancaq zənnə qapılırlar."*[384]

---

## Şərh:

**Nəsrani, yəhudi və qeyrilərindən olan cahiliyyat əhlinin özlərinə örnək tutduqları şəxslər, yəhudilərin başbilənləri kimi bildiklərinə əməl etməyən yaramaz alimlər yaxud nəsranilərin rahibləri kimi elmsiz əməl edən cahil abidlər olmuşdur.Uca Allah buyurur: *"Onlar Allahı qoyub alimlərini və rahiblərini özlərinə rəbblər qəbul etdilər."*[385] Onlara haramı halal, halalı isə haram edirlər.Həmin insanlar isə onlara bu**

---

[384] əl-Bəqərə:75-78.
[385] ət-Təubə:31.

işlərdə itaət edirlər.Uca Allah “əl-Bəqərə” surəsində buyurur: *“İndi onların sizə inanacaqlarına ümidmi edirsiniz? Halbuki onların içərisində elələri vardır ki, Allahın kəlamını dinləyib anladıqdan sonra, onu bilə-bilə təhrif edirlər.”*[386] Bunlar yaramaz alimlərdir.Onlar Uca Allahın Tövratda olan kəlamını eşidir, onu bilir və öyrənir daha sonra onu təhrif edirlər. Yəni, onun sözlərini və mənalarını dəyişirlər. ”*Anladıqdan sonra,onu bilə-bilə təhrif edirlər.”* Yəni, onlar öz nəfsi istəkləri, qərəzli məqsədləri və şəhvətlərindən ötrü onun ləfzini və doğru mənasını biləndən sonra onu dəyişirlər.Buna misal, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində Mədinədə baş vermiş zinakarın əhvalatını göstərmək olar.O zaman yəhudi bir kişi yəhudi qadınla zina etmişdir.Yəhudilər dedilər: Bu kişinin, yəni Peyğəmbərin (salləllahu aleyhi və səlləm), yanına gedin.Çünki onlar Tövratda bunların cəzasının daş-qalaq olduğunu bilir lakin onları daş-qalaq etmək istəmirdilər.Onlar düşünürdülər ki, Peyğəmbər daş-qalaqdan daha yüngül bir hökm çıxaracaq.Onlar onun hüzuruna gəlib həmin zinakar kişi və qadın üçün hökm çıxarmağı istədilər. Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: “Siz Tövratda zinakara dair nəyə rast gəlirsiniz? Onlar dedilər: Orada gəlir ki, biz onların üzlərini qaraldıb onları uzunqulağa mindirməli və onları bu halda küçələrdə dolaşdırmalıyıq. Peyğəmbər (salləllahu aleyhi və səlləm) onların başbilənlərindən olmuş daha sonra İslamı gəbul etmiş Abdullah bin Salama üz tutduğu zaman o, dedi: Yalan deyirlər ey Allahın Elçisi! Bu zaman Peyğmbər (salləllahu aleyhi və səlləm) onlardan Tövratı gətirməyi tələb etdi.Onlar Tövratı gətirdikləri zaman ibn Sauriyə barmağını daş-qalaq ayəsinin üzərinə qoydu.Abdullah bin Salam dedi: Barmağını çək! Həmin

[386] əl-Bəqərə:75.

adam barmağını çəkdiyi zaman daş-qalaq ayəsinin Tövratda olduğu açıq-aydın göründü.Bunun ardından Peyğəmbər (səl-ləllahu aleyhi və səlləm) onları ölənə qədər daş-qalaq etməyə əmr etdi."[387]

Bu, onların alimlərinin Allahın kəlamını təhrif etməsi-dir.Onlar Allaha qarşı yalan uydurub Onun hökmünü kiçiltmişlər.

Onların təhrif etmələrindən həmçinin: Uca Allah onlara qapıdan səcdə halında daxil olub "hitta: bizim günahlarımızı bağışla" demələrini əmr etdiyini xəbər verir. Onlar isə "hitta" sözünü "hinta: buğda" sözü ilə əvəzləmiş və Allahın sözünə əlavə gətirmişlər.

Təhrif: Uca Allahın kitabına əlavə gətirmək yaxud Allahın kitabını əksiltmək yaxud Allahın kitabını yanlış yozmaqdır.Təhrif budur.Çünki təhrif ləfz yaxud məna ilə olur.Öz məzhəbini müdafiə etmək yaxud şəhvətinə uymaq yaxud istədiyini əldə etmək üçün Quranı yaxud hədisləri yanlış açıqlamağa çalışan hər bir şəxs bu yoldadır.Uca Allah buyurur: *"Onlar iman gətirənlərlə görüşdükləri zaman: İman gətirdik, -deyirlər."*[388] Bu, nifaqdır.Nifaq və nassların təhrif edilməsi yəhudilərin yoludur.

Daha sonra Uca Allah buyurur: *Onların bəziləri də avamdırlar (bisavad-dırlar), kitabı bilməzlər. Uyduqları yalnız boş arzulardır. Onlar ancaq zənnə qapılırlar."*[389] Bunlar

---

[387] Buxari:4280.Muslim:1699.Əbu Davud:4446.Əhməd:2/5.Malik:1551.Dərimi:2321.
[388] əl-Bəqərə:76.
[389] əl-Bəqərə:78.

cahil abidlərdir.Onlar Tövratı oxuyur lakin onun mənasını bilmirlər.İnsanlar isə bunları cahil olduqları halda özlərinə imamlar seçirlər.Əslində isə yalnız əməl edən alimi örnək tutmaq olar.Məhz belələri rəbbani insanlardır.Cahil abidlər isə zahidlik və ibadət sahibləri olsalar belə örnək tutula bilməzlər.Çünki onlar doğru yol üzərə və Uca Allahdan gələn hidayət üzərə deyillər.

# Yetmiş səkkizinci məsələ

## Onlar Allahı sevmək məsələsində ziddiyətə düşmüşlər

“Onlar Allahın şəriətini tərk etməklə birgə Allahı sevdiklərini iddia edirlər.Uca Allah isə onlara tələb irəli sürüb buyurur: *“De: Əgər siz Allahı sevirsinizsə”*.[390]

---

Şərh:

Yəhudilər və onlara oxşayanların zəlalətlərindən: Onlar Uca Allahın əmrinə müxalif olmaqla birgə Allahı sevdiklərini iddia edirlər.Allahı sevməyin əlaməti isə: Onun əmrinə tabe olmaqdır.Şair demişdir:

**Sadiq sevgi itaəti var edir**

**Sevən məhbubuna itaətkardır**

Uca Allah bu haqda buyurur: *“De: Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın.”*[391] Nəsrani və yəhudilər deyirlər: *“Biz Allahın oğulları və sevimliləriyik.”*[392] Buna rəğmən onlar Uca Allahın şəriətinə müxalif olurlar.Bu, onların iddiala-

---

[390] Ali İmran:31.

[391] Ali İmran:31.

[392] əl-Maidə:18.

rında yalançı olduqlarına dəlalət edir.Uca Allah onlardan iddia etdikləri sevgiyə dəlil gətirmələrini, Allahın Elçisi Muhammədə tabeçilik göstərmələrini tələb etdiyi və onlar bunu etmədikləri zaman onların iddialarının yalan olduğu bəlli olmuşdur.Habelə sufilər dinlərini Allah sevgisi üzərində qururlar.Onlar deyirlər: İbadət sevgidir.Biz Allaha, Onun cəhənnəmindən qorxaraq yaxud Onun cənnətini diləyərək ibadət etmirik.Biz yalnız Allahı sevdiyimiz üçün Ona ibadət edirik.Bununla birgə onlar Allahın şəriətinə müxalif olur və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tabe olmurlar.Onlar ancaq öz şeyxlərinə və eşidib itaət etmək üzərə beyət etdikləri təriqət başçılarına tabe olurlar.Onlar həmin başçılara, əmr etdikləri heç bir işdə müxalif olmurlar.Onlar deyirlər: Murid ilə şeyxin misalı ölünün ölüyüyan önündə olması mislindədir. Onun yalnız şeyxinin seçəcəyi seçimi vardır.Elə isə haradadır Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tabeçilik? Onlar iddialarında yalançıdırlar.

Bu səbəbdən, Uca Allah sevgi iddiasında olanların önündə şərt qoyub demişdir: *"De: Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın."*[393] Allahı sevmək əlaməti Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tabe olmaqdır.İnsan bu vəsfə sahib olacağı zaman onun sevgi iddiasında olması öz təsdiqini tapacaq.Peyğəmbərə tabeçilikdən məhrum olan şəxs isə iddiasında yalançıdır.Uca Allah sevginin dəlilini və onun səmərəsini qeyd etmişdir. Onun dəlili, Peyğəmbərə

[393] Ali İmran:31.

(salləllahu aleyhi və salləm) tabe olmaqdır.Onun səmərəsi isə Allahın sevgisinə və günahların bağışlanmasına nail olmaqdır.Eynilə bu, Peyğəmbərə (salləllahu aleyhi və salləm) tabe olmadığı halda onu sevdiyini iddia edən hər bir şəxsə aiddir. Bəziləri Peyğəmbəri (salləllahu aleyhi və salləm) sevidklərini iddia edir, qazet və jurnallarda: Övladlarınıza Peyğəmbər sevgisini aşılayın,-deyə yazır, eyni zamanda müxtəlif bidət-lər və mövludlar ixtira edirlər.Peyğəmbər (salləllahu aleyhi və salləm) isə bidətlərdən qadağan etmişdir.Onlar Peyğəmbəri sevdiklərini iddia edir, eyni zamanda onun qadağan etdiyi və çəkindirdiyi bidətlər və xurafatlar ixtira etməklə ona müxalif olurlar.

# Yetmiş doqquzuncu məsələ

## Onlar yalan xülyalara etimad edirlər

"Onlar yalan xülyalar içində yaşayırlar.Onlar demişlər: *"Cəhənnəm odu bizə bir neçə gündən artıq əzab verməz."*[394] Habelə demişlər: *"Cənnətə yəhudilərdən və nəsranilərdən başqası girməyəcək!"*[395]

---

**Şərh:**

Yəhudilər və nəsranilər yalan xülyalara bel bağlayır və Allaha dair boş xülyalara dalırlar.Uca Allah onların belə dediklərini xəbər verir: *"Cəhənnəm odu bizə bir neçə gündən artıq əzab verməz."*[396] Bu, yəhudilərin iddia etdikləri kimi buzova ibadət etdikləri günlərdir.Uca Allah onların sözünü rədd edərək buyurur: *"Onlara söylə: Siz Allahdan belə bir vəd almısınızmı? (Əgər belədirsə) Allah heç vaxt Öz əhdindən dönməz.Yoxsa Allaha qarşı bilmədiyinizi söyləyirsiniz? Bəli, günah qazanan və qazandığı günahlarla əhatə olunan şəxslər cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar."* [397] Bu, onların sözlərinə verilən cavabdır.Habelə Uca Allah "Ali İmran" surəsində onların sözlərini rədd edərək buyurur: *"Kitabdan özlərinə bir pay verilmiş kimsələri görmürsənmi? Onlar öz aralarında hökm vermək üçün Allahın kitabına dəvət*

---

[394] əl-Bəqərə:80.

[395] əl-Bəqərə:111.

[396] əl-Bəqərə:80.

[397] əl-Bəqərə:80-81.

olunurlar. Sonra onların bir qismi üz döndərir. Onlar (həmişə) dönüklük edəndirlər. Bu (dönüklük) onların: "Cəhənnəm odu bizə bir neçə gündən artıq toxunmaz!"- dediklərinə görədir. Onları öz dinləri barəsində düzəltdikləri uydurmalar aldadıb yoldan çıxartmışdır.Elə isə şübhə edilməyən bir gündə onları (bir yerə) topladığımız zaman (onların) halı necə olacaq? (O gün) hər kəsə qazandığının əvəzi ödəniləcək və onlara heç bir haqsızlıq edilməyəcəkdir."[398] Habelə Uca Allah buyurur: "Bu, (cənnətə daxil olmaq) nə sizin, nə də kitab əhlinin arzusu ilə deyildir. Pislik edən kəs, onun cəzasını görəcək və o, Allahdan başqa özünə nə bir dost, nə də bir imdada yetən tapacaqdır! Mömin olmaqla bərabər, yaxşı işlər görən kişilər və ya qadınlar cənnətə daxil olarlar. Onlara xurma çərdəyi qədər haqsızlıq edilməz!".[399]

[398] Ali İmran:23-25.
[399] ən-Nisə:123-124.

# Səksəninci məsələ

## Onlar bəzi şəxslərə dair ifrata varmışlar

“Onlar peyğəmbərlərinin və əməli-saleh insanların qəbirlərini ibadətgaha çevirmişlər.”

**Şərh:**

Kitab əhli və digərlərindən olan cahiliyyat əhlinin məsələlərindən: Onlar peyğəmbərlərinin və onlardan olan saleh insanların qəbirlərini ibadətgaha çevirirlər.Bu, yəhudi və nəsranilərdə olmuş və günümüzəcən davam etmişdir.Habelə bu təzahür, ərəb müşriklərində və özlərini İslama nisbət edib qəbirlər və məzarlara sitayiş edənlərdə mövcuddur. Bunu ilk edən insanlar kitab əhli olmuşlar.Peyğəmbər (sallallahu aleyhi və səlləm) demişdir: “Sizdən öncəkilər qəbirləri səcdəgaha çevirirdilər.Bundan agah olun və qəbirləri səcdəgaha çevirməyin!”[400] Yəni, ibadət üçün namazgaha çevirməyin.Çünki qəbirlərin yanında namaz qılmaq həmin qəbirlərə ibadət etməyə aparan bir yoldur.İnsan Allah üçün namaz qılır.Lakin o, qəbirin yanında namaz qılacağı zaman bu, həmin qəbirə ibadət etməyə yol açacaq.Hal-hazırda olan qəbirə dua etmək, ondan mədəd və yardım diləmək haqqında isə heç söhbət belə getmir.Bu, yəhudi, nəsrani və

[400] Muslim:532.

qeyrilərindən olan cahiliyyat əhlinin dinidir.Ummu Sələmə və Ummu Habibə Həbəşistan torpağında yerləşən kilsələri və orada olan surətləri Peyğəmbərə (salləllahu aleyhi və səlləm) xəbər vermişlər.Onlar birinci hicrətdə öz ərləri ilə ora hicrət etmişdilər.Onlar Həbəşistanda bər-bəzəkli və surətlər olan kilsələr gördüklərini Peyğəmbərə (salləllahu aleyhi və səlləm) danışdıqları zaman o, dedi: "Onlar elə bir tayfadır ki, onlarda bir saleh kişi yaxud saleh qul öldüyü zaman onlar onun qəbiri üzərində məscid tikir və orada həmin surətləri qoyurlar.Onlar Allah qatında məxluqatın ən şərliləridir."[401]

Cahiliyyat əhlinin dinindən: Onlar övliyalar və saleh insanları özlərinə Allahdan savayı rəbblər edir və həmin övliya və saleh insanların onları Allaha yaxınlaşdırdıqlarını və Allah qatında onlara şəfaətçi olacaqlarını iddia edirlər.Uca Allah buyurur: *"Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilənlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"- deyirlər."*[402] Habelə buyurur: *"Allahı qoyub özlərinə dost tutanlar: Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik! (deyirlər)."*[403] Bunlar həmin şəxslərin yaradan, ruzi verən, öldürüb dirildən olduğunu etiqad etmirlər.Onlar bunun xas olaraq Allaha aid olduğunu etiraf edirlər.Onlar yalnız həmin övliya və saleh insanları özləri ilə Allah arasında vasitəçilər və şəfaətçilər edir və Allaha yaxınlaşdırmaları üçün ibadətin müxtəlif növlərini onlara yönəldirlər.Bu, cahiliyyat dinidir.

---

[401] Buxari:424.Muslim:528.Nəsai:704.Əhməd:6/51.
[402] Yunus:18.
[403] əz-Zumər:3.

Günümüzdə qəbirlərə ibadət edənlərin halı belədir.Uca Allahdan afiyət və salamatlıq diləyirik!

Qəbirlərə və ölülərə dair ifrata varmağın digər təzahürləri: Qəbirləri ucaltmaq, onun ətrafına qəndillər və çıraqlar asmaq, habelə üzərinə örtüklər qoymaq, onun üzərində yazılar yazmaq, onu bəzəmək və digər şeylər.Bu səbəbdən, Peyğəmbər (salləllahu aleyhi və sələm) bütün bu işləri qadağan etmişdir.

# Səksən birinci məsələ

## Peyğəmbərlərin yerlərinə dair ifrata varmaq

**“Ömərin əhvalatında gəldiyi kimi onlar peyğəmbərlərinin yerlərini ibadətgaha çevirirlər.”**

---

Şərh:

Cahiliyyat əhlinin dinindən: Onlar peyğəmbərlərinin yerlərini ibadətgaha çevirirlər.Yəni, təbərrük məqsədilə orada namaz qılırlar.Bu məsələ ilə bundan öncəki məsələ arasında olan fərq, öncəkinin şəxslərə dair ifrata varmaq, bunun isə şəxslərin yerlərinə dair ifrata varmaq olmasıdır.Yerlər deyildikdə, peyğəmbərin yaxud saleh insanın əyləşdiyi yaxud namaz qıldığı yerlər qəsd edilir.Onlar həmin yerləri axtrarır və orada Allaha ibadət edirlər.Onlar həmin yerlərdə namaz qılmağın fəzilətli olduğunu düşünürlər.Buna misal olaraq, onlar Hira mağarasına gedirlər.Çünki Peyğəmbər (salləllahu aleyhi və səlləm), peyğəmbərlikdən öncə orada ibadət edərdi.Onlar həmin yerə namaz qılıb dua etmək üçün yollanırlar.Peyğəmbər (salləllahu aleyhi və səlləm) isə peyğəmbərlikdən sonra oranı ziyarət etməmişdir.Habelə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) səhabələrindən heç biri Hira mağarasına getməmişlər.Çünki onlar bunun şəriətdə öz təsdiqini tapmadığını bilirdilər.

Habelə onlar Peyğəmbərin (salləllahu aleyhi və səlləm) hicrətdən öncə gizləndiyi Səur mağarasını ziyarət edir, orada namaz qılır və ora ətirlər qoyurlar.Bəzən hətta ora pul atırlar.

Bütün bu işlər cahiliyyat dinindəndir.Peyğəmbərlərin yerlərini təzim edənlər cahiliyyat əhlidir.Bu səbəbdən, Ömər (r.a) insanların beyət ağacına getdiklərini gördüyü zaman demişdir: "Sizdən öncəkiləri, yalnız onların öz peyğəmbərlərinin yerlərini araşdırmaları həlak etmişdir." Daha sonra həmin ağacı kəsməyi əmr etmişdir.Peyğəmbərin şəriətin əmri olmadan ziyarət etdiyi həmin məkanları ibadət üçün ziyarət etmək icazəli deyil.İbrahim məqamının yanında namaz qılmaq mislində şəriətin əmri ilə Peyğəmbərin ziyarət etdiyi məkanlarda namaq qılmaq isə şəriətdə öz təsdiqini tapan əməldir.Uca Allah buyurur: *"İbrahimin durduğu yeri (məqamını) namazgah edin!".*[404] Peyğəmbərin (salləllahu aleyhi və səlləm) Hira mağarasında və istirahət məqsədilə Məkkə ilə Mədinənin arasında olan yolda əyləşməsi isə şəriətin buyuruğu ilə edilən işlər olmamışdır.Alimlərin yekdilliyi ilə o, bunu ehtiyac səbəbilə etmişdir.

Bu ikisi arasında fərq qoymaq vacibdir.Peyğəmbərin (salləllahu aleyhi və səlləm) şəriətin buyuruğu ilə qəsd etmədiyi və sadəcə bir yerin yanından ötdüyü yaxud adət halı üzərə və ya istirahət etmək üçün əyləşdiyi yaxud namazın vaxtı gəldiyi zaman müəyyən yeri qəsd etmədən bir yerdə namaz qıldığı yerlər namaz qılmaq üçün namazgah edilməz.Çünki o, bunu qəsdli şəkildə deyil və yalnız həmin yerdə namazın

[404] əl-Bəqərə:125.

vaxtı gəldiyi səbəbilə etmişdir.Bu və digər yerlərin xüsusi üstünlüyü yoxdur.Çünki bu kimi yerlərin təzim edilməsi gələcəkdə, insanların həmin yerlərlə təbərrük etmələrində öz əksini tapan bütpərəstliyə yol açacaq.İnsanlar uzaqdan həmin yerləri ziyarət etmək üçün səfərə çıxacaq və nəticədə öncəki ümmətlərin düşdüyü şirk baş verəcək.Ola bilsin ki, orada pirlər də tikilsin.Hal-hazırda bunu tələb edən insanlar vardır.Onlar deyirlər: Peyğəmbərin (salləllahu aleyhi və səlləm) keçdiyi və əyləşdiyi yerlərdə pirlər tikin.Bunu Peyğəmbərin (salləllahu aleyhi və səlləm) xatirəsi naminə edin.Bu, batil sözdür. Biz sələfin etmədiyi bir şeyi edə bilmərik. Əgər bu, şəriətdə olsaydı bunu bizdən öncə səhabələr və tabiinlər edərdilər.Öncəki ümmətlər yalnız bu kimi əməllər üzündən həlak olmuşlar.Nuhun tayfası və öncəki ümmətlərdə baş verdiyi kimi şəxsiyyətlərin yerlərini təzim etmək insanları bütpərəstliyə sürükləyir.İnsanların hal-hazırda öz dinlərini tanıdıqlarını və onlar üçün bu işdə qorxulu bir amilin olmadığını söyləmək doğru deyil.Çünki cahil nəsillər gəldiyi zaman şeytan onlara bütpərəstliyi gözəlləşdirir. Çünki dirinin fitnəyə düşməsinə heç kəs zəmanət verə bilməz.

Allahın dostu İbrahimin dediyi kimi heç kəs fitnəyə düşməyəcəyindən sığortalanmayıb: *“Məni və oğullarımı bütlərə tapınmaqdan uzaq elə!”*.[405]

[405] İbrahim:35.

# Səksən ikinci məsələ

## Onlar şirkə aparan işlər edirlər

"Qəbirin üzərində çıraqlar asmaq."

**Şərh:**

Qəbirlərin üzərinə çıraqlar qoymaq: Ziyarət məqsədilə oranı, qəndillər şəklində olan çıraqlar yaxud ləmpələr yaxud elektrik işıq vasitəsilə işıqlandırmaq.Bunu etmək olmaz. Çünki bu, şirkin səbəblərindən biridir.İnsanlar ölünü dəfn etmək üçün işığa ehtiyac duysalar ləmpə yaxud fənərdən istifadə edə bilərlər.Lakin məzarı işıqlandırmaq üçün onun üzərində daimi işıq yerləşdirmək qadağandır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Allah qəbirləri ziyarət edən qadınları, oranı ibadətgaha çevirənləri və orada çıraqlar edənləri lənətləmişdir."[406]

Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qəbirləri ziyarət edən qadınları lənətləməsi, qadınlara qəbirstanlığı ziyarət etməyin yasaq olduğunu göstərir.Qəbirstanlığı ziyarət etmək xüsusi olaraq kişilərə aiddir.Lənət, qəbirləri ziyarət edən qadının böyük günah sahibi olduğunu ifadə edir.

Habelə oranı ibadətgaha çevirənləri lənətləmişdir: Yəni, oranı namaz üçün yer seçənləri yaxud orada məscid

---

[406] Tirmizi:320.Nəsai:2043.Əbu Davud:3236.İbn Macə:1575.Əhməd:1/327.

tikənləri.İkinci daha şiddətlidir.Yaxud oranı işıqlandırlanları lənətləmişdir.Çünki bu, həmin qəbirlərin ibadət olunması və Allahdan qeyrisinə dua edilməsi kimi şirk əməllərə aparan yoldur.Əslində isə qəbirlər, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində olmuş səhabələrin qəbirləri kimi buraxılmalı və orada çıraqlar və müxtəlif tikililər inşa edilməməlidir.Qəbiri olduğu halda buraxmaq gərəkdir. Qəbiri yerdən yalnız bir qarış qaldırmaq və onun qəbir olması bilinsin deyə onun üzərinə baş daşı qoymaq lazımdır.Bundan əlavə isə heç bir şey edilməməlidir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) Əli bin Əbu Talibə (r.a) demişdir: "Ucaldılmış qəbiri yerlə yeksan etməmiş buraxma!".[407] Yəni, onu yerlə bir et! Çünki onun hündürlüyü və ucalığı cahil insanların aldanması və onu ziyarət etməsi ilə nəticələnə bilər.Çünki cahil insanların qəlblərinə girən şirk, selin öz mənbəyinə axmasından daha sürətlidir.İnsanlar və cinlərdən olan şeytanlar bu işləri insanlara gözəlləşdirir və onları bununla məftun edirlər.Qəbirdə insanın diqqətini cəlb edəcək heç bir şey olmayacağı və həmin qəbirin peyğəmbərin yaxud digər şəxsin olduğu bilinməyəcəyi zaman bu, fitnədən daha uzaq saxlayacaq.Lakin qəbir ziyarət və təzim ediləcəyi, habelə üzərində naxışlar və digər bəzəklər və çıraqlar qoyulacağı zaman bu, insanların diqqətini cəlb edəcək.Cahil insanlar isə deyəcəklər: Qəbirin bu cür bəzədilməsi yalnız onda olan gizli bir səbəbdən irəli gəlir. Nəticədə də, onlar həmin qəbirlərə ibadət edəcəklər.

[407] Muslim:969.Tirmizi:1049.Nəsai:2031.Əbu Davud:3218.Əhməd:1/139.

Heç şübhəsiz ki, qəbirlərə dair ifrata varmaq yaxud qəbirlərin üzərində tikili inşa etmək yaxud çıraqlar yandırmaq yaxud üzərində yazılar yazmaq və bər-bəzək qoymaq yaxud digər şeylərdən kənar olan Peyğəmbərin (salləllahu aleyhi və səlləm) yoluna tabe olmaq gərəkdir. Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində qəbirlər məhz bu cür olmuşdur.

## Səksən üçüncü məsələ

## Onlar qəbirləri bayrama çevirmişlər

“Qəbirləri bayrama çevirmək”.

**Şərh:**

Ərəb dilində bayram sözü “العيد” təkrarlanan və yenidən qayıdan bir şeyə deyilir.Bayram iki qismə bölünür:

Zamanla əlaqəli olan bayram: Ramazan və qurban bayramı buna misaldır.

Məkanla əlaqəli olan bayram: İnsanların il ərzində yaxud həftə ərzində yaxud ay ərzində toplaşdıqları yerdir.İnsanlar orada ibadət üçün toplaşırlar.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: Mənim qəbrimi bayrama çevirməyin! (Yəni, mənim qəbrimi toplaşma və ətrafında ibadət etmə yerinə və ziyarətgaha çevirməyin!) Harada olsanız mənə salavat gətirin.Çünki sizin salavatınız mənə çatır.”[408] Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qəbiri yanında ona salavat deməyin xüsusi üstünlüyü yoxdur.Yer kürəsinin hər hansı məkanında olsan ona salavat de, çünki sənin salavatın ona çatır.

---

[408] Əbu Davud:2042.Əhməd:2/367.

Onun qəbrini təkrar-təkrar ziyarət etmək və onun qəbiri yanında oturmaq, onun qəbrini bayrama çevirmək anlamına gəlir.Bu isə şirkə aparan yoldur.Cahiliyyat əhli saleh insanların qəbirlərini bayrama çevirir həmin qəbirlərin ətrafında toplaşır və orada ibadət edirdilər.Hal-hazırda Bədəvi və qeyrilərinin qəbirləri ətrafında baş verənlər məhz bu qəbildəndir.Hər yerdən ziyarətçilər gəlib həmin qəbirlərin ətrafında əyləşir, orada çadırlar qurur, qurbanlar kəsir və günlərlə orada qalırlar.Bu, cahiliyyat dinidir.Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qəbrinin ətrafıda toplaşmaq və tez-tez oranı ziyarət etmək qadağandırsa digərinin qəbri haqqında nə demək olar? Çünki bu, şirkə aparan yollardan biridir.Bir kişi Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) Bəvanə adlanan bir yerdə dəvəni qurban kəsmək haqqında soruşduğu zaman o, demişdir: "Orada ibadət olunan cahiliyyat bütlərindən bir büt olmuşdurmu? İnsanlar: Xeyir!-dedilər.Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Orada onların toplaşdığı bir bayram (toplaşma) olmuşdurmu? İnsanlar: Xeyir!-dedilər.Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Nəzrini yerinə yetir.Bil ki, Allaha asilikdə və Adəm oğlunun sahib olmadığı bir şeydə nəzrə vəfakarlıq yoxdur!".[409]

Bu hədisdə bizi maraqlandıran əsas məqam: "Orada onların toplaşdığı bir bayram (toplaşma) olmuşdurmu?". Yəni, məkanla əlaqəli bayram.Bu isə, məscidlər, həcc və ümrə məkanları kimi Allahın və Peyğəmbərin xüsusiləşdirdiyi müstəsna ibadət üçün xüsusi yer seçməyin icazəli

---

[409] Əbu Davud:3313.

olmadığına dəlalət edir.Bundan savayı olan bütün yerlər isə eynidir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: **“Yer üzü mənim üçün məscid və** pak edilmişdir.”[410]

[410] İbn Macə:567.Əhməd:2/240.

## Səksən dördüncü məsələ

## Qəbirlərin yanında qurban kəsməklə Allaha yaxınlaşmaq

**"Qəbirlərin yanında qurban kəsmək".**

**Şərh:**

Uca Allah buyurur: *"Rəbbin üçün namaz qıl və qurban kəs!".*[411] Habelə buyurur: *"De: Şübhəsiz, Rəbbim məni doğru yola, düzgün dinə, batildən haqqa tapınan və müşriklərdən olmayan İbrahimin dininə yönəltdi! De: Mənim namazım da, qurbanım da, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür!".*[412] Qurban kəsmək Allaha edilən ibadətdir.

Qəbirləri təzim etmək üçün qəbirlərin yanında qurban kəsmək böyük şirkdir.Lakin əgər insan bunu Allahı təzim etmək üçün edərsə və qəbirin yanında bunu etməyin icazəli olduğunu düşünərsə bu, bidət və şirkə aparan yol olacaq. İnsan qəbir sahibi üçün deyil yalnız Allah üçün edərsə belə onun qəbirlərin yanında qurban kəsməsi icazəli olmayacaq. Çünki insanlar qəbirlərin yanında qurban kəsməyi vərdiş halına salacaqları zaman həmin işlər Allahdan qeyrisinə ibadətə gətirib çıxaracaq.Həmçinin cinlərin şərindən qorun-

[411] əl-Kəusər:2.
[412] əl-Ənam:161-162.

maq yaxud müalicə məqsədilə onlar üçün qurban kəsmək şirkdir.

İnsanın qida yaxud qonaqlıq məqsədi ilə Allahın adını çəkərək qurban kəsməsində heç bir qəbahət yoxdur.Çünki bu, ibadət deyil adət olaraq edilən işdir.

Lakin ibadət məqsədilə qurbanlıq yaxud əqiq üçün heyvan kəsmək Allaha ibadətdir.Bunu hər hansı bir məxluq üçün ibadət təzimi olaraq kəsmək olmaz.Habelə qəbirin yanında kəsmək olmaz.Çünki bu, həmin qəbirin ibadət olunmasına aparan yoldur.

# Səksən beşinci və altıncı məsələlər

## Onlar təzim etdikləri şəxslərin abidələrini qoruyurlar

“Onlar, “Dəru-n-nədva” kimi təzim etdikləri şəxslərin abidələri ilə təbərrük edir və əl altılarının qabağında bununla öyünürlər. Hakim bin Hizama deyilmişdir: Qureyşin ləyaqətinimi satdın? O, dedi: Təqvadan başqa ləyaqət qalmadı!”.

---

**Şərh:**

Alimlər yaxud hökmdarlar yaxud rəhbərlərdən təzim olunan şəxslərin tarixi yerlərini təzim etmək, həmin yerləri yaşatmaq, təmir etmək və onu qorumaqdır.Bu əməl, şirkə aparan yollardan biridir.Həmçinin bu, cahiliyyat dinindəndir.Çünki növbəti nəsillər gəlib deyirlər yaxud şeytan onlara deyir: Sizin atalarınız bu yerləri yalnız orada olan xeyir-bərəkət səbəbilə qoruyurdular.Nəticədə həmin adamlar ona ibadət edirlər.Çünki ilk nəsil onların bu bəlaya düşmələrinə zəmin yaratmışdır.Belə ki, şeytan Nuhun tayfasına saleh insanların surətlərini çəkməyi əmr etdiyi zaman bunu onlarda ibadətə fəallığı oyatmaq adı ilə etmişdir.Onlar bu surətləri xoş niyyətlə quraşdırmışdılar.Lakin bir vaxt keçdikdən sonra cahil nəsil gəlib ona ibadət etdilər.Bu, boyük şəxsiyyətlə-

rin tarixi yerlərini təzim edən və onu qoruyan cahiliyyat əhlinin əməlidir.Çünki nəticədə uzun müddətdən sonra olarsa belə Allahdan qeyrisinə ibadət olunur.

Hal-hazırda insanların doğru din və tövhid üzərə olduqlarını demək yanlışdır.

Biz deyirik: İnsan baxışını hazırkı zamanla bağlamamalıdır.İnsanın gələcəyə baxması gərəkdir.Üstəlik hal-hazırda olan insanların da fitnəyə düşməyəcəklərinə zəmanət verilə bilməz.Lakin gələcək daha təhlükəlidir.Bu səbəbdən, həmin yerlərə (tarixi abidələrə) qayğı ilə yanaşmaq doğru deyil.Öncəki ümmətlər yalnız bu kimi əməllər səbəbilə həlak olmuşlar.Onlar öz böyüklərini təzim etmiş və nəticədə həmin böyüklər gələcək nəsillərdə bütə çevrilmişlər.Müsəlmanın bu məsələyə diqqət ayırması vacibdir.

Şeyx buna Məkkədə olmuş “Dəru-n-nədva” yerini misal göstərmişdir.Həmin yer, önəmli işlər barəsində məşvərət aparmaq üçün Qureyş ağalarının yığıncaq yeri olmuşdur.

İslam gəldiyi və cahiliyyat aradan qalxdığı zaman “Dəru-n-nədva” adlanan yerin tikilisi olduğu kimi qalmışdır. Nəhayət Muaviyə (r.a) oranı mülkiyyətə keçirib yaşayış yeri kimi istifadə etmək və tikilinin quruluşunu dəyişmək məqsədilə həmin yeri Hakim bin Hizəmdən (r.a) almışdır.Bu zaman insanlar Hakimi (r.a) buna görə danlayıb demişlər: Əcdadlarımızın tarixi abidələrindən olan bir yeri və Qureyşin ləyaqətini nə üçün satdın? Hakim (r.a) dedi: Təqvadan başqa ləyaqət qalmadı! Bu sözlər növbəti ayədən

götürülmüşdür: *"Allah yanında ən ləyaqətli olanınız Allahdan ən çox qorxanınızdır."*[413] Bu, doğru və Uca Allahın kəlamına müvafiq gələn sözlərdir.Heç şübhəsiz ki, bu, bəsirətin və imanın nurundan doğan sözlərdir.

Bu məsələ, qədim abidələri qorumağın icazəli olmadığına dəlalət edir.Çünki bu, uzun müddətdən sonra olarsa belə şirkə aparan yoldur.Din şirkə aparan bütün yollara sədd çəkərək gəlmişdir.

[413] əl-Hucurat:13.

# Səksən yeddincidən doxsanıncı məsələyə qədər

## Bu ümmətdən olan bəzi şəxslərdə qalan cahiliyyat xislətləri

**"Əsil-nəcabətlə öyünmək, mənşəyi yamanlamaq, ulduzlardan yağmur diləmək və ölü üçün ağı çəkmək."**

---

## Şərh:

Bu dörd məsələ, cahiliyyat məsələlərindəndir. Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: **"Ümmətimdə dörd xislət onların tərk etməyəcəkləri cahiliyyat işlərindəndir: Əsil-nəcabətlə öyünmək, mənşəyi yamanlamaq, ulduzlardan yağmur diləmək və ölü üçün ağı çəkmək."**[414]

Əsil-nəcabətlə öyünmək: İnsanın ata-babalarının şanlı keçmişi ilə öyünməsidir. Bu, cahiliyyat dinindəndir. Çünki onlar Minada yığışıb Allahı zikr etmək əvəzinə ata-babalarının şanlı keçmişini xatırlayırdılar. Uca Allah buyurur: *"Həcc mərasimini tamamlayıb qurtardıqda ata-babalarınızı yada saldığınız kimi, ondan da artıq Allahı yad edin!"*.[415] Müsəlmanın ata-babaları deyil Uca Allahı xatırlaması vacibdir.

---

[414] Muslim:934. Əhməd:5/343.
[415] əl-Bəqərə:200.

Mənşəyi yamanlamaq: Bir insanın belə deməsidir: Filankəsin mənşəyi bilinmir.Filankəsin qəbiləsi xalis əsilli deyil.Bunun mənası, digərlərini kiçiltməkdir.Uca Allah buyurur: *"Ey insanlar! Biz sizi bir kişi və bir qadından yaratdıq. Sonra bir-birinizi tanıyasınız deyə, sizi xalqlara və qəbilələrə ayırdıq.Allah yanında ən ləyaqətli olanınız Allahdan ən çox qorxanınızdır."*[416] İnsan mənşəyi ilə deyil yalnız təqvası ilə öyünməlidir.Sən təqvanı itirəcəyin zaman sənin mənşəyin sənə heç bir fayda verməyəcək.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Əməli nəticəsində geridə qalanı mənşəyi irəli daşımaz".[417] İnsan saleh əmələ sahib olmayacağı zaman onun Qureyşdən olması, Haşim oğullarından olması və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əqrabasından olması ona heç bir fayda verməz.Ona yalnız saleh əməl və Allaha olan təqvası fayda verər.

Ulduzlardan yağmur diləmək: Hər hansı bir ulduzun çıxması yaxud batmasının yağışın yağmasına təsir göstərdiyini etiqad etmək.Bu, cahiliyyat dinindəndir.Yağmur yalnız Allahın istəyi ilə baş verir.Uca Allah buyurur: *"(İnsanlar) ümidsizliyə qapılandan sonra, yağmur göndərən və mərhəmətini açıb paylayan Odur."*[418] Yağışı Öz iradəsi, istəyi və hikməti ilə endirən Uca Allahdır.O, yağışı istədiyi kimi, istədiyi əraziyə endirir, digər yeri isə yağmursuz buraxır. *"And olsun ki, yada salsınlar deyə, Biz (həmin suyu) onların arasında paylaşdırdıq.Bununla belə, insanların əksəriyyəti nankorluqdan başqa bir şey etmədilər."*[419] Ulduzların çıxması

---

[416] əl-Hucurat:13.

[417] Muslim:2699.Tirmizi:2945.İbn Macə:225.Əhməd:2/252.Dərimi:344.

[418] əş-Şura:28.

[419] əl-Furqan:50.

yaxud batmasının yağışın yağmasına təsir etdiyini düşünən şəxsin bu etiqadı şirkdir.Onun tövbə etməsi və yağışı Uca Allaha aid etməsi gərəkdir.

Ölü üçün ağı çəkmək: Buna misal: İnsan öldüyü zaman səbirsizlik və narazılıq yaxud ölünün üstün cəhətlərini sadalayaraq səsi yüksəltmək.Habelə bu, hərəkətlə olur.Məsələn: Paltarı yırtmaq və üzə vurmaq.Ağı çəkmək böyük günahlardan sayılır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Ağı çəkən qadın ölməmişdən öncə tövbə etməyəcəyi zaman qiyamət günü qatrandan olan libasda və qartmaqdan olan zirehdə qaldırılacaq."[420] Ağı çəkmək böyük günahlardan biridir.Habelə bu, cahiliyyat işlərindəndir.Vacib olan, səbr etmək və əcri Allahdan diləməkdir.Lakin ölü üçün ağlamaq bu qismə daxil deyil. Çünki bəzən insanın özünü saxlaması mümkün olmur. Peyğəmbərin (salləllahu aleyhi və səlləm) oğlu İbrahim öldüyü zaman o, demişdir: "Həqiqətən, göz yaşarır, qəlb kədərlə dolur və biz yalnız Rəbbi razı salacaq sözlər deyirik.Ey İbrahim biz səninlə ayrılığa çox kədərlənirik!".[421] Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Allah gözün yaşla qəlbin isə kədərlə dolmasından ötrü əzab verməz.Lakin bundan ötrü, yəni dildən ötrü, əzab yaxud rəhm edər."[422] İnsan müsibət anı Allahı razı salacaq söz danışıb: "İnnə lilləhi və innə ileyhi raciun (biz Allaha məxsusuq və Onun yanına qayıdacağıq)",-deyəcəyi və Allaha

[420] Muslim:934.İbn Macə:1581.Əhməd:5/344.
[421] Buxari:1241.Muslim:2315.Əbu Davud:3126.Əhməd:3/194.
[422] Buxari:1242.Muslim:924.

həmd və şükr edəcəyi zaman Uca Allah onu bağışlayar və onun müsibətini yüngülləşdirər.

Bu dörd məsələ, cahiliyyat işlərindəndir.İnsanlarda qalan bu xislətlərdən tövbə etmələri vacibdir.Hədis, cahiliyyat xislətlərindən hər hansı birinə sahib olan hər bir şəxsin kafir olmayacağına dəlalət edir.Cahiliyyat işlərindən bəzisi küfr bəzisi isə bundan daha aşağı günahlardır.

# Doxsan birinci məsələ

## Onlar cəmiyyəti təcavüz üzərində qururlar

“Onların ən böyük məziyyətləri təcavüzdür.Uca Allah buna dair bizə xəbər vermişdir.”

## Şərh:

Təcavüz: İnsanların qanı, mal-mülkü və namusuna təcavüz etməkdir.Cahiliyyat əhli bunu ləyaqət hesab edir və şerləri və sözlərində bununla öyünürdülər.İslam gəlib bunu haram və qadağan etmiş, insanlar arasında ədaləti əmr etmiş və təcavüzkarın qarşısını almaq və məzlumu müdafiə etmək məqsədilə təcavüzə məruz qalanlar üçün qisas almaq hüququnu bərqərar etmişdir.Uca Allah buyurur: *“De: Rəbbim yalnız aşkar və gizli fahiş işləri, hər cür günahı, haqsız təcavüzü, Allahın haqqında heç bir dəlil nazil etmədiyi hər hansı bir şeyi Ona şərik qoşmağınızı və Allaha qarşı bilmədiyiniz şeyləri deməyinizi haram etmişdir.”*[423] Uca Allah təcavüzü fahiş işlər, şirk və Allahın adından elmsiz deyilən sözlə bir arada qeyd etmişdir.

Habelə Uca Allah buyurur: *“Həqiqətən, Allah ədalətli olmağı, yaxşılıq etməyi, qohumlara (haqqını) verməyi buyurur, zina etməyi, pis işlər görməyi və təcavüz etməyi isə*

[423] əl-Əraf:33.

*qadağan edir.(Allah) sizə düşünüb ibrət alasınız deyə, belə öyüd-nəsihət verir!".*[424]

Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) vida həccində demişdir: "Həqiqətən, sizin qanlarınız, namusunuz və mallarının sizə, bu şəhərdə və bu ayda bu günün haramlığı kimi haramdır.Çatdırdımmı?!".[425]

Habelə Uca Allah buyurur: *"Hər kəs bir mömin şəxsi qəsdən öldürərsə, onun cəzası əbədi qalacağı cəhənnəmdir. Allah ona qəzəb və lənət edər və onun üçün böyük əzab hazırlayar!".*[426] Məhz bu rəbbani əhkamların qurulması ilə əmin-amanlıq bərqərar olmuş, müsəlmanlar arasında qarşılıqlı sevgi yaranmış və cahiliyyat hərcmərcliyi və təşəxxüsü onların üzərindən qalxmışdır.Aləmlərin Rəbbinə həmd olsun!

---

[424] ən-Nəhl:90.

[425] Buxari:1652.Əhməd:1/230.

[426] ən-Nisə:93.

# Doxsan ikinci məsələ

## Haqsız yaxud haqlı olaraq öyünmək

“Onların ən böyük məziyyətləri, haqlı olsa belə öyünməkdir.Bu isə, qadağandır.”

## Şərh:

Cahiliyyat məsələlərindən: Haqlı olacağı halda belə öyünməkdir.Onlar özlərinin və ata-babalarının etdikləri əməllərlə öyünürlər.Əslində isə bu, qadağandır.Çünki əməllərlə öyünmək, insanın özündən razı qalması və digər insanlara yuxarıdan aşağı baxması ilə nəticələnir.Bu isə qadağan olunmuş cahiliyyat işlərindəndir.Müsəlmanın öyüməsi doğru deyil.Çünki insan nə qədər səy göstərib əməl etsə belə yenə də o, Allahın ona vacib buyurduğu bütün buyuruğları yerinə yetirə bilməz.Allahın haqqı böyükdür. Valideyinlərin haqqı böyükdür.Qohum-əqrabanın haqqı böyükdür.İnsanın üzərində böyük haqqlar vardır.İnsan bir xeyir iş gördüyü zaman dərhal öyünür.Əslində isə onun etdiyi yalnız cüzi bir şeydir.Bu, bir insanın digər insanlara etdiyi əməlləri ilə öyünməsidir.İnsanın Allah ilə onun arasında olan əməlləri ilə öyünməsi isə daha təhlükəlidir. Çünki bu, insanın öz əməlindən valeh olması və əməli çox görməsi ilə nəticələnir.Sonucda isə insanın əməli batil olur.

İnsanın daimə özünü Allahın günahkar bir qulu görməsi gərəkdir.İnsan özü ilə Allah arasında məhz bu cür olmalıdır. Habelə insan digər insanlara nisbətdə özünün günahkar olduğunu hesab edəcəyi zaman bu, onu təvəzökarlığa və daha çox xeyir işlər görməyə sövq edəcək.Lakin insan özünü kamilliyə çatmış və vacibi yerinə yetirmiş olacağını hesab edəcəyi zaman bu, onun xeyir işlər görməsinə əngəl olacaq və həmin insan ən uca məqama yetişdiyini düşünəcək.

Bir sözlə, müsəlmanın öyünməsi doğru deyil.Çünki bu, yalnız cahiliyyat əməllərindəndir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) özünün Adəm övladının ağası olduğunu qeyd etdiyi zaman demişdir: "Öyünmədən deyirəm!".[427] Heç bir şəxsin onun bu məqamına çatmayacağına rəğmən Peyğəmbər (salləllahu aleyhi və səlləm): "Öyünmədən deyirəm!"-söyləmişdir. Peyğəmbər (salləllahu aleyhi və səlləm) bunu öyünmə olaraq deyil yalnız Allahın neməti barəsində söhbət və buna şükr olaraq xəbər vermişdir.

[427] Tirmizi:3148.İbn Macə:4308.

## Doxsan üçüncü məsələ

## Yaramaz təəssübkeşlik

"İnsanın öz tayfasına haqqdan və batildən ötrü təəssübkeşlik etməsi onlarda labüd olan işlərdən biridir.Uca Allah bizə bu barədə xəbər vermişdir."

Şərh:

Yaramaz təəssübkeşlik: İnsanın bir şeyin batil olduğunu bildiyi halda təkəbbürlük, inadkarlıq, habelə bir şəxsi yaxud qəbiləni haqq və ya batildən ötrü müdafiə etmək və digər amillər səbəbilə batil üzərində davamiyyətli qalmasıdır.Bu, cahiliyyat işlərindəndir.

Uca Allah buna dair Quran nazil edib buyurmuşdur: *"Hər hansı bir camaata qarşı olan kininiz sizi ədalətsizliyə sövq etməsin."*[428] Yəni, sizin bir tayfaya olan nifrətiniz, onlar sizin düşmənləriniz olsalar belə sizi onlara qarşı ədalətsiz olmağa vadar etməsin.İnsan həm dostları həm də, düşmənləri ilə ədalətli olmalıdır.Uca Allah buyurur: *"Söz söylədiyiniz zaman qohumunuz olsa belə, ədalətli olun."*[429] Qohumluq əlaqəsi səni qohumun lehinə ədalətsiz davranmağa sövq etməsin.Əksinə yaxın adam yanlışlıq edəcəyi zaman onun xətasını düzəltmək və ona nəsihət etmək gərəkdir. *"Söz söylədiyiniz zaman qohumunuz olsa belə, ədalətli*

[428] əl-Maidə:8.
[429] əl-Ənam:152.

*olun."*[430] Habelə Uca Allah buyurur: *"Ey iman gətirənlər! Allah qarşısında sabitqədəm və ədalətli şahidlər olun."*[431] Habelə buyurur: *"Ey iman gətirənlər! (Şahidliyiniz) sizin özünüzün, ata-ananızın, yaxın qohumlarınızın əleyhinə olsa belə, ədalətdən möhkəm yapışan, Allah üçün şahidlik edən kəslər olun! İstər dövlətli, istər kasıb olsun, hər halda Allah onların hər ikisinə (sizdən) daha yaxındır. Nəfsinizin istəyinə uyub haqdan üz çevirməyin! Əgər dilinizi əyib büzsəniz və ya boyun qaçırsanız, (bilin ki) Allah etdiyiniz işlərdən xəbərdardır!".*[432]

İnsanın özü, yaxını, dostu və düşməni ilə ədalətli olması vacibdir.Onun hər hansı bir şəxsə ədavəti həmin insana zülm etməyə yaxud ona haqsızlıq etməyə vadar etməməlidir. Müsəlman məhz bu cür olmalıdır.

Cahiliyyat əhli isə, zalım tayfa olacağı halda belə öz tayfasına təəssübkeşlik edirdilər.Uca Allah bizə onlara müxalif olmağı və öz əleyhimizə, yaxınlarımızın, dostlarımızın və düşmənlərimizin əleyhinə olarsa belə haqqı deməyi əmr etmişdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Zalım və ya məzlum qardaşına yardımçı ol! Səhabələr dedilər: Ey Allahın Elçisi! İnsan məzlum olacağı zaman ona yardım edəcəyik.İnsan zalım olacağı zaman ona necə yardım edək? Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Onun zülmünə mane olmağın ona etdiyin yardımdır."[433] Ona yardım etməyin, onun zülmünə mane olmağındır.Onun

---

[430] əl-Ənam:152.

[431] əl-Maidə:8.

[432] ən-Nisə:35.

[433] Buxari:6552.Tirmizi:2255.Əhməd:3/99.

**zülmünə yardımçı olmağın deyil.Çünki bu, onu yardımsız buraxmaqdır.**

# Doxsan dördüncü məsələ

## Başqasının cinayətinə görə günahsızı cəzalandırmaq

“Onların dinindən: Bir kişini digər adamın cinayəti səbəbilə cəzalandırmaqdır.Uca Allah buyurur: ***“Heç bir günahkar başqasının günahını daşımaz.”***[434]

## Şərh:

**Cahiliyyat məsələlərindən:** Onlar bir kişini digərinin cinayətinə görə cəzalandırırlar.Uca Allah Quran nazil edib buyurmuşdur: *“Heç bir günahkar başqasının günahını daşımaz.”*[435] Zülm etməyən bir insan digər bir şəxsin zülmü səbəbilə, hətta onun yaxını, əmisi oğlu yaxud atası yaxud övladı olsa belə cəzalana bilməz.Cinayətkar yalnız özünə zərər verir.Günahsız insanın isə cinayətkarın etdiyi cinayət üzündən cəzalanması yolverilməzdir.Günahsız insan cinayətkarın günahı səbəbilə cəzalanacağı zaman bu, İslamın qəbul etmədiyi zülm olacaq.

Hal-hazırda bəzi əyalətlərdə müəyyən qəbilədən olan və heç bir dəyəri olmayan şəxs cinayət işlətdiyi zaman ondan qisas alınmır və yalnız onun qəbiləsindən olan və ondan

---

[434] əl-Fatir:18.
[435] əl-Fatir:18.

daha şərəfli və dəyərli bir şəxsdən intiqam alınır.Onlar cinayətkarı deyil qəbilənin başçısı yaxud qəbilədə nüfuz sahibi olan dəyərli bir insanı cəzalandırırlar.Bu, cahiliyyat işlərindəndir.

Qisas yalnız cinayəti işlədən şəxsdən alınır.Ədalət məhz budur. *"Sizə qarşı həddini aşanlara siz də həmin ölçüdə həddi aşın."*[436]

Bir sözlə bu, əzəmətli qaydadır: Cinayət onu işlədənə aiddir və digərini şamil etmir.

Lakin deyilə bilər ki, Uca Allah yanlışlıq üzündən baş vermiş cinayətin qanbahasını cinayət işlədənin qohumunun öhdəçiliyinə qoymuş və bunu qatilin həvaləsinə buraxmamışdır.Məgər bu, günahsızın digərinin günahını öhdəsinə götürməsi deyil?

Deyirik ki, xeyir.Bu, ədalət və əməkdaşlıqdır.Qatil qəsdən deyil yanlışlıq üzündən cinayəti işlətdiyi zaman qohumlarının ona yardım etməsi məqsədəuyğun olmuşdur. Çünki onlar, həmin insan öləcəyi zaman onun mal-mülkünə varis çıxırlar.Habelə onlar qəsdən olmayan yanlışlıqlarını öz öhdələrinə götürürlər.Ancaq qəsdən cinayət işlədən şəxsin cəzası sırf ona aiddir.Bu səbəbdən, qəsdən cinayət işlədənin yaxını onun cinayətini öz öhdəsinə götürə bilməz.

---

[436] əl-Bəqərə:194.

# Doxsan beşinci məsələ

## Bir insanın digərini yamanlaması

“Bir insanın digərinin ayıbını açması.Peyğəmbər (salləllahu aleyhi və salləm) demişdir: “Onu anasına görəmi yamanladın! Həqiqətən səndə cahiliyyat xisləti vardır.”[437]

Şərh:

Bu sözlər, Əbu Zərrin (r.a) əhvalatında gəlmişdir.Əbu Zərr ən fəzilətli səhabələrdən və İslama ilk girən müsəlmanlardan birinə anası zənci olduğu üçün: Ey qaracanın oğlu!-dediyi zaman Peyğəmbər (salləllahu aleyhi və salləm) ona dedi: “Onu anasına görəmi yamanladın! Həqiqətən, səndə cahiliyyat xisləti vardır.”[438] İnsanı digərinin nöqsanına görə yaxud şərəfli mənşəyə sahib olmadığına görə yamanlamaq cahiliyyat işlərindəndir.Lakin cahiliyyat xislətlərindən bir xislətə sahib olan hər bir şəxs kafir olmur.

[437] Buxari:30.Muslim:1661.Əbu Davud:5157.Əhməd:5/161.
[438] Buxari:30.Muslim:1661.Əbu Davud:5157.Əhməd:5/161.

## Doxsan altıncı məsələ

## Onlar öz yaxşı əməlləri ilə öyünürlər

“Onlar Kəbəni himayə etdiklərinə görə öyünürlər.Uca Allah onları pisləyib buyurur: *“Həm də onunla (o Kəbə ilə) təkəbbürlük edib gecələr toplanır və yaramaz sözlər danışırsınız.”*[439]

---

Şərh:

Cahiliyyat məsələlərindən: Onlar həcc ayinlərini icra etdiklərinə, habelə himayəçilik və təşkilatçılıq işlərini yerinə yetirdiklərinə və müsafir axınına və həccə gələnlərə xidmət göstərdiklərinə görə öyünürlər.Onlar bu əməllərlə “*təkəbbürlük edib*” öyünürlər.Yəni, onlar Kəbəni himayə etdiklərinə, ona xidmət göstərdiklərinə və ora gələn müsafirləri qarşıladıqlarına görə digər ərəblərin önündə öyünürlər.Bu, cahiliyyat işlərindəndir.Çünki Allahın evlərinə xidmət etmək ibadətdir.İnsanın ibadət səbəbilə öyünməsi doğru deyil.Çünki bu, Allaha yaxınlaşdıran vasitədir.İnsan digər insanların tərifləri və xoş sözlərini güdməli deyil və yalnız Allahın onu bu əməli edənlərdən biri etdiyinə görə təkəbbürlükdən yaxud öyünmədən uzaq olaraq Allaha həmd etməlidir.

[439] əl-Muminun:67.

Onlar Peyğəmbərə (salləllahu aleyhi və səlləm) və Qurana iman gətirib ona tabe olmaq əvəzinə Kəbədə gördükləri işlərdən ötrü öyünür və bunun onları Qurana və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tabeçilikdən azad etdiyini düşünürlər.Bu, cahiliyyat işlərindəndir.

Uca Allah buyurur: *"Məgər siz həccə gələnlərə su verməyi və Məscidul-Həramı təmir etməyi Allaha və qiyamət gününə iman gətirib Allah yolunda cihad edənlərlə eynimi tutursunuz? Onlar Allah yanında eyni deyillər."*[440] Həccə gələnlərə su vermək, Məscidul-Həramı təmir etmək saleh əməldir.Lakin insan bununla öyünməməli və bunun yetlərli olduğunu düşünməməlidir.İnsanın, həccə gələnlərə su vermək və Məscidul-Həramı təmir etməkdən daha böyük olan başqa saleh əməllər etməsi gərəkdir.Bu əməllər: Allah yolunda cihad etmək, Allaha iman gətirmək, hicrət etmək və digər əzəmətli əməllərdir.

İnsan müəyyən əməllə kifayətlənib onun yetərli olduğunu düşünməməlidir.Xüsusən də, insan bunun Quran və sunnəyə tabeçiliyi əvəzlədiyini düşünəcəyi zaman.Hal-hazırda bəzi insanlar Məkkə və Mədinədə məskunlaşdıqları üçün əməl etməyi gərəksiz görürlər.Onlardan biri demişdir: Həramda yatan insan digər yerdə ibadət edəndən daha xeyirlidir.Heç şübhəsiz ki, bu, şeytanın oyunudur.

---

[440] ət-Təubə:19.

# Doxsan yeddinci məsələ

## Əməli-saleh insanlara müxalif olmaları ilə birgə onlara mənsub olduqları üçün öyünmək

“Onlar peyğəmbərlərin nəslindən olmaları ilə öyünürlər. Uca Allah buyurmuşdur: *“Onlar bir ümmət idilər ki, keçib getdilər.Onların etdikləri əməllər özlərinə, sizin etdiyiniz əməllər isə sizə aiddir.”*[441]

**Şərh:**

İsrail oğullarının əməllərindən: Onlar peyğəmbərlərə vəələxsus sonuncu Peyğəmbər Muhamməd ə (salləllahu aleyhi və səlləm) tabe olmadıqları halda onların zürriyətindən olduqları üçün öyünürlər.Əslində isə onların Muhamməd ə (salləllahu aleyhi və səlləm) tabe olmaları vacibdir.Onlar peyğəmbərlərə tabe olmadıqları halda belə deyirlər: Biz peyğəmbərlərin övladlarıyıq və bu bizə yetər.Uca Allah onların sözlərini rədd edərək buyurmuşdur: *“Onlar bir ümmət idilər ki, keçib getdilər.Onların etdikləri əməllər özlərinə, sizin etdiyiniz əməllər isə sizə aiddir.”*[442] İnsan digərinin əməli deyil öz əməli haqqında düşünməlidir.Peyğəmbərlər məxluqatın ən fəzilətli insanlarıdır.Lakin tabeçilik olmayacağı zaman bu,

[441] əl-Bəqərə:134.
[442] əl-Bəqərə:134.

onların törəmələrinə heç bir fayda verməyəcək.Peyğəmbərlərin etdikləri əməllər onlara sizin əməlləriniz isə sizə aiddir.Həmçinin ata-babalarının əməlləri ilə öyünən, onların əməli-saleh və alim olduğunu deyən və bunun əməl etməkdən azad etdiyini düşünən insanlar.Onlar əhli beytə mənsub olan bəzi şəxslərə bənzəyirlər.Onlar əhli beytə olan mənsubiyyətin saleh əməllər etməkdən azad etdiyini düşünürlər.

Həmçinin Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əməli və ad-sanı ilə yaxud övliya və saleh insanların əməli ilə təvəssül edənlər.Onların digər insanların əməli ilə nə əlaqəsi var? Onların əməlləri özlərinə, sənin əməlin isə özünə aiddir.Onların əməlləri sənə heç bir fayda verməyəcək. Qiyamət günü heç kəs digərinin dadına çatmayacaq. *"Hər kəsin qazandığı yaxşı əməl də, pis əməl də özünə aiddir."*[443] Qiyamət günü sənə yalnız öz əməlin fayda verəcək. *"Onlar bir ümmət idilər ki, keçib getdilər.Onların etdikləri əməllər özlərinə, sizin etdiyiniz əməllər isə sizə aiddir.Onların əməlləri barəsində sizdən sorğu-sual olunmaz."*[444] Burada övliya və salehlərlə yaxud onların ad-sanı ilə təvəssül edənlərə yaxud heç bir əməl etmədən saleh insanlara və ya peyğəmbərlərə qohumluğun kifayət olduğunu düşünənlərə cavab vardır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Ey Qureyş toplumu! Öz canınızı satın alın! Mən Allah qatında heç bir şeydə sizin dadınıza cata bilmərəm.Ey Allahın Elçisinin əmisi Abbas! Ey Allahın Elçisinin bibisi Safiyyə! Mən Allah qatında heç bir şeydə sizin dadınıza cata bilmərəm.Ey Muhamməddin qızı Fatimə! Mənim malımdan

[443] əl-Bəqərə:286.
[444] əl-Bəqərə:134.

istədiyini dilə! Mən Allah qatında heç bir şeydə sənin dadına cata bilmərəm."[445] Peyğəmbər (salləllahu aleyhi və səlləm) ona ən yaxın olan insanlara deyir: "Mən Allah qatında heç bir şeydə sizin dadınıza cata bilmərəm." Sizin Peyğəmbərin yaxınları yaxud onun qohumları yaxud övliya və salehlərin qohumları olmağınız yaxud sizin onların ad-sanı ilə təvəssül etməyiniz sizə heç bir fayda verməyəcək.

Uca Allah qiyamət günü deyəcək: *"O gün heç kəs heç kəsin karına gələ bilməz. O gün hökm ancaq Allahındır!"*.[446] Habelə buyurur: *"O gün insan qaçacaq öz qardaşından; Anasından, atasından; Zövcəsindən və oğullarından! O gün onlardan hər birinin istənilən qədər işi olacaqdır! Hər kəs öz hayında olacaq, heç kəs heç kəsin halından xəbər tutmayacaqdır."*[447] Hər bir şəxs özü ilə məşqul olacaq. Hətta İsa peyğəmbər deyəcək: Ey Rəbbim! Səndən məni dünyaya gətirən Məryəmi belə diləmirəm.Nəfsim, nəfsim!".

---

[445] Buxari:2602.Muslim:206.Nəsai:3646.Dərimi:2732.

[446] əl-İnfitar:19.

[447] Abəsə:34-37.

## Doxsan səkkizinci məsələ

## Onlar sahib olduqları peşə ilə digərlərin önündə öyünürlər

“Peşə ilə öyünmək.Buna misal, iki səfər sahiblərinin kəndlilər önündə öyünmələridir.”

**Şərh:**

Peşə ilə öyünmək: Ticarətçinin öz ticarəti ilə əsnafın, dülgərin, dəmirçinin önündə öyünməsidir.Habelə vəzifə sahibinin daha aşağı olan insanların önündə öyünməsidir.

Müsəlman özündən daha aşağı olan insanı və ümumiyyətlə insanları kiçiltməz.Onun müsəlmanlara, onların peşəsinə və həmin peşənin onun peşəsindən daha aşağı olduğuna görə həqarətlə baxması necə ola bilər? Bu, cahiliyyat işlərindəndir. Uca Allah Qureyşin iki səfərini bizə xəbər vermişdir.Uca Allah Qureyşə iki ticari səfər, Yəmənə olan qış səfərini və Şama olan yay səfərini bəxş etdiyini xəbər vermişdir.Onlar isə kəndlilər və əkinçilər önündə bununla öyünürdülər.

Bu, öz peşəsi yaxud vəzifəsi ilə ondan daha aşağı olan insanın önündə öyünənləri şamil edir.İnsanın lovğalıq etməsi qadağandır.

Onlar dəmirçi və dülgər kimi yüksək təbəqə insanların peşəsindən olmayan peşəyə sahib olan insanlara alçaq gözlə baxırlar.Bu yaramaz xislət hələ də, bəzi insanlarda mövcuddur.

Bu növdən, bəzi insanların məscid imamları və müəzzinlərə alçaq gözlə baxmalarıdır.Əslində isə imamın vəzifəsi ən fəzilətli vəzifələrdən biridir.Habelə bu, Peyğəmbərin (salləllahu aleyhi və sələm) əməlidir.Habelə müəzzinin vəzifəsi şərəfli vəzifədir.İmamlıq və müəzzinlik ən şərəfli vəzifələrdir.Bu iki vəzifə, nazirin işindən və bütün digər vəzifələrdən daha şəfərlidir.

## Doxsan doqquzuncu məsələ

## Onlar bu dünyaya öz ölçüləri ilə baxırlar

“Dünya onların qəlblərində böyük yer tutur.Uca Allah buyurur: *“Onlar dedilər: Məgər bu Quran iki şəhərdən olan böyük bir adama nazil edilməli deyildimi?”.*[448]

---

**Şərh:**

Cahiliyyat məsələlərindən: Dünyanın onların daxilində böyük yer tutmasıdır.Onların düşüncəsinə görə dünyaya sahib olan şəxs izzət sahibidir.Dünyası olmayan şəxs isə onlara görə zəlil və alçaqın birisidir.Hətta onlar Allahın seçimi olan peyğəmbərliyin kasıblarda deyil zəngin insanlarda vacib olduğunu düşünürlər.Onlar deyirdilər: Məgər Allah peyğəmbər göndərmək üçün Əbu Talibin yetimindən baqasını tapmadımı? (onlar Muhamməddi (salləllahu aleyhi və səlləm) qəsd edirlər) *“Onlar dedilər: Məgər bu Quran iki şəhərdən olan böyük bir adama nazil edilməli deyildimi?”.*[449] İki şəhər: Məkkə və Taifdir.Qeyd olunan adamlar isə Valid bin Muğira yaxud Həbib bin Amr əs-Səqafidir.Habelə Taifdə Urva bin Məsud olduğu deyilmişdir.Onlar deyirdilər: Əgər bu peyğəmbərlik bu iki adamdan birində olsaydı daha münasib olardı.Peyğəmbərliyin yoxsul və yetim olan birisi-

---

[448] əz-Zuxruf:31.
[449] əz-Zuxruf:31.

nə, Muhamməddə (salləllahu aleyhi və səlləm) gəlməsi isə onlara görə münasib deyil.

Uca Allah buyurur: *"Məgər sənin Rəbbinin mərhəmətini onlarmı paylaşdırırlar?!".*[450] Yəni, onlar Uca Allahın işlərinə müdaxilə edir, Allahın mərhəmətini paylaşdırmaq istəyir və Allahın bölgüsünə etibar etmirlər. *"Allah peyğəmbərliyi hara göndərəcəyini Özü daha yaxşı bilir."*[451]

---

450 əz-Zuxruf:32.

451 əl-Ənam:124.

# Yüzüncü məsələ

## Allahın hökmünə düzəliş gətirmək

**“Ayədə qeyd edildiyi kimi Allahın hökmünə düzəliş gətirmək.”**

**Şərh:**

Allahın hökmünə düzəliş gətirmək.Ayədə gəlmişdir: “*Məgər bu Quran iki şəhərdən olan böyük bir adama nazil edilməli deyildimi?”.*[452] Sanki Uca Allah peyğəmbərinin peyğəmbərlik üçün yararlı olduğunu bilmir bunlar isə bunu bilirlər.Bu, -Allah qorusun- Uca Allahın hökmünə düzəliş gətirməkdir.Onlar demişlər: *“Məgər Quran ona bütöv (birdəfəlik) endirilməli deyildimi!”.*[453] Onlar Allahın hökmünə düzəliş gətirib deyirlər: Necə olur ki, Allah Quranı bir dəfəlik deyil ayrı-ayrı nazil edir? Həmin adamlar onlara aid olmayan və heç bir bilgiyə malik olmadıqları məsələlərə müdaxilə edirlər.

Daha sonra Uca Allah Quranı hissə-hissə nazil etməkdə hikməti bəyan edərək buyurur: *Sənin ürəyinə səbat vermək üçün Biz onu ayə-ayə (tədriclə) nazil etdik.Sənin yanına gəlib elə bir misal çəkməzlər ki, Biz sənə (onun) doğrusunu və*

[452] əz-Zuxruf:31.
[453] əl-Furqan:32.

*izahatca daha yaxşısını gətirməyək."*[454] Habelə buyurur: *"İnsanlara aramla oxuyasan deyə, Biz Quranı hissələrə ayırıb göndərdik.Biz onu tədriclə nazil etdik."*[455] Habelə əməl vaxtını asanlaşdırmaq üçün hissə-hissə enmişdir.Heç şübhəsiz ki, əgər Quran birdəfəlik nazil olsaydı insanlar ona əməl etmək iqtidarında olmazdılar.Habelə Uca Allah hadisələrə uyğun olaraq və hər durumun yaxud hər hadisənin öz vaxtında olan hökmünü bəyan etmək üçün Quranı hissə-hissə nazıl etmişdir.Quranın hissə-hissə nazil olmasında hikmət məhz budur.

Hər bir dönəmdə nasslara müdaxilə edən və Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) hökmünə düzəlişlər gətirən bu kimi şəxslər mövcud olmuşdur.Onlar deyirlər ki, əgər nass belə olsaydı yaxud əgər hədis belə olsaydı v.s.Uca Allah buyurur: *"Ey iman gətirənlər! Allahdan və Peyğəmbərindən önə keçməyin."*[456]Allaha və Peyğəmbərə düzəliş gətirməyin! Sizin üzərinizə düşən öhdəçilik, düzəlişlər gətirmək və etirazlar bildirmək deyil Allaha iman gətirmək və Onun nazil etdiyinə əməl etməkdir.

---

[454] əl-Furqan:32-33.
[455] əl-İsra:106.
[456] əl-Hucurat:1.

# Yüz birinci məsələ

## Kasıblara həqarətlə baxmaq

"Kasıblara yuxarıdan aşağı baxmaq.Uca Allah buyurur: *"Rəbbinin rizasını diləyərək səhər-axşam Ona dua edənləri yanından qovma."*[457]

---

Şərh:

Buna bənzər məsələ yuxarıda qeyd edilmişdir.Onlar peyğəmbərlərə tabe olanların kasıblar olması səbəbilə onlara tabeçiliyi tərk edirlər. *"Onlar: Sənə ən rəzil adamlar tabe olmuşkən, biz sənə imanmı gətirəcəyik? -dedilər."*[458] Yəni, cəmiyyətdə heç bir çəkiyə malik olmayan kasıblar.Bu, cahiliyyat dinidir.Hətta onlar təkəbbürlükləri üzündən Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) kasıbları onların əyləşəcəkləri məclisdən uzaqlaşdırmağı tələb etmişlər.Uca Allah növbəti ayəni nazil etmişdir: *"Rəbbinin rizasını diləyərək səhər-axşam Ona dua edənləri yanından qovma. Onların əməllərinin sənə, sənin əməllərinin isə onlara heç bir dəxli yoxdur. Onları qovarsan, zalımlardan olarsan."*[459] Əgər Peyğəmbər (salləllahu aleyhi və səlləm) onları qovsaydı zalımlardan olardı.

Daha sonra Uca Allah buyurmuşdur: *"Beləliklə, onları bir-birilə imtahana çəkdik ki, onlar desinlər: "Əcəba, Allahın aramızda lütfünü rəva gördüyü kəslər bunlarmıdır? Məgər*

---

[457] əl-Ənam:52.
[458] əş-Şuara:111.
[459] əl-Ənam:52.

*Allah şükür edənləri daha yaxşı tanıyan deyildirmi?" Ayələrimizə iman gətirənlər yanına gəldikdə onlara de: Sizə salam olsun! Rəbbiniz Özünə rəhmli olmağı yazmışdır.Belə ki, sizlərdən hər kəs pis iş görsə, sonra tövbə edib düzəlsə şübhəsiz ki, Allahın bağışlayan və rəhm edən olduğunu görər!"*[460] Haqqa tabe olan, kasıb olarsa belə Uca Allah qatında möhtərəm şəxsdir.Məhz həmin şəxs gözəl qarşılanmağa və məclislərin yuxarı başında edilməyə layiqdir.Haqqdan üz çevirən və ona təkəbbürlük göstərən şəxs isə saygı və hörmət olunmağa layiq deyil.Çünki beləsi özünü alçaldır. Məhz buna görə də o, uzaq tutulmağa və diqqətsiz buraxılmağa layiq olmuşdur.

---

[460] əl-Ənam:53-54.

# Yüz ikinci məsələ

## Onlar iman əhlini niyyətləri və məqsədlərində ittham edirlər

"Onlar peyğəmbərlərin ardıcıllarını ixlassız olmaqda və dünya mənfəətini güdməkdə ittiham edirlər.Uca Allah onların cavabını verib buyurur: "*Onların əməllərinin sənə, sənin əməllərinin isə onlara heç bir dəxli yoxdur."*[461] Habelə digər ayələr."

---

**Şərh:**

Cahiliyyat işlərindən: Onlar kasıbları, yalnız dünya mənfəətini əldə etməkdən ötrü iman gətirməkdə ittiham edirlər.Belə ki, fironun əyanı Musa və Haruna demişlər: *"Özünüz də yer üzündə böyüklük etmək üçünmü gəldiniz?".*[462] Habelə Nuhun tayfası demişdir: *"Bu sizin kimi yalnız adi bir insandır.(Peyğəmbərlik iddiası ilə) sizə böyüklük etmək istəyir."*[463] Onlar peyğəmbərləri nüfuz və başçılığı istəməkdə, kasıb möminləri isə Peyğəmbərə (salləllahu aleyhi və səlləm) tabe olmaqla zənginlik və sərvət əldə etməyi istəməkdə ittiham etmişlər.Uca Allah buyurur: *"Rəbbinin rizasını*

---

[461] əl-Ənam:52.
[462] Yunus:78.
[463] əl-Muminun:24.

***diləyərək səhər-axşam Ona dua edənləri yanından qovma."***[464] **Uca Allah möminlərin dünyanı istəmələri haqda deyilən ittihamı rədd etmişdir.Uca Allah buyurur: "*Rəbbinin rizasını diləyərək*".Uca Allah onlara ixlası isbat etmişdir.**

[464] **əl-Ənam:52.**

## Yüz üçüncüdən yüz səkkizinci məsələyəcən

## Onlar imanın əsaslarına küfr edirlər

**"Onlar mələklərə, peyğəmbərlərə və kitablara küfr edir, Allahdan gələndən üz çevirir, habelə axirət gününə küfr edib Allahla qarşılaşacaqlarını təkzib edirlər."**

Şərh:

Bütün bu məsələlər cahiliyyat işlərindəndir.Onlar kitablara, peyğəmbərlərə, mələklərə, axirət gününə və Allahla qarşılaşacaqlarına iman etmirlər.Çünki bu, qeybi işlərdir. Onlar isə qeybə inanmırlar.Bu məsələlərə yalnız qeybə inanan iman gətirir.Məhz bu səbəbdən, onlar mələklərə, kitablara, peyğəmbərlərə və axirət gününə küfr edirlər.Uca Allah qeybə iman gətirən şəxsləri Quranın əvvəlində tərifləyərək buyurur: *"Müttəqilərə doğru yolu göstərəndir.O kəslərə ki, qeybə iman edir, (lazımınca) namaz qılır"*.[465] Bura Allaha, mələklərə, kitablara, vəhyə və axirət gününə iman daxildir. Bütün bu məsələlər qeybə iman etməyə daxildir.Cahiliyyat əhli isə qeybə iman etmirlər.Buna görə də, onlar bunu və qiyamət günü Allahla qarşılaşacaqlarını inkar edirlər.

[465] əl-Bəqərə:2-3.

# Yüz doqquzuncu məsələ

## Peyğəmbərlərin gətirdikləri bəzi xəbərləri təkzib etmək

"Peyğəmbərlərin axirət günü haqqında verdiyi bəzi xəbərləri təkzib etmək.Uca Allah buyurur: *"Onlar o kəslərdir ki, Rəbbinin ayələrini və Onunla qarşılaşacaqlarını inkar etdilər".*[466] Habelə onlar təkzib etdikləri işlər: *"Din (sorğu-sual) gününün sahibi".*[467] Habelə: *"Alışverişin, dostluğun və şəfaətin mümkün olmayacağı gün".*[468] Habelə: *"Ancaq bilərək haqqa şəhadət verənlər müstəsnadır."*[469]

---

Şərh:

Onlardan bəzisi bütövlüklə axirət gününü inkar edir. *"Həyat yalnız bu dünyadakı həyatımızdan ibarətdir."*[470] Onlardan bəzisi isə axirət gününə inanır lakin olacaq bəzi işləri danır.Məsələn, sorğu-sualı yaxud əməllərin təraziyə qoyulmasını yaxud cənnəti və ya cəhənnəmi danır. Onlardan bir qismi bütövlüklə axirət gününü danır bir qismi isə baş verəcək bəzi işləri danır.Axirət günündə olacaq bəzi işləri danan şəxs onu bütövlüklə danan mislindədir və onların

[466] əl-Kəhf:105.
[467] əl-Fatihə:4.
[468] əl-Bəqərə:254.
[469] əz-Zuxruf:86.
[470] əl-Ənam:129.

arasında heç bir fərq yoxdur.Çünki beləsi kitabın bir qisminə iman edir bir qisminə isə küfr edir.Uca Allah buyurur: *"De: Sizə əməlləri baxımından ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi? O kəslər ki, onların dünyadakı zəhməti boşa getmişdir.Halbuki onlar yaxşı işlər gördüklərini zənn edirlər.Onlar o kəslərdir ki, Rəbbinin ayələrini və Onunla qarşılaşacaqlarını inkar etdilər, bununla da onların bütün əməlləri puça çıxdı. Buna görə də Biz (qiyamət günü) onlar üçün bir daş-tərəzi qurmayacağıq!"*[471] Onlardan bəziləri isə sorğu-sualı təkzib edir.Uca Allah buyurur: *"Din (sorğu-sual) gününün sahibi"*.[472] Burada gələn din, sorğu-sualdır.Onlar isə onu və əməllərin qarşılığının veriləcəyini təkzib edirlər.Uca Allah buyurur: *"Ey iman gətirənlər! Alışverişin, dostluğun və şəfaətin mümkün olmayacağı gün gəlməmişdən əvvəl sizə verdiyimiz ruzidən paylayın! Kafirlər isə zalımlardır!"*.[473] Bu gün, din günüdür. Sənin qiyamət günü saleh əməlin olmayacağı zaman həmin gündə qurtulmaq imkanın olmayacaq.Həmin gündə sən insanın dünyada öz ehtiyaclarını satın aldığı kimi alasan deyə satılacaq əməl tapmayacaqsan."*Dostluğun*":Bu dünyada ehtiyac duyduğun bir şeyi sənə satacaq insan tapmayacağın zaman dostunun yanına getməyin mümkündür.O, sahib olduğunu sənə verəcək.Lakin qiyamət günü artıq dostluq olmayacaq.Qiyamət günü, hətta dostun olarsa belə heç kəs sənə fayda verə bilməyəcək.Ola bilsin ki, bu dünyada insanlardan biri sənə şəfaətçi və vasitəçi olsun.Ancaq qiyamət günü bu, olmayacaq."*Şəfaətin mümkün olmayacağı gün*".

---

[471] əl-Kəhf:103-105.

[472] əl-Fatihə:4.

[473] əl-Bəqərə:254.

Qiyamət günü sənin bütün cəhdlərin boşa çıxacaq və sən çıxış yolu tapa bilməyəcəksən.Sənin özün üçün hazırladığın saleh əməllərə sahib olmağın isə istisnadır.Bu əməllərin ən əzəmətlisi isə tövhid və şirkdən xilas olmaqdır.Bu səbəbdən, Uca Allah buyurur: *“Ondan qeyri ibadət etdikləri şəfaət edə bilməzlər.Ancaq bilərək haqqa şəhadət verənlər müstəsnadır.”*[474] Yəni, dünyada “lə iləhə illəllah” kəlməsini deyən və bunun üzərə ölən şəxs. İnsanın “lə iləhə illəllah” kəlməsini sadəcə deməsi kifayət etmir.Üstəlik həmin insan onun mənasını bilməlidir.Bu səbəbdən; “*bilərək*”-deyə söyləmişdir. Mənası bilinməyən sözün adicə tələffüz edilməsi kifayət etmir.Habelə həmin sözün tələbinə uyğun əməl olmadan sözü dilə gətirmək və mənanı bilmək kifayət etmir.Çünki elm əmələ aparan yoldur.Bu səbəbdən, elm ilə birgə əməl olmayacağı zaman “lə iləhə illəllah” kəlməsi sənə fayda verməyəcək.

---

[474] əz-Zuxruf:86.

# Yüz onuncu məsələ

## Haqqa çağıranlara qarşı həddi aşmaq

"İnsanları ədalətə çağıranları öldürmək."

## Şərh:

Yəhudilərin çirkin əməllərindən biri: Onlar peyğəmbərləri və Allaha çağıran insanları öldürürlər. Uca Allah buyurur: *"Allahın ayələrinə küfr edənlərə, peyğəmbərləri haqsız yerə öldürənlərə, insanları ədalətə çağıranların canına qəsd edənlərə şiddətli əzab veriləcəyini xəbər ver!".*[475] Habelə haqqa qarşı çıxan, insanları Allahın yolundan döndərən, Allaha çağıranları və yaxşılığı əmr edib pislikdən çəkindirənləri öldürən şəxsi bu ayə həmçinin şamil edir. Çünki beləsi cahiliyyat əhlinin yolunu tutmuş və bu səbəbdən, onların hökmü onu da şamil etmişdir.

[475] Ali İmran:21.

# Yüz on birinci məsələ

## Batilə iman gətirmək

“Cibtə və tağuta iman gətirmək.”

**Şərh:**

Uca Allah buyurur: *“Kitabdan bir pay verilənləri görmürsənmi? Onlar cibt və tağuta iman edirlər.”*[476]

Cibt: Onun sehr olduğu deyilmişdir.Həmçinin onun şeytan olduğu deyilmişdir.

Tağut: Allahın hüdudlarını aşana deyilir.

Ayənin nazil olma səbəbi: Peyğəmbər (salləllahu aleyhi və səlləm) Mədinəyə hicrət etdiyi zaman o, orada olan yəhudilərlə, müsəlmanlara qarşı savaşmamağa və Mədinəyə təcavüz etmək istəyənlərdən oranı qorumağa dair əhd bağlamışdır. Onlar bu şərtlər əsasında onunla əhd kəsmişlər.Nəhayət Peyğəmbər və onun əshabı onların köksünü sıxdığı və onlar İslamın zəfər çalıb irəlilədiyini gördükləri zaman onların başçıları Məkkəyə Qureyşin yanına yollanıb onlardan Peyğəmbərin (salləllahu aleyhi və səlləm) əleyhinə imdad istədilər və Qureyşin onlarla birgə Peyğəmbərə (salləllahu aleyhi və səlləm) qarşı savaşmaq üçün yola çıxmalarını istədilər.Bu zaman Uca Allah Qureyşin qəlbinə həmin insanlardan növbəti sözləri soruşmağı ilham etdi.Onlar yəhudilərə dedilər: Siz kitab

[476] ən-Nisə:51.

əhlisiniz.Bizlərdən hansızım haqq üzərəyik, Muhamməd (salləllahu aleyhi və sælləm) yoxsa biz? Yəhudilər dedilər: Sizin dininiz nədir? Onlar dedilər: Biz qonağa ikram edir, qohumluq əlaqələrini qoruyur, həccə gələnlərə xidmət göstərir v.s. Muhamməd isə bizim ilahlarımızı söymüş, dinimizi təhqir etmiş, ata-babalarımıza müxalif olmuş, qohumluq əlaqələrini kəsmiş və digər işlər etmişdir. Yəhudilər Muhammədin haqq üzərə olduğunu və onun Allahın Elçisi olduğunu, habelə Qureyşin bütlərə sitayiş etdiklərini bildikləri halda onlara: Siz haqq, Muhamməd isə batil üzərədir,-dedilər.Uca Allah onlar haqqında buyurur: *“Kitabdan bir pay verilənləri görmürsənmi? Onlar cibt və tağuta iman edir və kafirlər üçün də: “Bunlar möminlərdən daha doğru yoldadırlar”, -deyirlər.”*[477] Uca Allahın növbəti sözlərinə diqqət verin.O, demişdir: *“Onlar cibt və tağuta iman edir”*. Onlar yalnız zahirdə müvafiq gəlmişlər.Buna rəğmən Uca Allah bunu iman adlandırmışlar.Bu ayə, məcburiyyət olmadan kafirlərin yoluna müvafiq olmağın həmin yola iman etmək anlamına gəldiyinə dəlalət edir və qəlb etiqadının yoxluğu gerçəyi dəyişmir.

Hal-hazırda bəzi insanlar deyirlər: İnsan qəlbi ilə etiqad etməyincə küfr sözü desə belə kafir olmur.Əgər insan məcburiyyətsiz küfr sözünü dilə gətirsə, kafirlərin hərəkətlərini etsə, Allahı və Peyğəmbəri söysə və bir çox küfr işlər etsə bunlara görə beləsinin qəlbində olan etiqad bilinməyincə o, kafir olmaz.Əslində isə bu, aşırıya varmış murciələrin məzhəbidir.Allahdan salamatlıq diləyirik!

---

[477] ən-Nisə:51.

Uca Allah onları bu cür vəsf etmişdir *"Onlar cibt və tağuta iman edir"*.Onlar qəlbləri ilə yanlış söz dediklərini və Muhammədin (salləllahu aleyhi və səlləm) haqq olduğunu etiqad etdikləri halda Qureyşə yalnız zahirdə müvafiq olmuşlar. Yəhudilərin təkəbbürlüyü və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) olan həsəd və ədavəti onları zahirdə Qureyş müşriklərinə müvafiq olmağa sövq etmişdir.Uca Allah isə onları buna görə təkfir etmişdir.

Bu, təkfir məsələlərinə dair əzəmətli məqamdır.Burada insanın, Allahı və Peyğəmbəri söysə belə küfr söz deməsinə yaxud etməsinə rəğmən qəlbən həmin sadir olan küfrə müvafiq gəlməsi bilinməyənə qədər kafir olmayacağını deyən şəxslərə rəddiyə vardır.Bu kimi zəlalət fikirlərdən Allaha sığınırıq!

# Yüz on ikinci məsələ

## Küfrü imandan üstün tutmaq

“Müşriklərin dinini müsəlmanların dinindən üstün tutmaq.”

**Şərh:**

Öncəki məsələdə qeyd olunan yəhudilərin əhvalatı buna misaldır.

Bu məsələyə, küfr dinini müsəlmanların dinindən üstün tutan yaxud onların dinlərini İslam dini ilə bərabər səviyyədə edən hər bir şəxs daxildir.Habelə bura üç din; yəhudilik, nəsranilik və İslam arasında yaxınlıq yaratmağa çalışan şəxslət daxildir. Onlar deyirlər: Bütün bu dinlər səmavi dinlərdir.Bu dinlərin xadimləri arasında qardaşlıq və əməkdaşlıq yaratmaq gərəkdir.

# Yüz on üçüncü məsələ

## Batil qəbul olunsun deyə

## haqqı batillə qarışdırmaq

“Haqqı batillə qarışdırmaq.”

**Şərh:**

Kafirlər, habelə yəhudi, nəsrani və digərlərindən olan cahiliyyat əhlinin adətindən haqqı batillə qarışdırmaqdır. Onlar batilin rəvac tapması və yayılması üçün haqqı və batili biri-birinə qatırlar.Çünki əgər ortada yalnız batil olsaydı onu heç kəs qəbul etməzdi.Lakin batil haqqa qarışdırıldığı zaman sadəlöhv və avam möminlər onu qəbul edirlər.Onlar: Bu sözdə haqq vardır,-deyib bütövlüklə onu qəbul edirlər. Lakin əgər onlar orada gələn haqqı qəbul edib batili rədd etsəydilər onlar üçün daha xeyirli olardı.Lakin yanlışlıq onların bütövlüklə onu qəbul etmələrindədir. Düşüncə və sağlam ağıl sahibləri hər deyiləni qəbul etməməli, əksinə onu araşdırıb yoxlamalıdırlar.Onlar haqq olanı qəbul etməli batili isə rədd etməlidirlər.

Bəzən kafirlər haqqı istədikləri və sevdikləri səbəbilə deyil batilə yol açmaq üçün haqqı dilə gətirirlər.Müsəlmanın bu işə diqqət yetirməsi gərəkdir.O, məsələləri ayırmalı

və haqq kimi görünən hər bir şeyi qəbul etməkdə tələsməməlidir.İnsan ona gələn işləri araşdırıb yoxlamalı və haqq olanı qəbul batili isə rədd etməlidir.Lakin bunu yalnız elm və bəsirət əhli bilirlər.Avam və cahillər, habelə dardüşüncəli insanlar bu kimi işlərdə aldanırlar.İnsanın, ona gələn məlumatı qəbul etməmişdən öncə, saxtakarlıqdan xilas olsun deyə elm əhlindən soruşması və onlarla məsləhətləşməsi gərəkdir.

# Yüz on dördüncü məsələ

## Bilə-bilə haqqı gizlətmək

“Bilə-bilə haqqı gizlətmək”.

## Şərh:

Yəhudi, nəsrani, bütpərəstlər və digər küfr ümmətlərdən olan cahiliyyat əhlinin məsələlərindən: Bilə-bilə haqqı gizlətməkdir.Yəhudi və nəsranilərdən olan kitab əhli buna bariz nümunədir.Onlar haqqı bilir lakin dünyavi marağlar yaxud insanları razı salmaqdan ötrü onu gizlədir və insanlara bəyan etmirlər.Onların gizlətdiyi ən böyük haqq isə Tövrat və İncildə varid olan Muhammədin (salləllahu aleyhi və səlləm) vəsflərini gizlətmələri olmuşdur.Onlar Muhammədin Allahın Elçisi olduğunu və onun gətirdiyi dinin doğru olduğunu bilmiş buna rəğmən həmin bilgini gizlətmişlər.Bununla kifayətlənməyərək onlar, Allahın Qurani Kərimin bir çox yerində xəbər verdiyi kimi Muhammədin (salləllahu aleyhi və səlləm) peyğəmbərliyini inkar etmişlər.Uca Allah buyurur: *“Kitab verdiyimiz kimsələr onu öz oğullarını tanıdıqları kimi tanıyırlar. (Buna baxmayaraq) onların bir qismi, şübhəsiz ki, həqiqəti bilə-bilə gizlədir.Haqq sənin Rəbbindədir, buna heç vaxt şübhə edənlərdən olma!”.*[478] Bu ayə qiblənin Beytul-Maqdisdən Kəbəyə döndərilməsi haqqında bəhs edir.Onlar bilirlər ki, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qibləsi İbrahimin (aleyhi-s-sələm) qibləsi olan Kəbə

[478] əl-Bəqərə:146-147.

olacaq.Onlar bunu öz kitablarından bilirlər.Buna rəğmən onlar qiblənin döndərilməsini inkar etdilər və buna dair sahib olduqları elmi gizlətdilər.

Habelə yəhudi və nəsranilərdən olmayıb bilə-bilə haqqı gizlədən hər bir şəxs hətta müsəlman olarsa belə bura daxildir.Haqqı gizlədib insanlara bəyan etməyən şəxs yəhudilər və nəsranilərin yolundadır.Uca Allah buyurur: *"Allah kitab əhlindən: "Siz onu (kitabda olanları) gizlətməyib, insanlar üçün aydınlaşdırmalısınız!" -deyə əhd almışdı. Onlar (tezliklə) bu əhdə arxa çevirdilər və onu az bir qiymətə satdılar."*[479] Habelə buyurur: *"Kitabda insanlara bəyan etdikdən sonra nazil etdiyimiz açıq-aşkar dəlilləri və hidayəti gizlədənlər Allahın lənətinə düçar olar və (bütün) lənət edə biləcək kimsələr də onlara lənət oxuyar! Mən ancaq tövbə edənləri, yaxşı işlər görənləri və bəlli edənləri əfv edərəm. Mən tövbələri qəbul edənəm, mərhəmətliyəm!".*[480]

Onların tövbəsi növbəti şərtlə qəbul olunur: Gizlətdiklərini bəyan etmək.Adicə tövbə etmək kifayət etmir.Onlara gizlətdiklərini bəyan etmək gərəkdir.Haqqı bilən şəxsin bunu insanlara bəyan etməsi və haqqı ucuz qiymətə satmaması vacibdir.İnsan dünya mənfəətini yaxud insanların razılığını əldə etmək üçün haqqı gizlədir.Əslində isə insan Uca Allahdan qorxmalı və Onu razı salmalıdır.Haqqı bəyan edib aşkara çıxarmaq iqtidarında olanın onu gizlətməsi haramdır.Ancaq bunu etmək iqtidarında olmayan yaxud bəyan edəcəyi zaman daha böyük fitnənin olacağından qorxan şəxs üzürlüdür.Lakin haqqı bəyan etməkdə heç bir

---

[479] Ali İmran:187.
[480] əl-Bəqərə:159-260.

əngəl olmadan haqqı öz istəyi və mənafeyindən ötrü gizlədən şəxsi Allah və lənət edənlər lənət edər.

Bu, yəhudilərin sifətidir.Habelə bu vəsf nəfsi istəklərinə uyaraq haqqı gizlədən və onu insanlara bəyan etməyən hər bir şəxsdə öz əksini tapır.Həmin şəxs bir məsələnin hökmü haqqında soruşulduğu zaman doğru cavabı bildiyi halda haqsız olaraq cavab verir.Bu, haqqı gizlətməkdir.Uca Allah, insanın öz əleyhinə olarsa belə haqq söz deməyi əmr etmişdir. *"Sizin özünüzün, ata-ananızın, yaxın qohumlarınızın əleyhinə olsa belə, ədalətdən möhkəm yapışan, Allah üçün şahidlik edən kəslər olun!".*[481] Şahidlik və digər işlərdə haqqı bəyan etmək vacibdir.

Şahidliyi gizlətməkdən daha böyük cinayət, insanların həyatı, onların hidayəti və doğru yolu olan elmi gizlətməkdir.Haqqı bəyan etmək və yaltaqlığı tərk etmək vacibdir. Belə ki, bəzi şəxslər insanların batil yaxud xurafatlar yaxud şirk üzərə olduqlarını gördüyü zaman susur.Əslində isə onun haqqı bəyan etməsi və qəbirlərə tapınanları, məzarlara ibadət edənləri və azdırıcı bidətlərə düşənləri bu hal üzərə buraxmaması vacibdir.Bəziləri susub belə deyirlər: İnsanlardan mənə nə! Yaxud insanların haram işlər etdiyini gördüyü zaman susur.Bu, elmi gizlətmək və nəsihətə xəyanət etməkdir.Uca Allah sənə bu elmi susmaqdan ötrü verməmişdir. Onu sənə yalnız insanlara bəyan etməyin, insanları elmlə Allahın yoluna çağırmağın və onları zülmətlərdən nura çıxartmağa səy göstərməyin üçün vermişdir.

[481] ən-Nisə:135.

Alimlər bəyan etmək iqtidarında olduqları halda və ələxsus insanların zəlalət, şirk, bidət və xurafatlar içində olduqlarını gördükləri zaman onların susması yol verilməzdir.Əgər onlar susarlarsa bu, Allahın yəhudi və nəsraniləri elmi gizlətdiklərinə görə pislədiyi kimi elmi gizlətmək sayılacaq.Onlar insanları razı salmaq yaxud qurduqları işlərin öz məcrasından çıxmaması yaxud insanların onlara tabe olması üçün bilə-bilə haqqa zidd sözlər deyəcəkləri və qəsdən haqqa müxalif fətvalar verəcəkləri zaman onların halı daha da acınacaqlı olacaq.Haqqa tabe olmaq gərəkdir.İnsanlar batil üzərə olacaqları zaman sən insanları deyil Allahı razı salmalısan.Hədisdə gəlmişdir: "İnsanların qəzəbinə rəğmən Allahın razılığını axtaran şəxsdən Allah razı qalar və insanları ondan razı salar.Allahın qəzəbinə rəğmən insanların razılığını axtaran şəxsə isə Allahın qəzəbi tutat və Allah insanların qəzəbini ona tərəf yönəldər."[482]

---

[482] Tirmizi:2414.

# Yüz on beşinci məsələ

## Allahın adından elmsiz söz danışmaq

**"Zəlalətin təməli, Allahın adından elmsiz söz danışmaqdır."**

## Şərh:

**Zəlalətin təməli, yəni dünyanın zəlalətə düşmək əsası və mənbəyi Allahın adından elmsiz söz danışmaqdır.**

**Allahın adından elmsiz söz danışmaq şirkdən daha böyük günahdır.Bu səbəbdən, Uca Allah buyurur: *"De: Rəbbim yalnız aşkar və gizli fahiş işləri, hər cür günahı, haqsız zülmü, Allahın haqqında heç bir dəlil nazil etmədiyi hər hansı bir şeyi Ona şərik qoşmağınızı və Allaha qarşı bilmədiyiniz şeyləri deməyinizi haram etmişdir."*[483] Uca Allah bu ayədə Allahın adından elmsiz deyilən sözü şirkdən daha üstün günah etmişdir.Bu üzdən, hər hansı bir şəxsin Allahın adından elmsiz söz deməsi icazəli deyil.Məsələn şəriətdə öz təsdiqini tapmadığı halda bir şəxsin: Allah bunu haram etmişdir yaxud Allah bunu halal etmişdir yaxud Allah bunu buyurmuşdur,-deməsidir.Bu, Allahın adından elmsiz söz danışmaqdır.Yaxud insan bilmədiyi və sadəcə təxmin etdiyi bir şeyə dair fətva verir.Bu, çox təhlükəlidir.Çünki bu, Allahın adından deyilən yalandır. *"Allaha qarşı yalan uydurub söyləyən, özünə gələn həqiqəti təkzib edən kimsədən daha***

[483] əl-Əraf:33.

*zalım kim ola bilər? Məgər cəhənnəmdə kafirlər üçün yer yoxdur?!”.*[484] Allahın adından elmsiz söz danışmaq olmaz.

Peyğəmbər (salləllahu aleyhi və səlləm), vəhy nazil olmayan bir məsələ haqqında soruşulduğu zaman Allahdan vəyh gəlməyənə qədər cavabı gecikdirərdi.Alimə bir sıra məsələlər gizli qala bilər.Hər hansı bir məsələyə dair Quran və sunnədən açıq-aydın dəlil olmayacağı zaman: Bilmirəm!-deyə söylə.Bu, sənin elminə və dəyərinə heç bir xələl gətirməyəcək.Üstəlik Uca Allah qatında sənin dəyərini artıracaq.İmam Malik qırx məsələ haqqında soruşulduğu zaman onun az bir hissəsinə cavab vermişdir.Sualların çoxu haqqında isə: Bilmirəm,-demişdir.Sual verən onu dedi: Mən sənin hüzuruna uzaq bir ölkədən gəlmiş və səfərin məşəqqətinə dözmüşəm səni isə bilmirəm deyirsən? İmam Malik ona dedi: Miniyinə əyləş, ölkənə qayıt və insanlara de: Malikdən soruşdum o, isə mənə: Bilmirəm,-deyə cavab verdi.

Elm əhli və Allahdan qorxan insanlar məzh bu cür olurlar.

Habelə kitab yazmaq məsələsi.İnsan təlif etmək səriştəsinə malik olmadığı halda bu işə girişməməlidir.Kaş ki, biz bir çox kitab və risalələrdən azad olar və bizə yalnız Quran və sunnəyə müvafiq olan səhih kitablar qalardı.Bu kimi kitablar və risalələrin qalıb səndən sonraki nəsilləri yolundan azdırması böyük bəladır.Bu işdə isə məsuliyyəti daşıyan sən olacaqsan.Bu səbəbdən, insan fətvasında,

[484] əz-Zumər:32.

kitabında, sözləri, danışığı və mühazirələrində Allahdan qorxmalı və yalnız doğru və Quran və sunnəyə müvafiq olduğunu düşündüyü sözləri gətirməlidir.

# Yüz on altıncı məsələ

## Onların sözlərində olan ziddiyət

"Onlar haqqı təkzib etdikləri zaman açıq-aydın ziddiyətə düşmüşlər.Uca Allah buyurur: *"Lakin onlara haqq gəldikdə onu yalan saydılar.İndi onlar dolaşıqlıq (şaşqınlıq) içindədirlər."*[485]

**Şərh:**

Haqqı tərk edən şəxs ziddiyətə düşmək və sözlərin təzadlığı bəlasına düçar olar.Çünki zəlalət şöbələrə bölünür. Bu şöbələrin isə həddi-hüdudu yoxdur.Haqq isə birdir və o, şöbələrə və hissələrə bölünmür.Uca Allah buyurur: *"Artıq haqdan sonra zəlalətdən başqa nə qalır?!".*[486] Haqqı tərk edən şəxs zəlalətə düşər.Zəlalət, ucu-bucağı görünməyən bir səhralıqdır.Zəlalət əhlinin öz aralarında ixtilafda olduqlarını görə bilərsən.Hətta onlardan birinin belə müxtəlif görüşlərə sahib olduğunu görə bilərsən.Çünki həmin şəxsin tutub getdiyi hidayət yolu yoxdur.O, bəzən filan sözü bəzən isə digər sözü deməklə yalnız və yalnız ortada çabalayır.

---

[485] Qaf:5.
[486] Yunus:32.

Uca Allah buyurur: *“Lakin onlara haqq gəldikdə onu yalan saydılar.İndi onlar dolaşıqlıq (şaşqınlıq) içindədirlər.”*[487] Yəni, ixtilaf içindədirlər.Batil əhli öz aralarında ixtilafdadırlar.Onlar biri-birinə ədavət bəsləyir biri-birini zəlalətdə yaxud küfrdə ittiham edirlər.Haqq əhli isə ixtilaf etmirlər. Onlar ictihad nəticəsində ixtilaf etsələr belə aralarında düşmənçilik və ədavət etmirlər.Onlara doğru olan bəyan edildiyi zaman ona qayıdır və öz sözlərini tərk edirlər.Uca Allah buyurur: *“Siz nəyin barəsində ixtilaf etsəniz, onun hökmü yalnız Allaha aiddir.”*[488] *“Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə iman edirsinizsə, onu Allaha və Peyğəmbərə həvalə edin!”.*[489] Dörd imam və fəqihlər öz aralarında ixtilaf etsələr belə onlardan heç biri digərini zəlalətdə yaxud küfrdə ittiham etməmişdir.Hər biri ona bəlli olan dəlilə uyğun olaraq əməl edir.Onun müxalif olduğu bilindiyi zaman haqqa qayıdır.Zəlalət əhlinin isə qayıdacaqları bir mənbəyi yoxdur.Onlardan hər birinin mənbəyi nəfsi istəyidir.Nəfsi istəklər isə məlum olduğu kimi müxtəlifdir.

---

[487] Qaf:5.
[488] əş-Şura:10.
[489] ən-Nisə:59.

# Yüz on yeddinci məsələ

## Nazil olanın bir qisminə iman etmək

"Nazil olanın bir qisminə iman etmək."

**Şərh:**

Allahdan nazil olanın bir qisminə iman etmək yəhudi və nəsranilərin əlamətidir.Uca Allah onlara bir-birini öldürməyi yaxud diyarlarından çıxartmağı və əsirlər üçün fidyə almağı haram etdiyi zaman onlar bu üç xislətdən birini edib digərlərini tərk etmişlər.Uca Allah buyurur: *"Xatırlayın ki, Biz bir zaman İsrail oğullarından: "Allahdan qeyrisinə ibadət etməyin, valideynlərinizə, yaxın qohumlarınıza, yetimlərə, yoxsullara yaxşılıq edin, insanlarla xoş danışın, namaz qılın, zəkat verin!" -deyə əhd-peyman aldıq.Sonra, az bir qisminiz müstəsna olmaqla, əhdinizdən döndünüz, çünki siz üz döndərənsiniz. Xatırlayın ki, yenə bir zaman sizinlə: "Bir-birinizin qanını tökməyin, biri-birinizi yurdunuzdan çıxarmayın!" -deyə razılığa gəldik. Sonra siz şahid olub (onu) təsdiq etdiniz. Siz elə adamlarsınız ki, sonra yenə bir-birinizi öldürür, özünüzdən olan bir dəstəyə zülm və düşmənçilik etmək üçün köməkləşib, onları öz yurdlarından kənar edirsiniz.Onlar əsir düşüb yanınıza gəlsələr, fidyə verib azad edirsiniz. Halbuki onları (öz yurdlarından) çıxartmaq sizə haram edilmişdi.Siz kitabın bir hissəsinə iman edib, digər qisminə küfrmü edirsiniz?".*[490] Kitabın bir hissəsinə iman

[490] əl-Bəqərə:83-85.

edir: Fidyə verib əsirləri azad edir, digər qisminə isə küfr edirsiniz: Onları qətlə yetirib yurdlarından çıxarırsınız. *“Sizlərdən bu cür işlər görənlərin cəzası dünyada yalnız rüsvay olmaq, qiyamətdə isə ən şiddətli əzaba düçar olmaqdır. Allah etdiklərinizin heç birindən qafil deyildir.Onlar axirəti dünya həyatına satan kimsələrdir. Buna görə də onların nə əzabı yüngülləşər, nə də onlara kömək olunar.”*[491] Bu, kitabın bir qisminə iman edib digər qisminə küfr edənlərin cəzasıdır.Çünki vacib olan bütün kitaba iman etməkdir.İnsan öz nəfsi istəklərinə uyğun gələni götürüb onun nəfsi istəkləri və marağlarına zidd gələni tərk etməli deyil. Bu, yəhudilərin və onların izlərinə düşərək kitabdan istəyinə uyğun olanı götürüb ona zidd olanı tərk edənin sifətidir.

Digər ayədə gəlmişdir: *“Hər dəfə sizə ürəyinizə yatmayan bir şey gətirən peyğəmbərə təkəbbür göstərmirdinizmi? Məhz buna görə də onların bir qismini təkzib etdiniz, bir qismini isə öldürdünüz.”*[492] Yəni, onların nəfsi istəklərinə uyğun gələn peyğəmbər gəldiyi zaman onu qəbul etdilər.Onların nəfsi istəklərinə zidd gələn peyğəmbər gəldiyi zaman isə onu rədd etdilər.Daha sonra onların nəfsi istəklərinə uyğun gəlməyən peyğəmbərə qarşı onların mövqeyi, onu təkzib etmələri yaxud öldürmələri olacaq.

Burada müsəlmanlar üçün bir ibrət vardır.Çünki onlar yəhudilərin edəcəyini etsəydilər həmin adamların başına gələn müsibət onlara da üz verəcəkdi.

---

[491] əl-Bəqərə:85-86.
[492] əl-Bəqərə:87.

# Yüz on səkkizinci məsələ

## Bir qismini buraxıb bəzi peyğəmbərlərə iman etmək

“Peyğəmbərlər arasında ayrıseçkilik etmək.”

**Şərh:**

Peyğəmbərlər arasında ayrıseçkilik edib bəzilərinə iman etmək digərlərinə isə küfr etmək xüsusi olaraq kitab əhlinin sifətidir.Bütpərəslərə gəldikdə isə, onlar ümumiyyətlə peyğəmbərlərə iman etmirlər.Onlar bütün peyğəmbərləri inkar edirlər.Yəhudilər İsa və Muhammməd (aleyhimə-s-salətu va-s-sələm) peyğəmbərə küfr edirlər.Nəsranilər isə Muhammməd (salləllahu aleyhi və səlləm) Peyğəmbərə küfr edirlər.Peyğəmbərlərdən birinə küfr edən şəxs bütün peyğəmbərlərə küfr etmiş sayılır. Çünki peyğəmbərlərin yolu və dini birdir.Onlar hamısı qardaşdırlar.Onların inkar etdikləri peyğəmbərin hüccəti, iman gətirdikləri peyğəmbərlərin hüccətidir.Bu səbəbdən, onların arasında fərq qoymaq olmaz.Uca Allah buyurur: *“Belə deyin: Biz Allaha, bizə nazil olana, İbrahimə, İsmailə, İshaqa, Yəquba və onun övladına göndərilənlərə, Musaya və İsaya verilənlərə, Rəbbi tərəfindən (bütün) peyğəmbərlərə verilənlərə iman gətirmişik. Onların heç birini digərindən*

*ayırmırıq. Biz ancaq Allaha boyun əyən müsəlmanlarıq!".*[493] *"Peyğəmbər Rəbbi tərəfindən ona nazil edilənə iman gətirmiş və möminlər də iman gətirmişlər. (Onların) hamısı Allaha, Onun mələklərinə, kitablarına və (bütün) peyğəmbərlərinə iman gətirərək dedilər: "Biz Onun peyğəmbərləri arasında fərq qoymuruq."*[494]

Biz peyğəmbərlər arasında fərq qoymuruq.Peyğəmbərlərə iman etmək Cəbrayılın hədisində gələn imanın altı dayağından biridir.Cəbrayıl Peyğəmbərə (salləllahu aleyhi və səlləm) sual verib: Mənə iman haqqında xəbər ver,-dediyi zaman o, dedi: Allaha, mələklərinə, kitablarına, peyğəmbərlərinə, axirət gününə və qədərin xeyiri və şərinə iman gətirməyindir."[495] Onlardan bir qisminə iman gətirmək kifayət etmir.Onların hamısına iman gətirmək gərəkdir.Çünki onlardan birinə küfr edən şəxs bütün peyğəmbərlərə küfr etmiş olur.

Bu səbəbdən, Uca Allah buyurur: *"Nuhun tayfası peyğəmbərləri təkzib etdi."*[496] *"Ad tayfası da peyğəmbərləri təkzib etdi."*[497] *"Səmud tayfası da peyğəmbərləri təkzib etdi."*[498]Baxmayaraq ki, onlar yalnız öz peyğəmbərini təkzib etmişlər.Onlar öz peyğəmbərini təkzib etdikləri zaman bütün peyğəmbərləri təkzib etmiş oldular

---

[493] əl-Bəqərə:136.
[494] əl-Bəqərə:285.
[495] Muslim:8.Tirmizi:2610.Nəsai:4990.Əbu Davud:4695.İbn Macə:63.Əhməd:1/27.
[496] əş-Şuara:105.
[497] əş-Şuara:123.
[498] əş-Şuara:141.

# Yüz on doqquzuncu məsələ

## Onlar bilmədikləri məsələlərə dair mübahisə edirlər

**"Onlar bilmədikləri məsələlərə dair mübahisə edirlər."**

**Şərh:**

Cahiliyyat əhli bilmədikləri məsələlərə dair münaqişə və mübahisə edirlər.İnsanın yalnız elmlə mübahisə etməsi gərəkdir.İnsan bilmədiyi mövzu haqqında isə susmalıdır. Uca Allah buyurur: *"Xeyr! Onlar elmini qavraya bilmədikləri və hələ yozumu onlara gəlib çatmamış bir şeyi (Quranı) yalan hesab etdilər."*[499] Yəni, Ona aparan gerçəyini təkzib etdilər.Bu isə iki cəhəti şamil edir:

Birinci cəhət: İnsan bilmədiyi məsələyə müdaxilə etməməli və onu inkar etməməlidir.O, sadəcə: Doğrusunu Allah bilir,-deməlidir.Bu səbəbdən, Uca Allah Peyğəmbəri Muhammədə (salləllahu aleyhi və səlləm) buyurur: *"De: Ey Rəbbim! Mənim elmimi artır!".*[500] İnsan bütün elmləri əhatə etdiyini iddia etməməli və çoxlu elmə sahib olacağı halda belə təvəzökar olub öz yerini bilməlidir.Uca Allah buyurur: *"Hər*

---

[499] Yunus:39.
[500] Tahə:114.

*biləndən üstün bir bilən də vardır."*[501] Sonucda elm Uca Allaha aid edilir.

İkinci cəhət: İnsan digərinin bildiyini inkar etməməlidir. Başqasında sənə gizli qalan elm olacağı zaman onun sahib olduğu elmi inkar etməməlisən.Çünki bəşər övladından heç biri bütün elmlərə yiyələnməmişdir.Bu səbəbdən, alimlər daimə növbəti ifadəni tərkar-təkrar dilə gətirirlər: "Dəlili bilən onu bilməyəndən öndədir."

Ateistlər, müşriklər, Allahın sifətlərini inkar edənlər və digər zəlalət əhli inkar etdikləri məsələləri cahillikləri və onu ağılları ilə dərk etmədikləri səbəbilə inkar etmişlər. Çünki onlar qeybə iman gətirmirlər.Onlar öz məsləklərini yaramaz müqayisələr üzərində qurmuş və nəticədə doğru yoldan azmışlar.

[501] Yusuf:76.

# Yüz iyirminci məsələ

## Onlar digər insanlara tabe olmaq məsələsində ziddiyətə düşmüşlər

"Onlar sələfə aşkar müxalif olduqları halda onlara tabe olduqlarını iddia edirlər."

---

**Şərh:**

Bütün yəhudilər, nəsranilər və İslama nisbət olunan zəlalət əhli hamısı özlərindən öncəki möminlərə tabe olduqlarını iddia edirlər.Yəhudilər Musaya və onun davamçılarına tabe olduqlarını iddia edirlər.Habelə nəsranilər Məsihə və ona iman gətirənlərə tabe olduqlarını iddia edirlər.Bu ümmətdən olan zəlalət əhli isə səhabə, tabiin və onlara gözəl şəkildə tabe olan sələfə tabe olduqlarını və sələfin məzhəbi üzərə olduqlarını iddia edirlər.

Sələfin məzhəbi yaxud sələfin mənhəci üzərində olduğunu iddia edən hər bir şəxsin iddiası saleh sələfin mənhəcinə ərz edildikdən sonra doğru hesab edilə bilər.Əgər onun yolu sələfin yoluna müvafiq gələrsə onun sələfin məzhəbi üzərində olduğu öz təsdiqini tapar.Əgər onun yolu sələfin yoluna müxalif olarsa, iddia edəcəyi halda belə onun sələfin məzhəbi üzərində olmadığı aşkarlanar.Hal-hazırda

İslama nisbət olunan zəlalət firqələri sələfin məzhəbi üzərə olduqlarını iddia edirlər.Əslində isə onlar sələfin məzhəbi üzərə deyillər.Çünki Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sələfin məzhəbinə dair sözü onların durumuna müvafiq gəlmir: "Mənim və mənim səhabələrimin yolunda olanlar".[502] Sələfin yolunda olmaq budur.Buna müxalif olan isə, iddialarla çıxış etsə belə sələfin yolunda deyil.Əsas iddia deyil.Əsas, gerçək durumdur. Sələfilik iddiasında olanlar çoxdur.Lakin onların yolunu saleh sələfin yoluna ərz etmək gərəkdir.Əgər onların iddiası sələfin yoluna uyğun gələrsə doğru olacaq.Əgər müxalif olarsa onların sələfin yolunda olmadıqları bəlli olacaq.

Dörd məzhəbə mənsub olub onlara etiqadda müxalif olan şəxslər həmçinin.Belələrinin imamlara mənsubiyyəti doğru deyil.Çünki onlar ən önəmli məsələdə, əqidədə onlara müxalifdirlər.

[502] Tirmizi:2641.

# Yüz iyirmi birinci məsələ

## Allahın yolundan döndərmək

"İman gətirənləri Allahın yolundan döndərmək."

**Şərh:**

Allahın yolundan döndərmək: İnsanları Allahın dininə girməkdən döndərmək.Bu, qədim və son zamanlarda olmuş yəhudi, nəsrani və müşriklərdən olan kafirlərin əməlidir.Cahiliyyat əhlinin bütün zamanlar və məkanlarda olan üslublarından: Allahın yolundan döndərməkdir.Hal-hazırki zəlalət firqələri bu yol üzərədirlər.Onlar müsəlmanları azdırmağa və öz batil cərəyanlarına cəlb etməyə çalışırlar.Habelə yəhudi və nəsranilər daimə müsəlmanları İslamdan döndərməyə çalışırlar.Onlar deyirlər: Gəlin aramızda dialoq quraq. Daha sonra dinlərin azadlığı haqqında danışırlar.Bu, Allahın yolundan döndərməkdir.Məgər biz dinimizin doğru sizin dininizin batil olduğuna şübhəmi edirik ki, sizinlə bu mövzuda bir dialoqda quraq? Biz öz dinimizə dair və sizin dininizin batil olmasına dair şübhə etmirik.

Bunlar dinlər arası dialoq və dinlər arası əməkdaşlıq adı altında insanları Allahın yolundan döndərmək istəyirlər. Onların istəyi və məqsədi budur.Günümüzəcən kafirlər müsəlmanları dindən döndərmək üçün onları azdırmağa

çalışır, onları qətlə yetirir, yurdlarından qovur və müxtəlif işkəncələrə məruz qoyurlar.

Bunu deyənlər məhz onlardır: Gəlin aramızda diaoq quraq!Onlar din və etiqad azadlığı haqqında danışır lakin öz dinləri və etiqadını qəsd edirlər.Uca Allah buyurur: *“Sizin kafir olmanızı istəyərlər”.*[503] *“Onlar əgər bacarsalar, sizi dininizdən döndərincəyə qədər sizinlə vuruşmaqda davam edəcəklər.”*[504] *“Onlar özləri kafir olduqları kimi, sizin də kafir olub özlərilə bərabər olmanızı istərlər.”*[505] Əslində isə onlar batillə haqqı qarışdırmaq və batil dini haqq dinlə bir müstəviyə qoymaq istəyirlər.Onlar bununla kifayətlənmə-yib İslamı yox etmək istəyirlər.Onlar müsəlmanları dinlə-rindən döndərmək üçün müsəlmanları qətlə yetirir və onları öz yurdlarından qovurlar.Onlar yer üzündə bir müsəlmanın belə qalmasını istəmirlər.Bu, onların arzusu və məqsədidir.

---

[503] Mumtəhənə:2.
[504] əl-Bəqərə:217.
[505] ən-Nisə:89.

## Yüz iyirmi ikinci məsələ

## Kafirlərlə dostluq etmək

**"Küfrü və kafirləri sevmək."**

**Şərh:**

**Cahiliyyat məsələlərindən:** Uca Allahın Qurani Kərimdə İsrail oğulları haqqında xəbər verdiyi kimi onlar küfrü və kafirləri sevirlər.İsrail oğulları kafirləri özlərinə dost etmişlər.Uca Allah buyurur: *"Onların bir çoxunun kafirlərlə dostluq etdiyini görürsən."*[506]

Uca Allah kafirlərlə dostluq etməyi haram etmişdir.Uca Allah buyurur: *"Ey iman gətirənlər! Yəhudi və nəsraniləri (özünüzə) dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizdən kim onlarla dostluq edərsə, o da onlardandır."*[507] Uca Allah, yəhudilərin kafirləri özlərinə dost tutub onları sevməsi kimi əməli müsəlmanlara qadağan etmişdir. *"Möminlər möminləri buraxıb kafirləri dost tutmasınlar! Bunu edən kəs Allahdan heç bir şey gözləməsin. Ancaq onlardan gələ biləcək bir təhlükədən qorxmanız (çəkinməniz) müstəsnadır."*[508] Buna dair məsələ açıq-aydındır.Müsəlmanın kafirlərə ədavət bəsləməsi və onlardan və onların dinindən

[506] əl-Maidə:80.
[507] əl-Maidə:51.
[508] Ali İmran:28.

uzaq durması vacibdir.Dostluq və düşmənçilik İslamın ən əzəmətli vaciblərindən biridir.

# Yüz iyirmi üçüncüdən yüz iyirmi səkkizinci məsələyə qədər

## Onlar xurafatlara uyurlar

"Uğursuzluq inancı, xəttlər çəkmək, kahinlik, tağuta mühakimə olunmaq və iki bayram arası evlənməyi xoş görməmək."

---

Şərh:

Cahiliyyat əhlinin xislətlərindən, bu kimi batil işlərə inanmaq və ona əməl etməkdir.

1-Uğursuzluq inancı: Cahiliyyat dönəmində insanlar quşlarda uğursuzluq görərdilər.Quşun onlara xoş gəlməyən istiqamətdə uçduğunu gördükləri zaman səfər və bu kimi işlərə dair əzminə düşdükləri əməllərdən vaz keçərdilər.

Uca Allaha bizə yalnız Ona təvəkkül etməyi və insanın mənafeyinə xidmət edən işlərə girişməyi əmr etmişdir.İnsana hər hansı bir iş müəmmalı qalacağı yaxud bir şeydə tərəddüd edəcəyi zaman onun istixarə namazı qılması məsləhətdir.Bunun ardından Allahın onu doğru olana müvəffəq etməsini diləyəcək.Habelə insan bilik və təcrübə sahibləri ilə məsləhət etməlidir.

**2-Yerdə çəkilən xətt:** Bu, qumun üzərində xəttlər çəkib bununla filan şeyin baş verəcəyini iddia edən fırıldaqçıların əməlidir.Heç şübhəsiz ki, bu, cahiliyyat işlərindəndir. Çünki yalnız Allahın bildiyi qeyb elminə dair bilgini iddia etmək əsassız güman və fala baxmadır.Lakin bəzən insanlar üçün sınaq və istidrac olsun deyə bu işlərdən bəzisi baş verir.İnsanın bu işlərdən uzaq olması gərəkdir.

**3-Kahinlik:** Mələklərin sözlərini oğurlayan şeytanların xidməti vasitəsilə qeyb elmini iddia etmək.Uca Allah kahinliyi və kahinlərin yanına gedib onları təsdiq etməyi haram etmişdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Kahinin yanına gəlib onun dediklərini təsdiq edən şəxs Muhammədə (salləllahu aleyhi və səlləm) nazil olana küfr etmiş olar."[509]

**4-**Tağuta mühakimə olunmaq: Uca Allahın kitabı və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsi əvəzinə qondarma qanunlara və qəbilə hökmlərinə yaxud kəlam elmi və məntiqi qaydalara mühakimə olunmaqdır.

İnsanlar cahiliyyat dönəmində tağuta mühakimə olunardılar.Tağut sözü tüğyan sözündən düzəlmişdir.Tüğyan isə həddi aşmaqdır.Burada qəsd olunan məna: Allahın nazil etmədiyi hökmü verəndir.

Müsəlmanlara Allahın kitabı və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sunnəsinə mühakimə olunmaq vacibdir.Uca Allah buyurur: *"Əgər bir iş barəsində mübahisə etsəniz,*

---

[509] Tirmizi:135.Əbu Davud:3904.İbn Macə:639.Əhməd:2/476.Dərimi:1136.

*Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin!”.*[510]

5-İki bayram arası evlənməyi xoş görməmək: İki bayram, Ramazan bayramı və qurban bayramıdır.Bu, günlərə dair qadağan olunmuş uğursuzluq inancıdır.Uca Allah həcc yaxud ümrə ehramı istisna olmaqla bütün vaxtlarda evlənməyi icazəli etmişdir.Evliliyin uğurlu yaxud uğursuz olmasının günlərə heç bir aidiyyatı yoxdur.Bu, yalnız Uca Allahın əlindədir.Doğrusunu bilən Allahdır.Allahın salavatı və salamı Peyğəmbərimiz Muhammədin, onun ailəsinin və bütün əshabının üzərinə olsun!

[510] ən-Nisə:59.

# Mündəricat